

***Tofiq Yusif (Hüseynov Tofiq Yusif oğlu)***

*1950-ci ildə anadan olub.*
*Orta məktəbi medalla bitirib. İki ali təhsil alıb.*
*«Bir taleyin göynəmələri» və «Tərtər şəhidləri» kitablarının müəllifidir. Azərbaycan Mətbuat Şurasının və Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür.*
*«Qızıl Qələm» və «Məmməd Araz» mükafatları laureatıdır.*
*Hazırda Tərtər şəhərində yaşayır.*

**TOFİQ YUSİF**

# QAN İYİ

*(Sənədli povest)*



"KÖVSƏR"
NƏŞRİYYATI

**Bakı – 2007**

*Naşiri* **Xəlil Həsənoğlu**

*Redaktoru* **Hafiz Rüstəm**

**Tofiq Yusif.**
Qan iyi (sənədli povest). Bakı, «Kövsər» nəşriyyatı, 2007. – 304 səh.

Sovet İmperiyasının süqutundan sonra öz müstəqilliyini təzəcə elan etmiş Azərbaycanın ərazi bütövlüyünün erməni təcavüzkarlarından qorunmasında könüllü özünümüdafiə dəstələrinin-xalq batalyonlarının müstəsna rolu olmuşdur. Hələ milli ordumuzun formalaşmadığı həmin dövrdə Tərtər batalyonunun döyüşçüləri-İsmayıl Tunc və onun silahdaşları azğın düşmənlərə qarşı misilsiz igidlik və fədakarlıqla mübarizə aparmışlar.

Müəllif XIX əsrin əvvəllərindən üzübəri Türkiyə və Azərbaycanda ermənilərin törətdikləri qətlamın – kütləvi Türk soyqırımının xronologiyası fonunda Qarabağ müharibəsi iştirakçılarının bir qisminin keçdiyi döyüş yolu epizodlarını təbii və real cizgilərlə canlandırmışdır.

Hərbi vətənpərvərlik ruhunda yazılmış bu kitab, xüsusilə gənclərimiz üçün əhəmiyyətlidir.

**ISBN 9952-427-13-1**

# QAN İYİ

Havadan, torpaqdan qan iyi gəlirdi. Hər yan qana bulanmışdı. Ağacların, otların, daşların, yerin, göyün rəngi də qan kimi idi--al qırmızı. Murov dağının zirvəsinə düşən gün işığı da, lap uzaqlarda, səmanın ənginliklərində ərimәkdə olan bir əlçim bulud da qana boyanmışdı. Dünya büsbütün qanın içində idi. Çünki qan bürümüş bu dünyanın bir qarış qanlı torpağının üzərinə sərilmiş və həyatının son anlarını yaşayan İsmayılın özü də qana bələnmişdi. Buna görə də gözlərinə qan rəngindən başqa ayrı rəng görünmürdü. Artıq o atəş səslərini də eşitmirdi. Ulaya-ulaya ətrafına düşən mərmilərin, şütüyən qəlpələrin və çovuyan güllələrin fərqinə vara bilməzdi. Ruhu yavaş-yavaş bədəni tərk etməkdə idi. Şiddətli ağrıları tam azalmışdı. Ölümün rahat və sakit ağuşu İsmayıla açılmışdı. Özünü çox yüngül hiss edirdi. Düşünürdü: «Dünyanın həyat fəlsəfəsi belədir—hər şeyin ilki və sonu var, ömrün də həmçinin – gəliş və gediş, yaranış və ölüm. Maddi heç nə əbədi deyil. Əbədi bildiyimiz nə varsa bir gün beləcə yox olacaqdır. Əvvəl olan yerdə son da var».

İsmayıl qan rəngində olan dünyadan biryolluq ayrılmaq anlarına çatmışdı. Gözlərinə hopmuş qırmızılıq azalmağa başlayırdı. O bilirdi ki, insan əbədiyyətə qovuşduğu məqamda zaman və məkan anlayışları itir. Yəni ounun yaşadığı bu dünyanın illəri bir ana dönür, ömür bir göz qırpımında xəyaldan ötüb keçir.

O dünyaya «səfər edib qayıdanlar», yəni klinik ölüm halını yaşayanlar və ruha çevirilib yenidən dirilənlər bizim idrakımızın qəbul etmədiyi hadisələrin şahidi olublar. Və onlar cismin ötəri, ruhun əbədiliyini təsdiqləyiblər.

İsmayılı qan aparırdı. O, qismətiylə, baxtıyla barışanlardan idi. İnanırdı ki, taleyinə nə yazılıbsa, onu da görməlidi. Deməli, onun ömrü də belə bitməliymiş. O ölmürdü, şəhid olurdu. Şəhidlik isə Tanrının bəndəsinə qoyduğu ən şərəfli cismani yoxluqdur ki, bu uca mərtəbəyə də hələm-hələm adamlar yüksələ bilməz. Vətən yolunda, əqidə,inam, namus uğrunda ölüm qiymətli ölümdür.

«İnsan ömrünün ölçüsü nədir ki? Heç olmasa adi bir çaylaq daşının, bir çayırın ömrü qədər də yaşaya bilmir. Bu çox qısa zaman kəsiyində belə çoxları dünyanın faniliyini dərk etmir. Yazıqlar olsun!».

Bütün bunlar həyat işığı sönməkdə olan İsmayılın fikrindən ildırım sürətilə keçdi.

Sanki dünən anadan olmuşdu. Nə yaşamışdı ki, bu həyatda, nə də görəydi? Çox gənc idi. Lakin bütün varlığı Tanrıya məhəbbətdən yoğrulmuşdu. Bu məhəbbət, bu sevgi onun ürəyinə ata-babadan qanla, südlə keçib, canına hopmuşdu. İdrakla, ağılla Yaradana tapınanlar, onu sevənlər xoşbəxt adamlardılar.

Qan içində bir ağacın dibində qıvrılıb qalmışdı İsmayıl. Görəsən yoldaşlarından onun köməyinə çatan, dadına yetən olacaqdımı? Yoxsa elə buradaca can verəcəkdi? Onu həmişə bir hiss, bir duyğu narahat edirdi. Ermənilərə əsir düşmək. Ölümə nə var, kişi işidir. Vay o günə ki!.. Əlbəttə İsmayıl həmin an özünü güllələyərdi. Meyidinin belə erməni əlinə keçməsini fikirləşəndə onu dəhşət bürüyürdü. Razı olardı ki, leşini vəhşi qurd-quş didib parçalasın, amma mənfur ermənininin əli ona dəyməsin. Çünki adı «erməni» olan bu məxluq tarixən türklərin qanına yerikləyib. Erməni məkrinin, erməni xislətinin törətdiyi qovğaların məntiqi yekunu qandır, qadadır. Onlar bu dünyaya ona görə gəliblər ki, insanlar arasında yalnız fitnə-fəsad törətsinlər, qırğınlara, müharibələrə bais olsunlar. Erməni adlı varlığın bətnində əzabla öldürməkdən, məhv etməkdən ləzzət almaq vəhşiliyi var. Bu vəhşilik həvəsi onlarda böyükdən-uşağa keçərək hamısını yoluxdurub. Əlalxüsus da, türk millətinə qarşı. Ona görə də ermənilər zaman-zaman türklərin, əslində bütün müsəlmanların qanını içiblər və içə-içə də davam edirlər. İnsanın bədənində də bu qədər nifrət, bu qədər kin-küdurət olarmı?! Dünya üzünə gələn heç bir şüurlu varlıq ermənilər qədər başqa millətə qarşı belə dəhşətli deyil. Bunu tarix özü sübut edib.

Lakin biz türklər haqlı ola-ola haqqımızı dünyaya çatdıra bilməmişik. Düz olduğumuz halda əyri çıxmışıq. Ermənilər isə yalanlara doğru donu geyindirərək bütün bəşəriyyətə car çəkiblər ki, qoymayın, türklər bizi qırıb-çatdılar, soyqırımı törətdilər, torpaqlarımızı əlimizdən aldılar!

Niyə biz belə yaranmışıq? Bu bağışlama fağırlığı və unutqanlıq azarı hardandır bizim qanımızda? Əlbəttə, bağışlamağı bacaranlara aqil deyirlər. Lakin o yerdə ki, qarşı tərəf öz qələtini anlamır, onun düşmənçiliyindən keçməyə, bağışlamağa dəyərmi? Bizim soyumuza qarşı soyqırımı törədənlərin xain əməllərini biz bağışlasaq da, tanrımız bağışlamayacaq. Onlar nə vaxtsa öz törətdiklərinin cəzalarını alacaqlar.

... İsmayıl bihuş haldaydı. Erməni quldurlarının mərmi qəlpəsindən aldığı yaralardan axan qanı ilə suvardığı ağaca tərəf düşmənlər atəş aça-aça yaxınlaşırdı.

İsmayılın bir tərəfində döyüş yoldaşları ölüm-dirim mübarizəsində idi, bir tərəfdə erməni yaraqlıları hücuma keçmişdilər.

İsmayıl babasının-atasına, atasının isə ona danışdıqlarından həm də tarixi mənbələrdən öyrənmişdi ki, xain ermənilər Türkiyədə və Azərbaycanda XIX əsrin əvvəllərindən üzü bəri saysız-hesabsız qırğınlar qətlləri törədiblər, türklərin, başlarına olmazın müsibətlərini gətiriblər.

**Tarixi gercəkliklər**

Cənubi Qafqaz və Ön Asiya yaylasında çoxluq təşkil edən azərbaycanlıların (azəri türklərin) dəfələrlə öz tarixi torpaqlarından kütləvi şəkildə köçürülməyə, qovulmağa məruz qaldıqları haqqında məlumatlar inkarolunmaz gerçəkliklərdir. 1828-1832, 1877-1878, 1905-1907, 1918-1920, 1948-1953 və 1988-ci illərdə çirkin etnik təmizləmə, qırğınlar, talanlar törədən ermənilər daha hansı qəddarlıqları etməlidirlər ki, qulaqları kar olmuş bu dünya doğrunu doğru kimi eşitsin?!

1828-ci ildən bu yana Rusiyanın iştirakı ilə İran və Türkiyədən gəlmə ermənilər «Böyük Ermənistan İmperiyası» yaratmaq xülyası altında türk azəri millətinə qarşı nə qədər qanlı münaqişələr, qətlamlar törətdilər! Bütün bunlara tarix şahiddir.

Bu millətin hansı naqis xislətə malik olduğunu isbatlayan gerçəkliklərin mindən birini İsmayıl xatırlayanda bədənindən bir gizilti, bir inilti keçirdi.

XIX əsrin əvvəllərində Qərbi Azərbaycanın (indiki Ermənistanın) ərazisində 73,8 faiz azərbaycanlı, 26,2 faiz isə ermənilər, kürdlər, assorilər və digər xalqların nümayəndələri yaşamışlar.

1820-ci illərin əvvəllərində İrəvan xanlığında əhalinin 76 faizini, Naxçıvanda 86,5 faizini, Qarabağda isə 91 faizini azərbaycanlı müsəlmanlar təşkil etmişlər.

1826-1828-ci illərdə yalnız İrandan Azərbaycana torpaqlarına 18 min erməni ailəsi köçürülmüşdür. Tarixi mənbələrdə göstərilir ki, 1826-cı ildən 1830-cu ilədək Zaqafqaziyaya 40 min İran və 84 min Türkiyə erməni köçürülmüşdür.

Bu ermənilər həmin illərdə İrəvan xanlığının Göyçə, Dərəçiçək, Sərdarabad, Abaran, Kərbibasar, Seyidli-Axsaqlı, Talin, Dərəkənd, Parçenis, Sürməli, Saadlı, Qarnibasar, Şərur, Vedibasar, Zənginbasar, və Qırxbulaq kimi mahallarının 522 azərbaycanlı kəndinin 310-dan azərbaycanlı əhalisinin zorla qovub çıxarmışlar.

O dövrdə İrəvan Şəhərinin 10 min nəfər əhalisindən 7 min azərbaycanlı olmuşdur. Bu şəhərdə Xansarayı, Göy Məscid, Bazar məscidi kimi 8 iri məscid

vardır. Ümumiyyətlə, 1831-ci ildən ötən sonrakı 100 ildə Qərbi Azərbaycanda mövcud olan 2310 kəndin 2000-də azərbaycanlılar yaşamışlar.

1827-1829-cu illərdə 100 minlərlə müsəlman milləti rusların törətdikləri işgəncələrə dözməyərək öz əzəli və doğma torpaqlarından didərgin düşdülər və onların yurdlarına ermənilər köçürüldülər.

Belə etnik təmizləmə və soyqırımı siyasəti erməni quldurları tərəfindən təkcə Azərbaycan torpağında deyil, Türkiyədə də çox böyük vəhşiliklə və vandalıqla aparılırdı. Yer kürəsində yaşayan heç bir millət digərinə qarşı bu qədər qəddar və əzazil ola bilməz.




1854-1856-cı illərdə Anadoluya basqın etdilər.

Lakin ruslar türk ordusunun hücumlarına tab gətirməyib geri çəkiləndə 10 mindən çox erməni Anadolunu tərk edərək İrəvan Quberniyasına köçdülər və orada məskunlaşdı.

400 il ömür sürən Osmanlı İmperiyasına qarşı 1877-ci ildə ruslar yenidən müharibəyə qalxdı. Həmin vaxtlar ruslara bərabər 25 min erməni əsgəri də türklərə qarşı vuruşurdu.
1877-1878-ci illərdə gedən qanlı döyüşlərdə 100 minə yaxın müsəlman Ərdəhanı, Qarsı tərk etməyə məcbur oldu.
Bolqarıstanda Bosmya ilə Şerb üsyanını yatırmaqla məşğul olan Türk Ordusu Vətəninə kömək üçün tələsərkən fürsətdən istifadə edən Bolqar üsyançıları 260 min türkü qətlə yetirdilər. Yarım milyondan çox müsəlman Bolqarıstan ərazilərindən zorla qovulub çıxarıldı.
1892-1893-cü illərdə erməni daşnakları bütün soydaşlarını silahlandıraraq Türkiyənin şərqində türklərə və kürdlərə qarşı qətlamlar törətməyə başladılar.
1895-ci ildə erməni partizan birləşmələri Zeytun və Van şəhərində 20 min müsəlman əhalisini qətlə yetirdilər, bu şəhərləri tamamilə dağıdıb viran etdilər.
1904-cü ildə Andranikin komandanlığı altındakı quldur dəstələri Zeytun əyalətinə yenidən basqını zamanı qırılan əhalinin sayı 10 min nəfərdən artıq idi. Erməni tərəfdən isə cəmi 200 nəfər ölmüşdü.
Birinci Dünya Müharibəsi dövründə erməni qatilləri Ədənə şəhərində 20 min müsəlmanı qətlə yetirdilər.
Türkün çörəyini yeyib suyunu içən, türk torpaqlarında yaşayan nankor ermənilər həmin illərdə öz yurdlarını qorumaq əvəzinə bu torpaqlara hücum edən təcavüzkarlarla əlbir olur, şəhər və kəndlərdə dinc əhalini qırıb-çatır, onların var-dövlətini qarət edirdilər.
Civas ərazisində qırğın törədən ermənilərin sayı 30 minə çatırdı.
Maş, Van və Bitlis əyalətlərində təxribat törədən 8 min erməni qatili Rusiyada hərbi təlim keçmişdi.
İqdır əyalətində təxribatçı quldurlar 6 mindən çox idi.
Şərqi Anadoluda erməni-bandit dəstələri 100 min nəfərdən artıq qulduru öz sıralarında birləşdirirdi.
Ermənilərin xəyanəti nəticəsində rusların Şərqi Anadolunu müvəqqəti işğal edə bildilər.
1915-ci ildə nankor ermənilər Van vilayətində üsyan qaldırdılar. Yeddi gün ərzində bu vilayətin, demək olar ki, bütün müsəlman sakinləri vəhşilik və amansız

qəddarlıqla qətlə yetirildilər. Odlara qalanmış Zevə kəndinin 3 min nəfər əhalisindən salamat qurtaranı çox az idi.
Ermənilər digər türk ərazilərində olduğu kimi Van və Bitlis şəhərlərində də minlərlə qız-gəlinləri lüt soyundurub ağaclara mıxlayırdılar. Qocaların, qadınların, körpələrin başına olmazın müsibətlərini açırdılar. Qundaqdakı körpələr döşləri kəsilmiş anaların meyidləri üstə inləyirdilər, Əsir düşmüş əli-qolu bağlı türklərin gözləri qarşısında ailələrinin namusuna təcavüz edilir, hamilə qadınların qarnını yırtıb ordan çıxan qanlı uşaqları süngülərə taxırdılar.
1915-ci ildə ruslar xain və nankor ermənilərin köməyilə Trabzonu, Ərzurumu, Şərqi Anadolunu, Qarsı işğal etdilər.
1919-cu ildə ingilislər Qars şəhərini işğal edib, ermənilərə təslim etdilər.
-- Əlbətdə, igid türk oğul-qızları bu məğlubiyyətlərlə barışa bilməzdilər. Buna görə də onlar bütün varlıqları ilə düşmənə qarşı mübarizəyə qalxmışdılar. Ruslar məğlub olub geri çəkildikcə ermənilər də onlara qoşulurdular.
Bu erməniləri isə ruslar Azərbaycanın qərb ərazilərində və Qarabağ torpaqlarında yerləşdirirdi.
Ermənilər qaçarkən Ərzurumda 8 min, Ərzicanda 4 min nəfər dinc əhalini qırıb-çatdılar. Trabzondan tutmuş Ərzuruma qədər bütün şəhər və kəndlər oda qalandı, körpülər, yollar dağıdılıb viran edildi.
Bu zamanlar Ankarada yeni hökumət yaradan türk xalqının qəhrəman oğlu Mustafa Kamal Atatürkün ordusundan qorxub qaçan erməni daşnakları Qars əyalətini darmadağın etdikdən sonra Qərbi Azərbaycanın İrəvan Quberniyasına getdilər. Həmin vaxtlar 200 minə yaxın azəri türkü erməni vəhşiliyinə dözməyib İrəvan Quberniyasından İrana, Türkiyəyə vətəndaş müharibəsi illərində Türkiyənin Şərqi Anadolu bölgəsində döyüş əməliyyatları gedən ərazilərdən 600-700 min erməni köçürülmüş, onlardan 300-350 min nəfəri tələf olmuşdu. Həmin vaxtlar erməni quldurları isə 2,5 milyon türk, kürd və azərbaycanlını qətlə yetirmişdilər. İndi dünya desin görək soyqırımı kim kimə qarşı törədib? Bütün bu qırğınlarla yanaşı, erməni qaniçənləri türklərə və azərbaycanlılara qarşı genişmiqyaslı təxribat və terrorçuluq əməlləri də törədirdilər.
«Armenakan» (1885), «Hnçaq» (1887) və «Daşnaqsuyun» (1890) kimi erməni terror təşkilatları tərəfindən XIX əsrin sonlarında və XX əsrin əvvəllərində

Türkiyədə və Azərbaycanda on minlərlə günahsız insan qətlə yetirilmişdir. Ən çox Türkiyənin Anadolu bölgəsində, bu bölgənin Ərzican, İzmir vilayətlərində, Van, Trabzon, Ərzurun, Bitlis, Qars əyalətlərində və digər bir çox Türk yaşayış məntəqələrində erməni cəlladları dinc sakinləri ağılasığmaz vəhşiliklərlə, min bir əzabla öldürmüşlər.

1919-cu ildə «Daşnaksutyun» partiyası İrəvanda keçirdiyi IX qurultayında «Nemezis» intiqamçı terror hərakatına başlamaq haqqında qərar vermişdir. Armen Qaronun rəhbərlik etdiyi «Nemezis»in siyahısına 650 nəfər Türkiyənin və Azərbaycanın dövlət xadimlərinin, ziyalılarının adları salınmışdır. Ayrı-ayrı ölkələrdə fəaliyyət göstrən 3-5 nəfərlik terrorçular adları siyahida olan şəxsləri axtarıb tapı rvə qətlə yetiridilər. Məsələn, Azərbaycan Demokratik Respublikası Parlamentini sədri Həsən bəy Ağayevi, nazirlər şurasının sədri Nəsib bəy Yusifbəylini və xarici işlər naziri Fətəli xan Xoyiskini 1920-ci ildə Tiflis şəhərində ermənilər qətlə yetirmişlər. 18 iyul 1921-ci ildə Azərbaycan Demokratik Respublikasının Daxili İşlər Naziri Behbud xan Cavanşir Türkiyənin İstanbul şəhərində «Daşnaksutyun» partiyasının üzvü Mişaq Torlaqyan tərəfindən oldürülmüşdür.

Osmanlı İmperiyasının Daxili İşlər Naziri Tələb Paşa 15 mart 1921-ci il də Berlində, Hərbi Naziri Ənvər Paşa 4 avqust 1922-ci ildə Əfqanıstan yaxınlığında erməni terrorçuları tərəfindən qətlə yetirilmişlər. Camal paşanı və onun müavinini eyni gündə—25 iyul 1922-ci ildə Tiflisdə erməni terrorçuları Petros Ter-Poqosyan və Artaşnst Gevorkiyan öldürmüşlər.



Osmanlı İmperyasının daxili işlər naziri

**Tələt paşa**



Azərbaycan Demokratik Respublikasının daxili işlər
naziri **Behbud xan Cavanşir**



Azərbaycan Demokratik Respublikası Parlamentinin sədri
**Həsənbəy Ağayev**



Osmanlı imperyasının hərbi naziri
**Ənvər Paşa**



Azərbaycan Demokratik  Respublikası Nazirlər Şurasının sədri

**<u>Nəsib bəy Yusifbəyli</u>**



Azərbaycan Demokratik  Respublikasının xarici işlər naziri

**<u>Fətəli xan Xoyski</u>**



*Camal paşa və onun müavini*
*erməni terrorçuları tərəfindən qətlə yetirilmişl*

İsmayıl Türkiyədə hərbi təhsil alarkən öyrənmişdir ki, həm Türkiyədə həm də Azərbaycanda ermənilə tərəfindən Türklərə (həmçinin azəri türklərinə) qarşı aparılan soyqırımı siyasəti xüsusi amansızlıqla və vəhşiliklə yerinə yetirilirdi.

1915-ci ilin mart ayında trməni terrorçuları üsyan qaldıraraq Türkiyənin Van şəhərini ələ keçirmiş və 3 min nəfərdən çox türkü qəddarlıqla qətlə yetirmişlər.

1916-cı ilin aprel ayınadək rus ordusu özlərini «Üsyançı dəstələr» adlandıran erməni quldurları ilə birlikdə Şərqi Anadolunun böyük bir hissəsini—Trabzon, Ərzurum, Bitlis və başqa əyalətləri işğal etdi. Nəticədə təxminən 1 milyona qədər türk öz yurd-yuvasından didərgin düşdü.

Tarixi faktlar onu sübut edir ki, vətəndaş müharibəsi illərində (1914-1920-ci illərdə) ermənilər tərəfindən 2,5 milyon türk, kürd və azərbaycanlı əhalisi qətlə yetirilmişdir. Şərqi Anadoluda türk ordusunun həmləsindən qorxub qaçmış erməni millətçi dəstələri Azərbaycanda öz qanlı cinayətlərini davam etdirdilər. Həmin vaxtlar təkcə İrəvan Quberniyası ilə qonşu olan Azərbaycanın Zəngəzur Mahalında 115 kənd dağıdılmış, viran edilmiş, 3257 nəfər kişi, 2276 nəfər qadın 2196 uşaq qətlə yetirilmiş, 1060 kişi, 794 qadın, 245 uşaq ömürlük şikəst edilmişdi.

Belə kütləvi qırğınlar hələ XIX əsrin ortalarından başlamışdı. 1870-ci illərdə Bolqar çarlığı ərazisində bir neçə gün ərzində 500 min nəfərədək dinc türk əhali kütləvi qırğına məruz qalmışdı. Bu əsl soyqırım idi.

1896-cı ilin iyulunda ermənilərin Vanda qaldırdığı üsyan 1915-ci ilin yazında erməni quldur dəstəklərinin, Vanın bütün müsəlman əhalisini kütləvi qətlə yetirməsi kimi faciənin ilkin səbəbləri idi.

Amerika tarixçiləri yazırlar ki, 1915-ci il mayın 14-də böyük sayda erməni könüllülərini öz sıralarında birləşdirən rus ordusu Vana çatdıqdan sonrakı iki gün ərzində ermənilər yerli müsəlman əhalisini kütləvi surətdə qırdılar. Rusların Ərzurumu almasından sonra bütün müharibə tarixində ermənilər tərəfindən dinc əhalinin ən dəhşətli üsullarla qırılması və təhqir olunması baş verdi.

İsmayıl onu da bildirdi ki, ermənilər tərəfindən Osmanlı ordusunun arxa cəbhəsində, Anadolunun Zeytun, Bitlis, Sivas, Van və başqa şəhərlərində türk əhalisinin az qala sonuncu nəfərə qədər məhv etmələrindən, 1915-ci ilin yazında erməni yaraqlılarının «Van Erməni Respublikası» elan etmələrindən sonra ermənilərin hərbi əməliyyatlar keçirildiyi bölgələrdən kütləvi şəkildə imperiyanın cənubuna köçürülməsi başlandı. Bu, ermənilərin öz Türkiyə vətəninə qarşı göstərdikləri xəyanətdən sonra baş verdi. Buna görə də «Böyük Ermənistan» yaratmaq kimi absurd xəyallara düşən ermənilərin uydurduqları kimi 1915-ci ildə Osmanlı İmperiyası tərəfindən bu «əzabkeş» millətə qarşı heç bir soyqırımı olmamışdır. Lakin satqın və xəyanətkar daşnak rəhbərlərinin başladıqları vətəndaş müharibəsində qurban kimi qırğına verdikləri minlərlə ermənin qanı axıdılmışdı.

İndi yalandan aləmə car çəkib Türkiyədən milyardlarla dollar vəsait aparmaq tamahıyla 1915-1923-cü illərdə, guya ki, 1 milyon yarım erməniyə qarşı soyqırımı böhtanını zorla, ermənipərəst dövlətlərin təsirilə tarixə pərçimləmək iddiası «köpəyin ulduzlara hürməsi»ndən başqa bir şey deyildi.

İsmayıla məlum idi ki,  Ermənilər təkcə kütləvi qırğınlarla, işgəncəli ölümlərlə kifayətlənmir, işğalçılıq siyasətini davam etdirirdilər. Bunlarla yanaşı, 1935-ci ildən başlayaraq erməni millətçi eksterimistləri kütləvi şəkildə həm xəritələrdə, həm də 1917-1920-ci illərdə işğal olunmuş qədim Azərbaycan torpaqlarında Türk-Azərbaycan mənşəli 15 min coğrafi adı dəyişdirmişlər.

1905-1907-ci və 1918-1920-ci illərdə Qərbi Azərbaycandan yerli azəri türklərinin zorla çıxarılması üçün onların başına gətirilən müsibətlərin sayı-hesabı yox idi…

**Ata – baba torpağı**

Bu yurdun adı torpağı da, daşı da, kolu da – kosu da sehirlidir, ovsunludur. Burada göy də başqa cürdür, yer də. Otu, çiçəyi, havası, suyu can dərmanıdır, hamısı bal dadır. Bu yurdda vaxtından əvvəl xəstələnib öləni ağlına gətirmə. 70-80 yaşında evlənib oğul atası olan nə qədər kişilər yaşayıb burda. Kişiləri bu yurdun qayaları kimi dözümlü, lakin mehriban, sadə, səmimi, qadınları gül kimi zərif, gözəl-göyçək, bulaq suyu kimi saf və təmiz olmuşlar. İndi qan içində inildəyən İsmayılın ata babası Əbdüləhəd kişi Türkiyənin İqdır şəhərinə köçənə qədər yaşadığı Qərbi Azərbaycanın Dərələyəz Mahalındakı Selim yaylağı, Karvansara dünyanın elə bir cənnət timsal guşəsidir ki, Behişti anlamaq üçün bu məkanı görmək kifayətdir. Burada hər fəslin özünün gözəlliyi var. Fəsillərin xasiyyətini bilməyənlər Dərələyəzdə yaşaya bilməz ki! Qışında yalan olmasın, adam boyda qar yağır. Külək əsəndə qardan elə tar əmələ gəlir ki, bəzi yerlərdə gediş, gəliş kəsilir. Qonşudan-qonşuya belə getmək olmur. Bir gecədə yağan qarı damların üstündən təmizləməsən, divarlar uçub dam yata bilər. Səhər o başdan kəsən qar ovçuların sevincinə səbəb olardı, çünki təzə qarda düşən iz ovçuları çox əziyyət çəkməyə qoymazdı-izi tutub gedər, əlidolu geri qayıdardılar. Ayı, donuz, canavar, dağ keçisi, vaşaq ovlardılar, dovşan, kəklik, çil vurardılar. Gecə kənarda qalan at, ulaq, davar yiyəsiniki deyildi, canavarlar o saat parçalayırdılar. Sonra ovçular heyvan leşinin ətrafında tələ qurar və tələyə düşən canavarın dərisini soyub, qurudub dövlətə satardılar.

Qış gecələri camaat nağıla, dastana yığışardı. Kiminsə böyük damında, və yaxud bir geniş otaqda aşıqlar səhərə qədər çalıb-çağırardılar. Bəzən bir dastanın davamı o biri gecəyə qalardı. «Əsli və Kərəm», «Tahir və Zöhrə», «Abbas və Gülgəz», «Koroğlu» dastanları yığnağın ən çox arzuladığı xalq yaradıcılığı nümunələri idi.

Dərələyəzin yazı elə haylı-küylü gələrdi ki, bəzən öz övladlarını vahiməyə salardı. Boz ayın boz üzündən sonra ildırımların şaqqıltısı qarışıq elə gürşad başlardı ki, yayda sızqa axan dağ çayları göynən gedər, Apra çayı aşıb-daşıb yeri-göyü lərzəyə salardı. Bu çayın sel ağzında ev boyda daşlar çırtmadaşa dönərdi.

Yazın ilıq havalarında dağ-dərə gül-çiçək sərgisi kimi adamı məftun edərdi. Qarın ərimiş ağzıynan bitən qar çiçəyi əlvan gül dalğalarının müjdəsini gətirərdi.
Çəmənlərin ətri hər yana yayılıb adamı bihuş edərdi. Quşların nəğməsi əsəblərə layla çalardı. Hər yan yaşıl sevincə bürünərdi.

***Bura yaşıl möcüzədir, möcüzə,***
***Heyrətimin zirvəsinə çatmışam.***
***Oturmuşam bir bulaqla diz-dizə,***
***«Segah»ının ovsununa batmışam.***

***Meşələri nəğmə dolu dünyadı,***
***Dərə var ki, eşitməyib gün adı.***
***Bir gözəli məni yaman qınadı—***
***Ürəyimi təbiətə satmışam.***

***Hər talanın göz muncuğu—bulaq var,***
***Gül-çiçəyi dizlərimi qucaqlar.***
***Məni elə sehirləyib bu dağlar,***
***Bilməmişəm, ayaq üstə yatmışam.***

Dərələyəzin, Selim yaylağının yayı, payızı barlı-bərəkətli olur. Bu fəsillərdə uzun qışa hazırlıq görərdilər. Çöl meyvələri—alma, armud həmərsin, itburnu, haluş, giviş, zirinc, dərman bitkiləri olan əvəlik, ələyəz (elə Dərələyəz sözünün də mənası ələyəzli dərə deməkdir),şıpır, çaşır, baldırğan, şoşan, cajıx, piltan, çaşır, məröycə, qulancar, quzuqulağı, yemlik, qazayağı…yığılar, qış üçün lazım olanı ayrıca tədarük edilər, turşuya qoyulanı, hörülüb-qurudulanı ayrıca hazırlanar, yeyiləni yeyilər, xörəklərdə işlənəni işlənərdi.
Bulaqların üstü qələbəlik olardı. Para şaqqanı bir adam yesin, üstündən bir parç bulaq suyu içsin, elə bil heç nə yeməmisən.
Mal-heyvan, qoyun-keçi sürüləri bu yerlərin bərəkətindən xəbər verirdi. Dərələyəzin balı can dərmanı kimi bütün aləmə səs salmışdı. Baldan gül-çiçək ətri gələrdi. Qovurmasının, motal pendirinin, şorunun, dənəvər sarı yağının, lavaşının, fətirinin dadı indəyədək damaqlarda qalıb.

Lakin bu nemətləri erməni quldurları zaman-zaman zəhər-zəqquma döndərirdilər. Həqarətlərə, təhqirlərə, əzablara, ölüm xofuna, qan selinə nə qədər dözmək olardı?! İsmayılın babası Əbdüləhəd kişi də öz doğma yurduna bəslədiyi ilahi sevgidən əl çəkib, qürbətə üz tutmaq istəmirdi. Onun atası da, babası da, ulu babası da bu dağların qoynunda, buz kimi büllur çeşmələrin, zümrüd meşələrin, min nəğməli dağ saylarının dövrəsində yaşamış, bu torpağa bağlanıb ömür etmişlər. Bu yerlərin adamları da suyu, havası, torpağı kimi saf idilər, qərəz, kin, xəbislik nə olduğunu bilmirdilər. Hamı bir-birinə qaynayıb-qarışmış, qohum-qardaş olmuşdular. Əbdüləhəd kişiyə dərd güc gələndə bu bayatını pıçıldardı:

***Əzizim, nə dən yaxşı,***
***Geyməyə kətan yaxşı.***
***Qürbət el cənnət olsa,***
***Ölməyə Vətən yaxşı.***

Beləcə günlər ötüb gedir, lakin ermənin qəddarlıqları səngimək bilmirdi. Bir tərəfdə qan, ölüm, o biri tərfədə Vətən məhəbbəti. Əbdüləhəd kişi od ilə su arasında qalmışdı. Eldə-obada sayılıb-seçilən samballı, adlı-sanlı kişilərdən

biriydi Əbdüləhəd kişi. Ona qaniçən ermənilərin ətraf mahallarda və Dərələyəzin özündə müsəlman əhalisinin başına hansı müsibətləri gətirdiklərindən və onları daha hansı təhlükələr gözlədiyindən xəbərdar idi.

Dərələyəz mahalının tarixi çox qədimlərə gedib çıxır. Yazılanlara görə farslardan həmişə pislik görən Məşədi İdris adında bir kişi baş götürüb öz ailəsilə köç edir və axırda gəlib Dərələyəz Mahalında qalırdı. Deyilənə görə bu bölgənin ilk sakinləri də elə İdris kişinin törəmələri olub.

Bu diyar və onun əhalisi XIV əsrin sonlarında buradan öz qoşunu ilə Ərzurum tərəfə keçib-gedən Əmir Teymurun da çox xoşuna gəlmişdi.

Dərələyəz Mahalı vaxtilə Naxçıvan xanlıqlarının tərkibində olmuşdur. Naxçıvan 1827-ci ildə rus qoşunları tərəfindən tutulandan sonra, 1828-ci ildə Rusiya-İran arasında bağlanmış «Türkmənçay» müqaviləsinə əsasən Dərələyəz də Naxçıvanın tərkibində olmaqla Rusiyanın əyalətlərindən birinə çevrilmişdi.

1850-ci ildə Şərur-Dərələyəz Qəzası biri-birindən ayrılmış, Şərur Naxçıvan Qəzasına, Dərələyəz isə İrəvan quberniyasına tabe edilmişdir.

Əbdüləhəd kişi bilirdi ki, ermənilər zaman-zaman türkdilli xalqlara qarşı öz qatı düşmənçilik niyyətlərini xüsusi əzazilliklə yerinə yetirmiş və bu kin, bu nifrət get-gedə daha da güclənməkdədir.

Əbdüləhəd bəyin babaları da Qərbi Azərbaycanın say-seçmə bəylərindən olublar. Əbdüləhəd bəyin özü isə dərin alim və din xadimiydi. Yəni İslam dininin mükəmməl bilicisiydi. O, əhli-beyti bütün insanlara çatdırmağı özünə borc bilirdi. Nə evdə, nə də el arasında onun bir sözünü iki eləyən olmazdı. Bir sözlə, zəmanəsinin sanballı, ləngərli, ağır kişilərindəniydi. Qan düşmənçiliyi onun gəlişiylə barışığa çevrilərdi. Kimin hədini nəydi Əbdüləhəd bəy olan yerdə  ağzının danışığını itirsin, hədyan-mədyan danışsın. O dəqiqə qartal baxışları kimi sərt bir baxış məzəmmətilə qarşılaşardı. El arasına çıxanda hamı özünü yığışdırırdı.

İndi belə bir adam dərin fikirlərə qərq olmuşdu. Neyləsin? Vətəni tərk edib, yaşının bu çağında didərginmi olsun? Əgər getməsə, bəs nəslin-kökün taleyi necə olacaq? Kim zəmanət verə bilər ki, bu köpək-uşağı ermənilər günlərin  və yaxud gecələrin birində bura da hücum edib, əhalini qırıb-çatmayacaqlar, namussuzluq törətməyəcəklər? Hər şey o yana, Əbdüləhəd bəy onun qeyrətinə kölkə sala biləcək adi bir hərəkəti də ölümdən pis bilirdi. Kişi kimi ölməyin özü elə kişi işidir.

Ailədə və kənd içində onun tez-tez dərin fikrə getdiyini hamı görür, hamı duyurdu, lakin səbəbini soruşmağa heç kəs cürət etmirdi.

Erməni qəddarlığı qızışdıqca, qırğınların sayı çoxaldıqca Əbdüləhəd bəyin də narahatçılığı artırdı.

Nəhayət, bir gün kəndin nüfuzlu adamlarını başına cəmləyib, narahatçılığının səbəblərini açıqladı:

-- Ermənilərin nələr törətdiklərini əlbət siz də eşidirsiniz. Camaatımıza divan tuturlar, qan dizə çıxır. Bir yandan da aclıq qırır adamları. Bizimkilər hətta atların zibillərinin içərisindəki Arpa dənlərini seçib yeyirlər. Gündə bir xəbər gəlir. Ruslar bir yandan, ermənilər o biri yandan bizləri məhv edirlər. Eşitmişəm ki, Türkiyənin bəzi vilayətlərində və Azərbaycanda da Müsəlmanlara qarşı eyni vəhşilikləri törədirlər. Təhlükə başımızın üzərini alıb. Onlara müqavimət göstərmək isə ağılsızlıqdır. Çünki onlar toplu-tüfəngli, biz isə əliyalın. Həm də hamı zülmün əlində qaçıb dağılır.

Sizin fikriniz nədir?

Qohumlardan biri dilləndi:
-- Əbdüləhəd əmi, mən ölsəm də, öz torpağımızda ölmək istəyirəm. Baş götürüb qaçmağı kişiliyimə sığışdıra bilmirəm.
-- Kəs səsini! – Əbdüləhəd bəy qeyzləndi. Kişiyə bax! Belə çıxır ki, daha səndən başqa burada kişi yoxdur?!
Sonra səsinin sərtliyi azaldı:
-- Arvad-uşağı qırğına vermək olmaz! Guya mənim çox ürəyimcədir ki, dədə-baba yurdumu tərgidib gedim. Ayrı əlacımız yoxdur. Bu köpəkuşağı qocaya, cavana, qadına, körpəyə baxmır, əllərinə kim keçdi doğram-doğram edirlər. Biz canımızın qorxusundan qaçmırıq, arvad-uşağı xilas etməliyik.
Daha heç Kim dillənmədi.
Həmin gecə ermənilər qəflətən Oba kəndinə hücum etdilər.
Şivən göyə qalxmışdı. Dəhşətli qışqırtıdan nalədən qulaq tutulurdu. Güllə səsləri, ermənilərin nəşəli çığırtı-bağırtıları ətrafı bürümüşdü. Kim hara gəldi başını götürüb qaçırdı. Birinin o birisinin hayına çatmaq imkanı yox idi. Ermənilər qabağına keçən azəri türklərini süngüdən, qılıncdan keçirir, baltayla doğrayır, evlərə dolduraraq od vurub yandırır, hamilə qadınların qarnına yabanı soxub, bağırda-bağırda öldürür, diri-diri torpağa basdırır, yüz cür işgəncə törədir və namussuzluq edirdilər.
Ölüm haqq işidir. Zülümlə öldürmək isə erməni quldurları kimi vəhşilərin işidir.
Əbdüləhəd bəy ailə üzvləri ilə (4 oğlu həyat yoldaşı və digər bir neçə qohumu) birlikdə Araz çayının qırağına sağ-salamat necə gəlib çıxdığına özü də inana bilmirdi. Kəndlərindəki erməni dəhşətindən ağlını itirəcək hala gəlmişdi. Adamların ah-fəğanı hələ də qulaqlarında gumbuldayırdı.
Ermənilər sağ qalıb canını qaçıran adamların arxasınca düşür, harda tuturdularsa uşağa, böyüyə baxmadan işgəncə ilə qətlə yetirir, diri-diri gözlərini çıxarır, əzaları kəsir, buğum-buğum doğrayır, döyə-döyə öldürür, süngüləyir sağ-sağ od vurub yandırır, özlərinə qazdırdıqları bir çalaya onlarla adamı doldurub üstlərini torpaqlayıb, körpə qızlara, qadınlara qarşı kişilərin gözləri qabağında yüz cür qeyrətsizlik edirdilər. Belə ağır faciələrin şahidi olan azəri türklərinin çoxu ya dəli olur, ya ürəyi partlayır, ya da sonralar çox yaşaya bilmirdilər.
Əbdüləhəd bəyin adamları Araz çayının qırağına üz tutanda onların da arxasınca ermənilər düşmüşdülər. O, ailə üzvlərini çayın sahilindəki bir dalda yerə yığıb dedi:

-- Siz burada gizlənin, səs salmayın və heç yana tərpənməyin, mən bir keçid tapıb, qayıdıram. Biz o taya keçməliyik.

Sonra özü Arazın qırağıynan üzü aşağı yollandı. Xeyli axtardı, nəhayət, dayaz bir yer manşırlayıb, geri qayıtdı. Lakin ailə üzvlərini qoyub getdiyi yerdə tapmadı. Onu dəhşət bürüdü. Diqqət kəsildi. Bir az aralıdan pıçıltı eşidilirdi. Deyəsən, ermənilər idi. Əbdüləhəd bəyin gözlərinə qaranlıq çökdü. Ürəyindən dəhşətli bir gizilti keçdi: «Olmaya erməni əlinə düşdülər!!!».

O, aşağı çökdü. Ürəyi partlamaq dərəcəsinə gəlirdi. Xeyli gözlədi. Bayaqkı yavaş səslər uzaqlaşıb itdi. Bəy yerindən dikəlib ehtiyatla ətrafa nəzər saldı. Heç kim yox idi. O, abır addımlarla çay yuxarı getməyə başladı. Gözlərinə qaranlıq çökmüşdü. Hiss edirdi ki, taqəti get-gedə kəsilir. Buna baxmayaraq

yeriyirdi. Bağırıb çağırmaqdan özünü zorla saxlayırdı. Birdən səs eşitdi. Aşağı əyilib qulaq asmağa başladı. Çətinliklə ayırd etdi ki, azərbaycanca danışırlar. Yavaş-yavaş səs gələn tərəfə yaxınlaşdı. Öz kəndlilərinin səsini tanıdı. Aralıdan sakitcə səsləndi:

-- Mənəm, Əbdüləhəd bəy.

Adamların gözlərində işıq yandı: «Əbdüləzəd bəy buradadırsa, deməli, nicat tapacaqlar!».

Bəy isə özündə deyildi. Onlardan özünküləri soruşdu, gördüm deyən olmadı. Kişinin ümidi get-gedə azalırdı. Kəndçilərinin o taya keçmək yalvarışlarına baxmayaraq, gəldiyi yolla geri qayıdaraq onları yenə axtarmağa başladı. Qaranlıq düşürdü. Əbdüləhəd bəyin yorğunluqdan ayaqları arxasınca gəlmirdi. O qədər gəzmişdi ki, heydən düşmüş, taqətdən kəsilmişdi. Arxası üstə torpağın üzərinə uzandı. Gözləri yaşla doldu. Ağlı kəsəndən ağladığı yadına gəlmirdi. Göz yaşını öz kişi qüruruna sığışdıra bilmirdi. İndi də özüylə mübarizə aparırdı, ürəyində ağlayırdı. Lakin ha çalışdı, göz yaşlarını saxlaya bilmədi—yanağıynan aşağı yaş selləndi. Üzü üstə çönüb beləcə sərili qaldı…

Ermənilər Türklər yaşayan bütün məntəqələri alt-üst edir, Azərbaycanın qərbində və şimalında olduğu kimi Türkiyədə də soyqırımı siyasətini xüsusi bir amansızlıqla həyata keçirirdilər.

Tarixi mənbələrdə öz əksini tapan aşağıdakı hadisələr ermənilərin kim olduğunu öyrənmək üçün «adi detallardır».

Ərzurumun yaxınlığında Alacaköy adlı bir kənd var. On səkkizinci il martın 12-də ermənilər bu kəndin işlərini—270 nəfəri sıraya düzüb qurşunlamışlar.
Kəndin gözəl bir gəlinini divara mismarlayıb diri-diri köksünü yarmış ürəyini çıxarıb başının üzərindən çəngələ keçirmişlər.
Ərzurumun bir Dağ kəndi var: Hınıs.
Erməni yaraqlıları Fatma adlı bir ananın süd əmməkdə olan körpəsini döşündən alıb, çəngələ çəkmiş, sonra onu təndirə salıb qızartmış «yeyəcəksən»-- deyə bədbəxt ananı didik-didik eləmişlər…
1877-ci ildə ruslar Osmanlı İmperiyasında işğal etdikləri əraziləri ermənilərə təhvil verəndən sonra onlar Ərzurumda 600 mindən çox dinc əhalini uşaqdan tutmuş qocaya qədər hamını qılıncdan keçirdilər. Ermənilər hətta bələkdəki körpələri doğrayırdılar.
1918-ci ilin yazında Ərzurumda «küçələr başdan –başa qadın, uşaq, ixtiyar cəsədləri ilə doluydu. Qadınların məmələri, hətta ən məhrəm üzvləri kəsilib divarlardan asılmışdı. Bu teleqraf tellərindən yüzlərcə çocuq ciyəri asılmışdır. Qadınları deşilmiş cırıl-çılpaq qadın cəsədləri insanı dəhşətə gətirirdi..».
Qarsın Ərdahanında bizi yer üzündən silməyə çalışan daşnaklar heç kəsə gülləni qıymamışlar: adamları öz qapısındakı su quyusuna ataraq məhv etmişlər. Bayburdda da eyni vəhşilikləri törətmişlər.
Bəzən də köməksiz əhalini samanlığa təpib odlayırdılar. Məscidlərə doldurub, neft töküb yandırırdılar.
Bir çox hallarda isə adamların ayağını başına çatıb, bu amansız dəhşətlərlə məhv edirdilər.
On səkkizinci ilin mariında erməni faşistləri Bakıda da bənzəri vəhşiliklərlə əhalini qətlə yetiridilər. Soydaşlarını xilas etməyə gələnlərdən Nuru Paşa xatirələrinin bir yerində yazır ki, daşnaklar kişiləri harda gəldi güllə ilə öldünmüşlər. Şəhərin küçələri meyidlə dolu idi və bunlar artıq ağırlaşmışdı, çürümə gedirdi: Uşaqların kəsilmiş başlarından təpəciklər düzəltmiş—nişan qoyub əylənirdilər: qadınlara güllə atmamışlar, onları şişlərlə namusuzcasına qətlə yetirmişlər… Erməni cəlladları üç günün içərisində 27 min Bakı sakini olan soydaşımızı ağır işgəncələrlə öldürmüşlər.
Səkkiz yüzdən artıq zavallı türkü qətlə yetirmişlər.

Biçarə türkləri əvvəlcədən qazıb hazırladıqları quyuların başına gətirərək orda heyvan kimi boğazlarını üzmüş və quyulara doldurmuşdular. Hər 19
quyuda 80 nəfər basdırmaq qərarında olduqlarından sayırmışlar: «Yetmiş oldu? On nəfər də kəs!»

Səksən nəfər biçarə türkü bir evdə doldurub qapıdan çıxarkən bir-bir balta ilə başlarını parçalayır və hәzz alıb əylənirdilər.

Alacaköydə olan cəsədlər insanın ağlını başından çıxaracaq bir görünüşdə idi. Bütün uşaqlar süngülənmişdi, yaşlılar və qadınlar samanlıqlara doldurulub yandırılmış, gəncləri baltalarla doğramışlar. Civələrə asılmış başlar və ürəklər görünürdü…

1918-ci ilin martın 11-dən 12-ə keçən gecə Ərzurumda qırılan türklərin sayının üç min nəfərə çatdığını ermənilər özləri qeyd etmişdilər.

Ərzurumun böyük qırğınında (1918) hamama doldurulmuş 272 nəfərdən cəmi 100 nəfərini xilas etmək mümkün olmuşdu.

1906-cı il avqustun 18-də palaz altında 15 uşağın kəsilmiş başları tapıldı. Cənub səmtdə həddən artıq arvad-uşaq bədənləri tökülmüşdü.

Oxçu-Şabədin kəndində palazın üstünə on beş körpənin başını yığmışdılar.

Saqqarsuyun ətrafında qan gölməçəsinin üzü buz bağlayıb, ancaq daşın bir tərəfində damcı-damcı sızır. Daşın arasında 62 qadın və uşaq cənazəsi üst-üstə qalanmışdı.

Camurlu kəndində kişilərin başını, qadınların döşlərini kəsəndən sonra meyidləri yandırmışlar.

Şaraba kəndində bütün kişilərin başını kəsmiş, uşaqları təndirdə yandırmışlar.

1905-1907-ci illərdə ermənilər tərəfindən İrəvan Quberniyasında, Qarabağda, Bakıda, Şamaxıda yüzlərlə kənd yerlə yeksan edilmiş, yüz minlərlə dinc əhali vəhşicəsinə qətlə yetirilmiş və doğma yurdlarından qovulmuşlar.

1918-ci ilin mart ayında erməni quldurları bolşevik bayrağı altında Bakı, Şamaxı, Quba qəzalarında, Qarabağda, Zəngəzurda, Naxçıvanda və Azərbaycanın digər bölgələrində azəri türklərinin soyqırımını eyni qəddarlıqla həyata keçirmişdilər— kəndlər yandırılmış, dinc əhali kütləvi sürətdə qətlə yetirilmişdi.

«Vedibasar, Zəngibasar, Eçmiadzin, Bazarkeçər, Dərələyəz qəzalarından erməni daşnak quldurlarının törətdikləri qırğından qaçıb Naxçıvana sığınan 1 milyondan

artıq azəri türkü açıq havada, səfalət içərisində əzab çəkirdi, epidemiya və ehtiyac onları əldən salmışdı. Hər gün yüzlərlə adam ölürdü».

Erməni daşnakları 1918-ci ilin yazında tək Bakı şəhərində 3 gün ərzində 12 minə yaxın azəri türkünü vəhşicəsinə qətlə yetirdilər.

Hamazaspın quldur dəstəsi 1918-ci il mayın 1-də Qubada Kərbəlayi Məmməd Tağı oğlunun 14 nəfərlik ailəsini qılıncından keçirmişdi. Erməni əsgərlərinə müsəlman qadınları gətirdiyinə görə Əli Paşanın gözü qabağında oğlunun gözlərini çıxarmış, sonra hər ikisini öldürmüşlər.

1918-ci il iyun ayının ortalarında general Andranik öz quldur dəstəsilə Abrakunikasiya, oradan Naxçavana çəkilir. Sonra Oxçay vadisilə miqdarda türk kəndlərini dağıdır. Təkcə Yaycı kəndində 2500 adam faciəli şəkildə öldürülür və Araz çayında batırırlar.

Zəngəzur qəzasında Andranikin silahlı birləşmələri bütövlükdə 10 min 68 adamı öldürmüş və şikəst etmişlər.

Erməni A. Lalayan yazırdı: «Ermənistanda daşnak hökuməti 30 aylıq hakimiyyəti dövründə (may 1918-noyabr 1920) Azərbaycan əhalisinin 60 faizini… qırmışdır».

1919-cu ildə mətbuatda yazırdılar ki, artıq Göyçə mahalında müsəlman qalmayıb, Yeni Bayazid Qəzasında 84 müsəlman kəndi dağıdılıb, 15 mindən artıq evi olan kəndlərin əhalisi bütün malı, dövləti başlı-başına buraxıb qaçmışdır.

**Bənzəri vəhşilikləri daşnaklar Azərbaycan ərazisində də törətmişlər**.

Bədnam Andranikin dəstəsi Göycə mahalında elin sevimli aşığı Dədə Nəcəfin üryan kürəyinə samavarı bağlayar, odunluğuna kömür töküb kefləri üçün çay dəmləmişlər.

Bir erməni əlindəki zopanı yaralı yıxılmış türkün ağzına soxmaq istəmiş, lakin türkün dişləri kilidləndiyindən bu, mümkün olmamış və erməni onu təpikləyə-təpikləyə öldürmüşdü.

Vağudi kəndində 400 nəfər məscidə doldurulmuş və yandırılmışdır.

Nüvədi kəndində yataqda olan xəstə Əsəd bəy Məlik Abbasovun sinəsinə süngü sancmışlar.

Vağudidə Qədimə Tahir qızının döşlərini xəncərlə doğramış, öz qızının ağzına tıxamış və hər ikisini öldürmüşlər.

Ağudi kəndində Qulaməli Şəkərovun oğlunun ayağını top uqdan kəsmiş, bədənini süngi ilə dəlik-dəlik etmiş və ölənədək yeriməyə məcbur etmişlər.
Bağırlı kəndində 7 nəfər kişi və qadını bir evdə yandırmışlar.
Qatar kəndində Məşədi Qələndər kişini öldürmüş və üstünə neft tökərək camaatın gözü qabağında yandırmışlar.
Həmin kənddə Kərbəlayi Allahverdinin başını kəsmişlər.
Rəhman Əfəndi kəndində İbrahim Hacıhüseyn oğlunun gözlərini çıxarmış, diri-diri yandırmışlar.
Kərbəlayi Mehdinin başını kəsib yolun qırağındakı daşın üstünə qoymuşlar.
… Əbdüləhəd bəy handan-hana özünə gəldi. Səhərin açılmasına az qalmışdı. Ürəyində dözülməz bir ağrı, bir göynəm vardı. Olub-keçənləri yadına salmağa çalışdı. Fikri aydınlaşdıqca bədənini gizilti bürüyürdü. Araz çayının qırağında, əlləri qoynunda əlacsız qalmışdı bu nər kişi. Bilmirdi neyləsin, ermənilərin içinə-öz doğma oba kəndinə qayıtsın, yoxsa çayı o taya keçsin. Ailəsinin taleyini öyrənmədən necə çıxıb gedərdi ki? Bu onun mənliyinə uyğun gəlməyən şey idi. Quldurların içinə qayıtmağın isə faydasız olduğunu dərk edirdi. Qalmışdı qırıla-qırıla. Ağır dərd yükünün altında Arazın qırağıynan o tərəf-bu tərəfə var-gəl edirdi. Qəddi əyilmiş, çiyinləri aşağı sallanmışdı. Ha fikirləşirdi, bir yana çıxara bilmirdi, eləcə qalmışdı çar-naçar.
İşıqlanana yaxın ailəsini tapmaq ümidilə yenə Araz boyunca üzüyuxarı gedərkən uzaqdan bir dəstə erməni yaraqlısının o tərəfə gəldiyini gördü. Heç nə düşünmədən özünü çaya vurdu. Arazın lilli suları onu qoynuna aldı…
Araza gah həsrət dedik, gah da göz yaşı,
«Bir vətəni parçalayan dərddi»--demişik.
«Azərbaycan torpağına Allah qarğışı,
Bəxtimizə qara yazı, xətdi»-- demişik.

Sularında kədər ağlar, intizar inlər,
Ləpələri ayrılığın ləpirləridir.
Tikanları qəmə dönən qara məftillər
«Gülüstan»la «Türkmənçay»ın sətirləridir.

Sahillərin bir-birinə əli uzalı—
Aralıqdan hicran axır, ayrılıq axır.
Neyləsin ki, taleyinə sərhəd yazılıb?
Vətənsizlik Arazı da yandırıb-yaxır.

Sərhəd olmaq bu bədbəxtin suçu sayılsa
Sularını qurudardıq uda-uda biz.
Həsrətləri qovuşdurmaq Araza qalsa
Sərhədləri bu dünyadan silərdi təmiz.

Olmasaydı, sərhəd idi dağ ki, dərə ki,
Qınayanlar günahkarı tapıb qınasın.
Mən oğluma Araz dedim ona görə ki,
Hər adını çağıranda bağrım qanasın.

**TARİXİ GERÇƏKLİKLƏR**

Bir vaxtlar Qərbi Azərbaycanda 18 mahal olub və bu mahallarda yaxın keçmişədək Oğuz türkləri mütləq çoxluq təşkil ediblər.

İrəvan, Göyçə, Dərələyəz, Vedibasar, Zəngibasar, Dilican, Zəngəzur, Ağbaba, Loru, Pəmbək, Şörəyel, Dərəçiçək, Abaran, Gərnibasar, Qırxbulaq, Karbi, Sərdarabad, Talin mahalları 30 min kvadrat kilometr ərazini əhatə edirdi. Bu mahallarda 2300-ə yaxın azərbaycanlı kəndi, neçə-neçə iri şəhər və qəsəbə vardı.

1920-ci ilədək Azərbaycanın tərikibində olan Naxçıvan Quberniyasının Şərur-Dərələyəz Qəzası bir tərəfdən Naxçıvan mahalı ilə, digər tərəfdən İrəvan Quberniyasının İrəvan Qəzası ilə, şimali-qərbdən Göyçə Mahalı və Kəlbəcərlə, bir tərəfdən isə Zəngəzur—Laçınla həmsərhəd olmuşdur. Sahəsi 2300 kvadrat kilometrdən çox idi.

1915-ci ildəki qarışıqlıqdan istifadə edən erməni silahlı dəstələri quldurbaşı Yaponun rəhbərliyilə Şərur-Dərələyəz Qəzasındakı müsəlman kəndlərini yerlə-yeksan etmiş, əhalinin əksəriyyətini süngüdən keçirmişdilər.

1918-1920-ci illərdə təkcə Dərələyəzdə deyil, digər Azərbaycan və Türkiyə torpaqlarında da Andranik, Hamazasp, Hayk, Drov və Nəcdeh kimi qana susamış generallar öz quldur dəstələrilə milyonlarla dinc müsəlman əhalisini amansızlıqla

qətlə yetirmiş, yüzlərlə elləri, obaları, şəhərləri, kəndləri darmadağın edib viranəyə çevirmişlər.

## SİRLİ HADİSƏLƏR

Əbdüləhəd bəyin ailəsinin başına gələn müsibətlər də həmin illərin sonlarına təsadüf edirdi. Çox imanlı adam olduğuna və quran əhli sayıldığına görə onun haqqında maraqlı söyləmələrin bəziləri yaddaşlarda qalıb.

Deyirlər ki, olacaq hadisələr bu kişiyə əvvəlcədən bəlli olurmuş, gözəgörünməz sirli qüvvələr ona baş verəcək olaylar haqqında xeyli əvvəl məlumat diktə edirmişlər. Lakin bu diktənin kim tərəfindən və necə olunduğu bəyə aydın olmurdu.

Cavan vaxtı bir dəfə tay-tuşları ilə harasa getməyə hazırlaşırlar. Atları minib yola düşmək istəyəndə həmin gözəgörünməz qüvvələr imkan vermir ki, Əbdüləhəd ata minsin. Yoldaşları təəccüblə ondan soruşurlar:

--Nəyi gözləyirsən? Niyə atına minmirsən?

O bilmir ki, nə cavab versin, düşdüyü vəziyyəti necə izah etsin? Əgər desə ki, məni ata minməyə qoymurlar, onun dəli olduğunu zənn edəcəklər. «Kim qoymur, necə qoymur?»--soruşacaqlar. Həqiqəti isə başa sala bilməyəcəkdi.

Yenə istədi ki, özünü zorlayıb kəhər atına minsin. Lakin əməlli-başlı ona mane oldular, qoymadılar, dedilər ki, olmaz!

Əbdüləhəd atın cilovu əlində mat-mat tay-tuşlarına baxmaqda davam edirdi.

Dostlarından biri ərkiyanalıq etdi:

--Nə oyun çıxarırsan? Bizi niyə ləngidirsən? Atına minsənə!

Nəhayət, Əbdüləhəd cavab verdi:

--Deyəsən, mən gedə bilməyəcəyəm.

Tay-tuşlarının təəccübü bir az da artdı:

--Necə gedə bilməyəcəksən? Məgər özün bu təşəbbüsü göstərməmisənmi? Dünəndən bu səfərə hazırlaşmırsanmı? Burax zarafatı, bizi ləngitmə.

--Zarafat-zad eləmirəm. Mən gedəsi olmadım.

Hamı sual dolu nəzərlərlə bir-birinin üzünə baxdı.

Yenə həmin dostu dilləndi:

--Birdən-birə sənə nə oldu? Tüfəngi götürmüsən, qatarı bağlamısan, xurcuna azuqəni yığmısan, özün də dünəndən qabağa düşmüsən ki, gedək, indi də getmirsən?

Belə şey ola bilməz axı! Sən sözünü dəyişən adam deyilsən. Denən bilək görək sənə nə olub? Niyə bir anın içində fikrindən daşındın?
--Heç nə bilmirəm. Onu bilirəm ki, artıq mən gedəsi olmadım.
Bunu deyib, Əbdüləhəd geri döndü, atın yüyənindən dartaraq evlərinə tərəf getməyə başladı.
Dostu səsini ucaltdı:
--Yaxşı, getmirsən getmə, barı səbəbini de.
Əbdüləhəd kişi geri qanrılıb cavab verdi:
--Bu gün orda nəsə bir bədbəxt hadisə baş verəcək. Siz də getməyin.
Bu sözləri özü demədi, ona dedirtdilər. Kimlər dedirtdi? Hardan bilsin ki?
Dostları daha heç nə soruşmadan hazırlaşdıqları səfərə Əbdüləhədsiz yola düşdülər. Onlar 6 nəfər idilər.
Əbdüləhədin isə öz halından özünün də belə başı çıxmırdı: «Bu nə işdir başıma gəlir? Məni belə işlərə vadar edən kimdir? Nə üçün istəmədiyim hərəkətlərə məni məcbur edirlər?»--deyə, düşünürdü. Lakin bu suallara heç bir cavab tapa bilmədi…
Gün axşama tərəf əyiləndə kəndi haray bürüdü. Səsə-küyə Əbdüləhəd də evdən bayıra çıxdı. Gördü ki, camaat fəryad çəkə-çəkə kənd yoluna tərəf qaçır. O da hövlənak camaata tərəf yüyürməyə başladı. Yaxınlaşdığı ilk adamdan həyacanla soruşdu:
-- Nə olub?
-- Deyəsən, ermənilər bizimkiləri öldürüblər.
Əbdüləhədin bədənindən üşütmə keçdi. İldırım sürətli bir fikir onu sarsıtdı: «Bunu mənə demişdilər.Amma imkan verməmişdilər ki, dostlarımın qabağını kəsim, onları getməyə qoymayım. Elə bil əlimi-qolumu, dilimi-ağzımı bağlamışdılar».
Kəndin kənarına çatanda məlum oldu ki, səhər-səhər yola düşən dostlara bir dərədə ermənilər qəfildən hücum ediblər. Onların beşini tutub işgəncə ilə öldürüblər, biri isə zorla qaçıb canını qurtarıb və kəndə özünü zorla çatdırıb.
Tanınmaz hala salınmış həmin meyidləri gətirib kənd qəbirstanlığında dəfn etmək üçün kənd camaatı çox əziyyət çəkdi…
Bir dəfə də Əbdüləhəd kənddən iki-üç saatlıq məsafədə bir bulağın üstündə süfrə açıb, nahar etmək istəyirdi. Əlini çörəyə uzadarkən həmin gözəgörünməz qüvvələr

onun qolundan tutub əlini geri çəkdilər və diktə etdilər ki, gözlə, Oğlun Ağəli də bura gəlir, onunla birlikdə nahar edərsən.
Əbdüləhəd yenə qalır mat-məəttəl. «Lənət şeytana!»- deyib, «bismillah»la əlini çörəyə yenidən uzatmaq istəyəndə ona fikrən acıqlanırlar: «Sənə demədik gözlə?!».
Əbdüləhəd çar-naçar əlini geri çəkib, gözləməyə başlayır. Xeyli keçir, heç kim gəlib çıxmır. O bir də istəyir ki, çörək götürüb yesin. Yenə mane olub «deyillər» ki, oğlun Ağəli də acdır, gəlir, onu gözlə.
Əbdüləhəd ayağa qalxıb bulağın yanındakı dikdirin üstünə çıxır və dörd tərəfə də diqqətlə baxmağa başlayır. Nə uzaqda, nə yaxında bir kimsənə görünmür. Kişi öz-özünə deyir: «Dəli oluram, nədir? Bunlar nə işdir başıma gəlir? Görəsən mənə bu fikirləri təlqim edən kimlərdir? Məleykələrmi, yoxsa?..» O, yenə ətrafı diqqətlə nəzərdən keçirir. Heç kimi görməyib dərin fikir içində bulağın üstünə qayıdır və narazı halda gözləməyə başlayır. Aradan xeyli keçir. Birdən addım səsləri eşitməyə başlayır. Yerindən dik sıçrayıb, səs gələn tərəfə yüyürür. Görür ki, oğlu Ağaəli uzaqdan gəlir. Kişi az qalır ki, havalansın. Ağəli ona çatıb salam verir və deyir:
-- Yeməyə bir şey varmı? Yaman acam.
Əbdüləhəd dinməz-söyləməz bayaqdan gözlədiyi oğlu ilə açıq süfrənin başında əyləşir, lakin əlini çörəyə uzatmağa qorxur. Ağəli yeməyə başlayanda o da yavaş-yavaş əlini süfrəyə uzadıb çörək götürür. Görür ki, daha heç kəs mane olmadı.
Bir dəfə də gecə qonşu kənddən evə qayıdırdı. Artıq qaranlıq düşmüşdü. Yolu meşənin lap yaxınlığından, kolun-kosun içində keçirdi. Dostugildən çıxmaq istəyəndə yenə onu naməlum qüvvələr məcbur etmişdilər ki, tüfəngi də al, özünlə götür, sənə lazım olacaq. Ha istəmişdi ki, onların «dediklərinə» qulaq asmasın, mümkün olmamışdı. Fikirləşmişdi ki, həmişə gedib-gəldiyim yaxın yoldur, nə gələsidir ki, yenə «bunlar» yaxasından əl çəkmir?! Lakin «onlar» dediklərinin üstündə durmuşlar. Nəhayət, məcbur qalıb, dostundan tüfəngi istəmiş və demişdi:
-- Sabah tezdən uşaqların biriynən göndərəcəyəm. Dostu heç bir söz demədən qoşalülə tüfəngini və patron dolu qatarını ona vermişdi.
İndi yolla tək-tənha, piyada öz kəndlərinə tərəf gedərkən fikirləşirdi: «Belə fikirləri söyləməklə mənə nəyi başa salmaq istəyirlər. Onsuz da özümü yerləri, göyləri yaradan tək bir olan Allahın qolu hesab edirəm. İnanıram ki, Rəbbim hər bir möcüzəyə qadirdir. Mən ona qorxu hissilə yox, idrakımla tapınmışam. Uşaq

yaşlarımdan «Qurani Kərimi», «Suliddin»i, «Firuddin»i qəbul edib, ulu Tanrıya itaətdə olmuşam. Bəlkə elə bunlara görə yaradanım məni qoruyur? Şükürlər olsun onun mərhəmətinə! Əlbəttə, özü bilən məsləhətdir. Nə eləyir, düz eləyir».

Artıq hava tamam qaralmışdı. Meşənin kənarına az qalırdı. Aralıdan kol-kosun qaraltısı zorla seçilirdi. Birdən ayağının altından bir dəstə çil qəfil parıltıyla havaya qalxdı. Səksəkəli olduğundan tullanıb geri sıçradı. Başının tükü qabardı. Bir xeyli özünə gələ bilmədi. Sonra: «Bismillah»- deyib, yoluna davam etdi. Külək əsməyə başlamışdı. Ətrafı sirli bir uğultu bürüməkdəydi. Əbdüləhəd meşənin açıq yamacının aşağısına çatanda yuxarı tərəfdən iri bir qaraltının sürətlə ona tərəf gəldiyi gördü. Tüfəngi çiynindən aşırana qədər həmin qaraltı onu haxladı. Əbdüləhəd yana sıçradı və... özünü havada uçurmuş kimi hiss elədi. Arxası üstə zərblə yerə dəyəndə yarğanın başından yıxıldığını başa düşdü. Həmin iri qaraltı da onu izləyirmiş kimi arxasınca tullandı, hələ də yerindən dura bilməyən Əbdüləhədin üstündən keçib, bir kola söykənib dayandı. Kişi elə yıxılı vəziyyətdə baxıb gördü ki, bu, iri və qurumuş bir «Yelqoxan»dır. Külək onu yumalandırırmış.

O, yerindən zorla ayağa qalxdı. Elə şiddətli bir ağrı hiss etmədi. Əyni qalın olduğundan ciddi zədələnməmişdi. Yarğanın aşağısı ilə hərlənib gedəcəyi cığıra çıxdı. Bir xeyli işıq gördü. Başa düşdü ki, bunlar canavar gözləridi.

***Çil—kəkliyəbənzər çöl quşu.**

***Yelqavan—iri, lakin çox yüngül bitgi.**

Qoşalülənin hər iki tətiyini birdən çəkdi.

Rəhmətlik atası ona canavarların xüsusiyyətlərindən danışmışdı. Bunların yalquzağı daha təhlükəli olur. Lakin çox vaxt sürü ilə gəzirlər. Kəndin örüşdə olan mal-qarasına tez-tez hücum çəkirlər. Yiyəsiz qalan atı, ulağı parçalayırlar. Onlar qoyun sürüsünə cumanda, bir anda onlarla davarı məhv edirlər. Əsasən qoyunların boğazından yapışıb hulqumlarını qoparır, iti dişlərilə gəmirir, qaldırıb yerə çırpır, o birisinə keçirlər. Beləcə bir canavar bir sürü qoyunun içərisinə düşəndə 10-15-ni öldürür. Elə vaxtlar olur ki, öldürdüyü qoyunlardan birini belinə atıb, qaçıb çıxıb gedir.

Bir dəfə Ağa kişinin atı gecə kövşəndə qalmışdı. Sabahısı gedib onun meyidini «Kiçik göl»ün ətrafında tapmışdılar. Canavar atın arxa hissəsini tamam parçalamışdı. Ovçular bilirdilər ki, canavar parçalayaraq qoyub getdiyi heyvanın ətindən yemək üçün həmin günü yox, yalnız üç gündən sonra qayıdır. Kəndin say-

seçmə ovçularından biri olan Əhməd aparıb atın leşinin ətrafına canavar tələləri düzmüş və gizlətmişdi. Yaz ağzı idi. Qar hələ ərimәmişdi. Səhərisi günü Əbdüləhəd də Əhmədlə bərabər tələləri yoxlamağa getmişdi. Uzaqdan  görmüşdülər ki, iri boz bir canavar tələyə düşüb çırpınır. Onları görən kimi, o ulamağa və daha ciddi cəhdlə ayağını tələdən xilas etməyə  çalışmağa başlamışdı. Bunun mümkün olmadığını başa düşən və tüfəngli ovçuların get-gedə yaxınlaşdığını görən boz qurd ilişən qabaq ayağını bilək qarışıq dişilə doğrayıb tələnin üstündə qoymuş və qanı süzülə-süzülə çıxıb getmişdi. Canavarlar nə qədər yırtıcı olsalar da, onlarda xüsusi bir məğrurluq və toxunulması mümkün olmayan mənlik də var. Ovçu kimi düşmənin əlində ölməkdənsə, biləyikəsik yaşamağı daha üstün bilən həmin boz qurdu sonralar naxırçı və çobanlar dəfələrlə görmüşlər…

Əbdüləhəd bəy canavar gözlərinin soyuq parıltısından üşənsə də, gözləməkdən başqa əlac görmürdü. Geri qayıdıb qaçmaq və ya irəli getmək ağılsızlıq olardı. Canavar sürüsü isə ona yaxınlaşırdı. Əbdüləhəd tüfəngi qaldırıb, ona lap yaxınlaşan bir cüt işığın ortasını nişan aldı və hər iki tətiyi birdən çəkdi. Tüfəngin səsi ətrafa lərzə saldı. Qarşısında iri bir canavar havaya qalxıb tükürpədici bir səs çıxardı və tappıltıyla yerə dəydi. İşıqlar bir anda yoxa çıxdılar. Uzaqdan güllə səsinə cavab verdilər. Əbdüləhəd səs gələn tərəfə qaçmağa başladı. Qaça-qaça tüfəngin gözünə patron qoyurdu. Bir azdan kəndə gedən qonşularına çatdı…

Səhərisi cavanlar ölü canavarı kəndə gətirdilər. Bu, yalan olmasın, kəl boyda boz bir qurd idi. Dərisini soydular ki, müqəvva düzəltsinlər.

…Əbdüləhəd  bəy özünü Arazın ağuşuna atanda yenə «gözəgörünməz qüvvələr» ona pıçıldamışdılar: «Qorxma, hələ ölümünün vaxtı deyil.

Səhərin şəfəqləri Ağrı dağının zirvəsinə nur çiləmişdi. Deyilənə görə, yer kürəsinin üzünü basan su geri çəkilərkən Nuh peyğəmbərin gəmisi bu dağın zirvəsinə çökmüş və orada qalmışdı. Əbdüləhəd  bəy özünə gələndə çayın kənarında  üzüquylu sərili idi. Ağzından Arazın lili suyu gəlirdi. Olanları xatırlamağa çalışdı. Lakin heç nə yadına duşmurdu. Yarısı suda olan bədənini zorla dartaraq quraqlığa çıxdı.  Xeyli öyüdü, qarnına dolan su qurtarmaq bilmirdi. Bir azdan öz kəndlərindəki bütün malını-mülkünü qoyub, ancaq canlarını necə götürüb qaçdıqlarını xatırladı. Qəfildən anladı ki, külfətini də itirib. Ürəyi sıxıldı, gözləri qaraldı, dünya başına fırlanmağa başladı. Acı bir qəhər boğazına tıxcandı…

## İKİNCİ ANA VƏTƏN

…Türkiyənin bir şəhəri var, adına İqdır deyirlər. Bu şəhər Ağrı dağının ətəyində salınıb, çox axar-baxarlı, məxsusi gözəllikləri olan bir məkandır, burada 1905-ci ildə və ondan sonra ermənilərin pərən-pərən saldığı çoxlu azəri türkü yaşayır. Bu mahalın Haqveyis adında bir kəndi də var. Ağrı dağının lap ətəyindədir. Qərbi Azərbaycandan baş götürüb canını qaçıran adamların yönü bu yerlərə düşmüşdü. Arazı salamat keçən kim varıydısa, tale onları İqdıra tərəf qovurdu.

Əbdüləhəd bəy zorla da olsa ayağa qalxdı. Əyin-başından su damcılaya-damcılaya Arazın sahili ilə üzüyuxarı addımlamağa başladı. Ailəsini tapmaq ümidilə hər tərəfi diqqətilə nəzərdən keçirirdi. Lakin heç kəs gözə dəymirdi. Nə qədər yol getdiyini bilmirdi. Hiss edirdi ki, taqətdən kəsilir, daha yeriyə bilmir. Buna baxmayaraq nigarançılıq onu irəli getməyə sövq edirdi. Ailə sevgisi, övlad məhəbbəti onu heç olmasa bir anlıq belə oturub dincəlməyə qoymurdu. Üzgün halda xeyli irəlilədi. Yenə ətrafı nəzərdən keçirirdi. Deyəsən, uzaqda qaraltılar vardı, gözlərini silib, bir daha diqqətlə baxdı. Bu qaraltılar adamlara oxşayırdı. İstədi onları çağırsın, boğazından xırıltılı bir səs çıxdı. Adamlar bu səsi eşidə bilməzdilər. Əllərini yuxarı qaldırıb yelləməyə başladı. Bu dəfə, deyəsən, onu gördülər. Dəstədən iki qaraltı ayrılıb ona tərəf gəlməyə başladı…

Əbdüləhəd bəy özünə gələndə ətrafında xeyli adam gördü. Gözləri doğmalarını axtardı. Görə bilməyib, yenə bulud kimi doldu. Ürəyi uçundu. Bəyin beş oğlu olub.—Ağaəli, Hüseyn, Ağamməd, Abbas, Heydər. Övladlarının içərisində Hüseynlə (Kəlba Hüseynlə) Abbas çox yaxın idilər—onlar həm qardaş, həm də möhkəm dostuydular.

Əbdüləhəd bəy oğlanlarını çox istəsə də, bunu hələm-hələm büruzə verməzdi. O zaman ağır kişilərin istəkləri ürəklərində gəzdirərdilər, açmazdılar. Bəy, ümumiyyətlə ailəcanlı idi.

Əbdüləhəd bəy ətrafımızdakılardan üzgün-üzgün soruşdu.

-- Bəlkə Oba kəndindən kimisə görmüsünüz?

Adamlar biri-birlərinin üzlərinə baxdılar. Arxa tərəfdən bir kişi dilləndi:

-- O tayda olanda, deyəsən, həmin kəndin adını bir dəstə adam çəkirdi. Hərdən də «Əbdüləhəd bəy» deyirdilər. Ermənilər yaxınlaşanda onlar da özlərinə Araza atdılar. Sonrasından xəbərim yoxdur.

Bəyin gözlərində bir ümib işığı közərdi, fikirləşdi: «Deməli, erməni əlinə keçməyiblər. Şükür sənin böyüklüyünə, Xudaya!».
Sonra öz-özünə dedi: «Kaş balalarımı tapam! Bir çörəyə möhtac, lap it damında yaşamağa razı olaram. Allahım, özün mənə kömək ol!»
Hamı acından üzülmüşdü. Üzlərdə, gözlərdə elə bir kədər, elə bir hüzn varıydı ki, adamlar biri-birilərini danışdırmağa qorxurdular.
Əbdüləhəd bəyin üsi-başı qurumuşdu. O dəstəylə sağollaşıb ailəsini axtarmağa getdi.
Ermənilərin əlindən canlarını qaçıb xilas etmiş adamlar hər tərəfə səpələnmişdilər. Ev-eşiklərindən heç nə götürə bilməmişdilər. Hər kəs ancaq özünün harayında qalmışdı. Əliboş ac-yalavac, qorxu və səksəkə içində Araz çayına tərəf üz tutan millətin əksəriyyətini erməni quldurları qətlə yetirmiş, bir çoxu Arazdan boğulmuşdu.
Əbdüləhəd bəy soraqlaya-soraqlaya Arazın qırağıynan gah aşağı, gah yuxarı gedirdi. Birdən kimsə onu səslədi:
--Bəy!...
Əbdüləhəd bəy səksənib geri çevrildi. Həmkəndlisi Allahverdini görəndə elə bil dünyanı ona bağışladılar. Hər ikisi biri-birinə tərəf qaçaraq qucaqlaşdılar. Allahverdi ağladı. Bəy xeyli susandan sonra soruşdu:
-- Adamlarımızdan nə xəbər var?
-- Bəy, deyirlər ki, ermənilər çoxunu elə kəndin içində qırıb. Sağ qalan azdır. Onlar da pərən-pərən düşüblər.
Birdən Məhəmməd nəyisə xatırlayırmış kimi ani olaraq düşündü və bəyə dedi:
-- Bir az əvvəl sakinləri çayın qırağında gördüm. Səni axtarırdılar.

Bəyin vücudu silkələndi, varlığından şimşək çaxdı, qollarını açıb Məhəmmədi qucaqladı, göz yaşları içində onun üz-gözünü duz kimi yaladı. Sonra Allahverdiylə birlikdə onun dediyi səmtə yollandılar.


*Dədəcan Abbas*

Uzaqdan ailəsini görəndə Əbdüləhəd bəyin hansı halları keçirdiyini yalnız bu faciəni yaşayan kişilər bilər.

Onlar yüz ilin həsrətlisi kimi görüşdülər.

İkinci ana Vətən

Əbdüləhəd bəy öz ailəsilə İqdırın Haqveyis kəndinə gəlib çıxa bildi. Bu müddət ərzində onlar hansı əzablara düçar oldular, hansı zülümləri çəkdilər onu bir Allah bilir.

Türk qardaşlarının əvəzsiz köməyilə o taydan bura pənah gətirən bütün azəri türkləri yavaş-yavaş özlərinə gəlməyə başladılar. Haqveyisdə, İqdıra, ümumiyyətlə, bütün Türkiyədə Azərbaycandan didərgin düşən adamlar o qədər yüksək səmimiyyət, isti münasibət və qayğı gördülər ki, heç doğma ellərində belə olmamışdı. Ona görə də günü-gündən yaraları qaysaqlamağa başlayır, ağrılar, acılar səngiyirdi. Evlərdə hamıya sığınacaq verilir, çörəklər yarı bölünür, əyin-baş düzəldilir, iş-güc tapılırdı. Bütün bunlar soykökləri bir olan iki qanqardaşlarının biri-birinə olan sevgisinin məntiqi nəticəsi və əməli təzahürü idi.

Lakin yaşanmış faciələr, sarsıntılar və çəkilən əzablar vətən həsrətinə qarışıb Əbdüləhəd bəyi xəstə saldı. Öləcəyini sirli qüvvələr ona bildirdilər. Ölənə yaxın övladlarını başına yığıb, öz vəsiyyətini eləyib:

-- Mən bu dünyadan köçürəm, qalanlara salam olsun deyərək, hamıyla bir-bir görüşüb, tənqidini verib və Quran oxuya-oxuya dünyasını dəyişib.
Deyirlər ki, bu günkü gündə də cümə axşamları Əbdüləhəd bəyin qəbrində qeyibdən şam yanır və gecələr ora işıq olur.
İllər ötür. İqdır mahalı və bütövlükdə Türkiyə Əbdüləhəd bəyin nəsil-kökünün ikinci ana Vətəni olur.
Bəyin beş övladlarından ana ayrı idi. O, Ağrı dağının ətəyində yerləşən Daşlıçay rayonunda yaşayıb. Orada bəyin

ikinci oğlu Kəlba Hüseyn qalayçılıq edirdi. Birinci oğlu Ağaəli isə savadlı molla idi. Ağamməd rəhbərçiliklə məşğul olurdu. Ümumiyyətlə, qardaşların hamısının torpaq sahələri vardı. Əkib-becərir, güzəranlıq edirdilər.
Kəlba Hüseynlə «Dədəcan Abbas»ın yaxın dost olmaları hamıya məlum idi.
Abbas bəyə «Dədəcan» ləqəbinin qoyulmasının öz səbəbi vardı.
Abbas bəy də öz atası Əbdüləhəd bəy kimi el arasında böyük hörmət-izzət qazanmışdı, onu bir nüfuzlu adam kimi hamı sayırdı. Bəyin bir şakəri vardı. Kim ondan nəsə soruşsa: «Buyur, dədə can»--deyirdi. Kimdənsə söz soruşsanda «Dədə can»-- deyə müraciət edərdi. Buna görə də onun adını el arasında «Dədəcan Abbas» qoymuşdular və bu «Dədə» sözünün özündə də bir müdriklik, bir sanbal yatırdı. Hər adama «Dədə» deməzlər, axı.

**QARA BAXŞI**

Türkiyədə Tuzlucanın Əkərən köyündə «Qara Baxşı» deyilən, adı əslində Baxşəli olan bir ərən kişinin qızı Dilbərin gözəlliyi haqqında söz-söhbət ətraf köylərdə də yayılmışdı. O, dul xanım-xatun gəlin idi. Atası «Qara Baxşı»nın qorxusundan heç kəs ona nəinki söz deyə bilməzdi, heç düzəməlli baxa da bilməzdi. Əri ölmüşdü. Çox cavanlar kişilər onunla evlənmək istəyirdilər. Di gəl ki, «Qara Baxşı»nın zəhmi hamını bu sevdadan çəkindirirdi.
«Qara Baxşı» azəri türklərinin havadarı haqlarını müdafiə edən, onlara dayaq olan qorxmaz bir igidiydi. Haqsızlıq, ədalətsizlik göstərən adamlar onun yanına şikayətə gəlirdilər. «Qara Baxşı»nın hər yerdə sözü keçirdi.
Nahaq iş tutanlara qarşı amansız olurdu.

«Dədəcan  Abbas» həyat yoldaşı Sonanı itirdikdən sonra çox pis hala düşmüşdü. Gecə-gündüz fikir, dərd-qəm içində çırpınırdı. Onu Sona ilə qardaşı Kəlba Hüseyn evləndirsə də, sonradan güclü bir istək yaranmış, pozulmaz bir səmimiyyət əmələ gəlmişdi ki, bu qırılmaz tellərə heç kimin və heç nəyin gücü çatası deyildi. Abbas bəy bilirdi ki, el arasındakı hörmət izzət qazanmaq da elə ailədən başlayır. Həm də birincisi, gərək özün-gzünə qoyasan ki, qalanlar da bundan dərs götürə.

Bu hörmət «mənəm-mənəmlik» iddiası olmalı deyil, sadəcə özünə izzətlə yanaşmadır. Əks-halda olub-qalan nüfuzun da itib gedər. Abbas bəy özünə hər yerdə hörmət gətirə bilən ağıllı bir adam idi. Baxmayaraq ki, yoldaşı Sonanı qardaşı Kəlba Hüseyn ona almışdı, Abbas bu gözəl qadını gözəl xasiyyətlərinə görə çox istəyirdi.

Abbas bəyin Sonadan üç qızı, bir oğlu olmuşdu. Böyük qızı Gülçin hal-hazırda İstanbulda yaşayır, övladları var. İkinci qızı Şeyran isə uşağı olmadığına görə daha ailə qurmayıb, kiçik bacısı Ceyranla birlikdə yaşayır. Oğlu Abdulla Türkiyənin polis təşkilatından əməklidir, 30 il bu təşkilatda xidmət edəndən sonra təqaüdə çıxıb. Hazırda İstanbulda, Bursa şəhərində yaşayır. Əmir İqdır şəhərində ali məktəbdə oxuyur.

İqdır Ağru dağının ətəyində, düzənlikdə yerləşən qədim və gözəl bir aran rayonudur. Əhalisi pambıqçılıqla və şəkər qamış əkib-becərməklə məşğul olur. Burada bağçılıq, bostançılıq önəmli sahələrdən sayılır. Alma və ərik (qaysı) bol olur. Haqveyiş kəndində deyirlər ki, Çernobıl Atom Elektrik Stansiyasında qəza baş verənə qədər burada soğan əkərdilər. Məhsul çətinliklə başa gələrdi. Çünki burada bulaq yoxdur, su çəkiblər. İqdır şəhəri və onun Haqveyis kəndi Araz çayına yaxındır.

Abbas bəy yatsaydı belə bundan sonra evlənmək ağlına gəlməzdi. Çüki Sonadan sonra kiməsə isinəcəyinə inanmırdı. Ona görə də başını aşağı salıb öz qayğıları ilə məşğul idi və özünə qalsaydı ömrünün sonuna qədər evlənməyəcəkdi. Lakin atalar demiş: «Sən saydığını say, gör fələk nə sayır».

Kəlba Hüseyn Dilbəri görmüşdü, onun gözəlliyi, xanım-xatınlığı xoşuna gəlmişdi və qardaşı Abbas haqqında düşünmüşdü. O, hər dəfə qardaşının dərdli, kədərli halını görəndə üzülmüşdü, sarsılmışdı. Bilirdi ki, Abbasın bütün günü göz yaşları içində

keçir, lakin o yaşlar görünmür, çünki ürəyində ağlayır, içinə yaş axıdır, hamıdan gizlin gecə-gündüz beləcə yaşayırdı «Dədəcan Abbas».
Kəlba Hüseyn «Qara Baxşı»yla ehtiyatlı davranmağının gərəkli olduğunun bildiyindən Dilbər və qardaşı Abbas haqqında ona hələ ki, bir söz demirdi. Günlər axıb gedirdi…
Biz müsəlmanlar Allahdan sonra böyüklərə yüksək hörmət ruhunda tərbiyə almışıq. Bu tərbiyəni bizə «Qurani-Kərim» və öz milli mantalitetimiz təlqin edib. Ağsaqqal öyüdü, ağsaqqal tövsiyəsi Tanrı buyruğuna bərabər tutulur. Buna görə də tərbiyəli cavanlar ağsaqqal-ağbirçəklərimizin bir sözülə ölümə getməyə hazır olublar. Bu əxlaqdandır. Ata-ananın sözü bütün övladlar üçün, böyük qardaşın sözü isə ondan kiçiklər üçün həmişə qanun olub. Baxmayaraq ki, o söz sənin ürəyincədir, ya yox.
Bir dəfə Kəlba Hüseyn qardaşı Abbasa dedi:
--Nə çox fikirləşirsən? Dünyanın gərdişini bilmirsənmi? Əzəldən belədir—gələn gəlir, gedən də gedir. Bu gediş-gəlişin qarşısını kim kəsə bilər ki? Özünü az üz. Həyat fəlsəfəsini dərk eləmək üçün alim olmaq lazım gəlmir. Elə olub-keçənləri ağlına gətirsən, bəsdir.
Abbas bəy dinməz-söyləməz qardaşına qulaq asırdı. Fikrində isə dünya haqqında hansısa şairin yazdığı bir şerin misraları çırpınırdı.

***Beşikdən gorədək ani möhlətdi—***
***Bir kiprik çalımı mürgüdür dünya.***
***Soyuqdan donana qardı, borandı,***
***İstidən yanana bürküdür dünya.***

***Tac olan başlardan çələng kimidi,***
***Gah iblis, gah da ki, mələk kimidi.***
***Pələng nəzərində pələng kimidi,***
***Tülkü nəzərində tülküdür dünya.***

***Kiminin bəxtində kədər selidir.***
***Kiminə dövlətin gəlhagəlidir.***
***Səylərin gözündə səydir, dəlidir,***
***Ağlı olanlara ülgüdür dünya.***

***Gah körpə quzudur, gah qoca qurddur,***
***Gah ağlatdı bizi, gah da ovutdu.***
***Gedənə əbədi yuvadır, yurddur,***
***Qalana məşhərin görküdür dünya.***

***Sevgisi-güllərdə, hirsi-sellərdə,***
***Ağ zədəyə dönər qara tellərdə.***
***Bəşər yorğun düşüb bu get-gəllərdə,***
***Ömür karvanına körpüdür dünya.***

***Yananla alışıb, sönənlə sönüb,***
***Qalxanla ucalıb, enənlə enib.***
***Nə qədər var olan torpağa dönüb!—***
***Varlıqdan hörülən hörgüdür dünya.***

***Alovdur bir qatı, sudur bir qatı,***
***Bir anda dəyişir dəli ovqatı.***
***Həyatla ölümdür «payı», «sovqatı»,***
***Taleyin zamandan yüküdür dünya.***

***Birinə nəğmədir, birinə ağı,***
***Həm eşq aləmidir, həm də göz dağı.***
***Yalın ayaqların qançır barmağı,***
***İsti əyinlərin kürküdür dünya.***

Qardaşı Kəlbə Hüseynin səsi onu xəyaldan ayırdı.

-- Nə dərin fikrə getmisən?

-- Heç. Bu fani dünyanı fikirləşirdim.

-- Dünyanın nəyini fikirləşəcəksən? Min illərdi necədir, elə indi də o cürdür.

Kəlbala Hüseyn bir az ara verib dedi.

-- Abbas bəlkə evlənəsən?

Abbas narazılıqla qardaşının üzünə baxdı.

Kəlba Hüseyn onun könlünü almağa çalışdı.
-- Bilirəm, Sonadan sonra evlənmək sənin üçün çox ağırdır. Amma … Ölənlə ölmək olmur, axı!
-- Hüseyn, bilirsən ki, ölümə göndərsən.  Abbas tutuldu.
-- Yaxşı, yaxşı…  Xətrinə dəymək üçün demədim, sözgəlişi dedim, evlənmirsən evlənmə.
İki qardaş arasında olan evlənmək söhbəti bununla da bitdi.
Yenə günlər öz axarı ilə ötüb-keçirdi…
Dilbər xanım «Dədəcan Abbas» haqqında eşitmişdi. Onun namuslu, sədaqətli, qeyrətli zəhmətkeş, halal və hörmətli bir adam olduğunu bilirdi. Sonralar bir neçə dəfə özünü də uzaqdan görmüşdü. Lakin atasının qorxusundan ərə getmək haqqında düşünmədiyinə görə Abbasla nə vaxtsa ailə qura biləcəyini də ağlına gətirmirdi.
Dilbərin atası «qara Baxşı»nı qızının taleyi ciddi düşündürürdü. Cavan-cavan dul qalmış, «bir üzü qız, bir üzü gəlin». Dilbər atasına ağır dərd idi. O istəyirdi ki, ilk izdivacda bəxti gətirməyən balasının öz ailəsi, öz oğul-uşağı, öz evi-eşiyi olsun. Bu nisginlini kiməsə bildirməyi özünə sığışdırmırdı. Çünki o, məğrur və vüqarlı bir adam çalışır, onunla çox mehriban davranırdı ki, birdən könlünə toxunar. Amma kədəri kədər kimi qalırdı.
Kəlba Hüseyn qardaşı Abbasın xiffət çəkdiyini, günü-gündən əridiyini görürdü. Fikirləşirdi. «Sonanın dərdi Abbası öldürəcək. Buna bir əncam çəkmək lazımdır».
Kəlba Hüseyn Dilbəri qardaşına qaçırmağı haqqında qəti fikrə gəlmişdi. Bu fikri Abbasa belə bildirmirdi. Başa düşürdü ki, bildirsə belə Abbas onunla razılaşmayacaqdı. Ona görə də bu işi xəlvət görmək istəyirdi. O, Dilbəri qaçırdandan sonra Abbası yola gətirəcəyinə inanırdı. Çünki qardaşı indiyədək onun bir sözünü iki eləməyib.
… Axşam toranlığı düşmüşdü. Dünya Ayın işığını gözləyirdi ki, bir az yuyunsun, bir az da içsin. Ay bunu bildiyindən özünü təmkinli aparırdı, hələ görünmürdü. Səmadakı qara buludlar nəhəng qara kölgələr tək karvanlanıb. Günbatana doğru yol tutmuşdu. Uzaqdan gələn it səsi bayaqdan bəri  kirimək bilməyən sərçələrin civiltisinə qarışıb, əsəblərə toxunurdu. Ağaclar qaranlıq topalarına oxşayırdılar. Adi meh belə əsmirdi. Sirli bir Aləm yaratmışdı bu axşamın toranlığı. Ətrafa hopan

qeyri-adilik nəyinsə olacağından xəbər verirdi sanki. Elə bil axşam gizli bir iş görməyə hazırlaşmışdı.
Kəlba Hüseyn «Qara Baxşı»nın evinin həndəvərində marıqda durmuşdu, hər tərəfi bayaqdan diqqətlə nəzərdən keçirirdi. O, Dilbərin evdən bayıra çıxmasını qibtə olunacaq bir səbrlə gözləyirdi. Dilbər isə çölə çıxmırdı ki, çıxmırdı.
Kəlba Hüseyn Dilbərin razılığını almaq üçün «dəridən-qabıqdan çıxmış», yüz vasitəyə əl atmışdı. O belə fikirləşirdi ki, əgər qardaşı «Dədəcan Abbas»ı evləndirə bilsə, onun dərdi-səri, qayğıları xeyli azalar. Çünki evdə qadın nəfəsi çox şey deməkdir.
Kəbla Hüseyn Dilbərin ən mərhəm olduğu qadınları onun üsitünə göndərmiş, ürəyini yumşaltmağa çalışmışdı. Lakin Dilbər atası «qara Baxşı»nın qorxusundan «hə» deyə bilməmişdi. Nəhayət, qoşulub-qaçmaq təklifinə «nə bilim, vallah!»--demişdi. Kəlba Hüseynə də elə bu lazım idi.
Kəlba Hüseyn həmin gündən girəvə gəzirdi ki, Dilbəri qardaşı Abbasa qaçırsın. Fikirləşmişdi ki, «Qara Baxşı»nı sonra yola gətirmək olar. Beş-on ağsaqqalla yanına gedib, ürəyini almaq olar. Demək olar ki, Dilbər kimi gözəl bir gəlin ömrünün axırına kimi onun dizinin yanını kəsdirib oturası deyildi ha! Gec-tez o da bir ailə sahibi olmalıdır, ya yox?
Dilbər bu axşam toranında evlərinin yanına çıxmalı idi. Lakin Kəlba Hüseyn ha gözlədi, o, gəlmədi. Fikirləşdi ki, yəqin atasından fürsət tapa bilməyib.
Gecə yarıdan keçdi. Kəlba Hüseyn dilxor halda evlərinə tərəf yön tutdu. Uzaqda bir it uladı. Qövsə oxşayan ayın işığının karvanlaşan buludlar tez-tez udurdu. Sanki ay gecəynən oyun oynayırdı…
* * *
Abbas arğın-yorğun evinə dönəndə qapının ağzında qardaşı Kəlba Hüseynlə üz-üzə gəldi. Sorğu dolu nəzərlərlə qardaşının gözlərinin içinə baxdı.
Kəlba Hüseyn
--Keç içəri!—dedi.
Abbas dinməz-söyləməz evə keçdi və …gözlərinə inanmadı. Otağın künc tərəfində başını aşağı dikmiş bir qadın oturmuşdu. Yenə sorğulu gözlərini qardaşına zillədi.
--«Qara Baxşı»nın qızı Dilbərdi—dedi.
--Hüseyn…

--Artıq sözə gərək yoxdur. Belə məsləhətdir.
Abbas daha neyləyə bilərdi ki? Ürəyində qardaşını yamanlasa da, dilinə bir kəlmə də söz gətirə bilmədi. Sonanın xəyalı kipriklərindən asıldı. Oba kəndində qalan qəbri gözləri önünə gəldi. Ürəyi göynədi. Onun ruhu qarşısında xəcalət çəkdi. Bayıra çıxdı. Kəlba Hüseyn də onun arxasınca gəldi
--Abbas, uşaqlıq eləmə—dedi və çıxıb getdi.
O, «Qara Baxşı»yla məsələni necə həll edəcəyini düşünürdü.
Elə həmin axşam Haqveyisin beş nəfər hörmətli ağsaqqalı ilə «Qara Baxşı»nın evinə getdi və birinci sözə də özü başladı.
-- Baxşeyiş, sənin necə bir qeyrətli kişi olduğun bütün tuzlucalılara bəllidir. Səninlə qohum olmağı mən öz nəslimə-kökümə şərəf bilirəm. «Yox» deyəcəyindən ehtiyatlanıb Dilbəri özüm apardım. Ağıllı, dünyagörmüş adamsan. Sənin ayağına təvəqqiyə və barışığa gəlmişik. Bizi camaat içində xar eləmə.
«Qara Baxşı» başını ayağı salıb dinmirdi. Ağsaqqallar da xeyli məsləhət verdilər.
-- Abbas qoçaq, mərd və halal bir adamdır. Elə sənin ailənə yaraşan qohumdur. Onsuz da Dilbəri gec-tez birinə ərə verəcəkdin. Taleyin yazısı buymuş. Qızına xeyir-dua ver.
«Qara Baxşı» ağır-ağır dilləndi.
-- Mənim qızımı qaçırmaq hər adamın işi deyildi, Kəlba Hüseyn. Sən fikirləşdiyin kimi də deyil. Adam bir əvvəlcədən xəbər-ətər eyləyirdi, ağız ağız ağrıyardı əgər razı olmasaydım…
Baxşeyiş xeyli susdu. Yenə başını qaldırmadan sözünə davam etdi.
-- Əgər indi gəlməsəydiniz, bu gecə qan tökülməyəcəkdi…
Ağsaqqallar xeyli dəlil-dəlaət etsələr də, «Qara Baxşı»nın nə «hə»yini, nə «yox»unu eşitdilər. Sonda dedi.
-- Kəlba Hüseyn, yaxşı ki, hörmətlərini uca tutduğum bu el ağsaqqallarıynan gəlmisən!.
Bundan sonra Kəlba Hüseyngil ayağa qalxıb sağollaşdılar.

## İKİNCİ AİLƏ

Abbasın Dilbərdən iki qızı oldu, lakin yaşamadılar. Sonradan isə indi qan içində ölümlə çırpınan İsmayıl anadan oldu və onun taleyinə Azərbaycanın əzəli və qədimi yurdu olan Dağlıq Qarabağın müdafiəsi uğrunda mənfur erməni quldurları ilə

vuruşmaq yazıldı. Bu vuruş, bu cihad müqəddəs mübarizə idi, doğma dədə-baba torpaqlarına təcavüz edən nankor və xain düşmənlərlə savaş idi. Lakin hələ bu ölüm anına çox vardı və İsmayıl da digər tay-tuşları kimi öz bakirə, saf və qayğısı körpəlik dünyasında ağ günlərini yaşayırdı. Hardan biləydi ki, onun baxtına çox ağrılı-acılı məqamlar yazılıb?! 12 yaşı varıydı. Atası «Dədəcan Abbas» və anası Dilbər türklərin adi həyat tərzini yaşayırdılar.

İsmayıl anasını bütün varlığı qədər sevirdi. Bu istək sadəcə anaya məhəbbət deyildi, burada qeyri adi bir səmimiyyət, müqəddəs bir sevgi vardı. Anası dilbər də öz həyatını İsmayıla məhəbbətdə tapmışdı. Sanki onun bundan sonrakı ömür dünyası yalnız oğlundan asılı idi. O, İsmayılla nəfəs alırdı. Atası öz torpaqlarında işləmək üçün sübh tezdən evdən çıxıb axşam qayıdana qədər ana-bala bir yerdə olur, ev-eşikdə iş görürdülər.

Son zamanlar anası Dilbərin tez-tez mədəsi ağrayırdı. O, Allahın mömin bəndəsi olduğundan oruc tutardı.

Bir gün Abbas onu həkimə apardı. Həkim müayinə edəndən sonra məsləhət bildi ki, oruc tutmasın, az-az lakin tez-tez yemək yesin və müxtəlif illaclar yazıb verdi. Lakin oruc Dilbərin yaşam tərzi idi. O, oruc tutmadan yaşaya biləcəyinə inanmırdı.

İsmayılın 12-13 yaşı olardı. Bir gecə anası Dilbərin yenə də mədə ağrıları tutdu. O, nə ərinə nə nə oğluna bunu hiss etdirmədi. İstəmirdi ki, onları narahat etsin. Səhər açılana qədər Dilbər ağrıların əlində çırpındı. Orucluq günləri idi.

Dilbər ki, Yaradan öz əziz bəndələrini müqəddəs günlərdə əbədi dünyaya aparır. Belə şərəfə nail olanlar Allahın yaxınlarıdır.

Dilbər sübh tezdən ağrılardan qıvrıla-qıvrıla yerindən qalxdı. Obaşdanlıq yeməyi üçün hazırlıq görməyə başladı.




İsmayılın dediklərindən.

***Bir orucluq günü idi. Anam atamla bir yerdə obaşdanlıq çörəyi yedilər, bundan sonra hava işıqlandı, atam çıxdı getdi öz torpağında işləməyə. Gördüm ki, anam tez-tez çölə çıxıb, içəri girir.***

***Bir azdan qaytarmağa başladı. Soruşdum.***

***-- Ana, nə olub?***

***Dedi.***

***-- Mən qaytarıram. Bilmirəm orucluğum batil olacaqmı?***

***Allahını idrakla sevən və ona tapınan bir insan olduğundan ən ağır anında da öz həyatından yox, günah işlədəcəyindən qorxurdu.***

***Dedim.***

***-- Axı, həkim sənə demişdi ki, oruc tutma, mədən xəstədi.***

***O mənə heç bir cavab vermədi. Gedib öz yatağında uzandı.***

***Bir də baxanda gördüm ki, anam yatağından yerə yıxılıb. Onu bir təhər yatağına qaldırdım.***

***Atam gələndən sonra anamı Ərzuruma xəstəxanaya götürdülər.***

***Həzrəti məhəmməd salavatullah deyib ki, cənnət anaların ayaqları altındadır.***

***Anamın başına bir iş gələcəyini düşünəndə uşaq bədənimdən bir sızıltı keçirdi. Özümü anamsız və atamsız təsəvvür edə bilməzdim. Anam mənim qibləm, atam səcdəgahım idi.***

Havadan havasızlıq asılmışdı. Ciyər dolusu nəfəs almaq olmurdu. Boğulurdu Dilbər. Bu dünyadan nigaran gedəndə ya ölüm səni qəbul etmək istəmir, ya da özün ölmək istəmirsən. Qəfil ölümə nə var ki?!

Dilbər üçün İsmayılı kiminsə ümidinə qoymaq dəhşət idi. Ona elə gəlirdi ki, İsmayıl onsuz yaşaya bilməz. Buna görə də ölümlə çarpışırdı. Üç gün idi ki, nə İsmayılın, nə də atasının kiprikləri biri-birinə qovuşmamışdı. Üç gün idi ki, İsmayıla bir tikə çörək yedirə bilmirdilər. Üç gün idi ki, Dilbər özündə deyildi. Onun təzyiqi həddindən çox yüksəlmiş, damarları partlamış və beyninə qan sızmışdır ki, buna da «beyin qanaması» deyirlər.

Qayım-qədim dünyada cəmi 50 il yaşamış bu xanım-xatın qadını əcəl yaman pis yerdə haqlamışdı.

**50 yaş—dünyada gül açan bahar,**
**50 yaş—həyatın təzəcə dərki.**
**Əgər ki, bu yaşda getsə adamlar,**
**Dünyanın yarısı köçüb gedər ki!..**

Dünyanı tərk edib getmək istəmirdi. Ona görə ki, qayğıları çox idi. Ondan sonra İ smayılın taleyi necə olacaqdı?! Əri Abbas necə dolanacaqdı?

…Dilbərin qarşısında qara bir tunel açıldı. Bu tunellə xeyli uçduqdan sonra bəyaz işığa qərq olmuş bir yerə çatdı. Hər yan gözəlliknən doluydu. Ömründə özünü bu qədər rahat hiss etməmişdi. Bədəni sonuncu dəfə çırpındı. Üzündə işıq yarandı və…

Həkimlər bayıra çıxıb, «Dədəcan Abbas»a hüznlə baxdılar. Abbasın ürəyi əsdi, rəngi saraldı.

İsmayıl dizlərini qucaqlayıb, belibükülü halda hönkürürdü. O, həm anasını, həm də özünü ağlayırdı…

Tanrı buyurub ki, mən insanı bu fani dünyaya yalnız zülüm çəkmək üçün gətirmişəm.

İsmayıl isə lap uşaq yaşlarından bu zülmün-zillətin dadını daddı.

Sona öləndə də Abbas beləcə sarsılmışdı. Atası Əbdüləhəd bəy Oba kəndindən Türkiyənin İqdır mahalına yön tutub Arazı keçərkən biri –birilərini itirəndə də belə sarsılmışdı. İndi də eləydi.

Allah Türk dövlətinin bayrağını uca eləsin! Onlara qucaq açdı. Öz övladları kimi qayğılarına qaldı, hüquqlarını qorudu, qəriblik çəkməyə qoymadı. Qardaş belə olar da, ayrı nə cür olmalıdır ki?!

Bir azəri türkü türk qardaşının yuvasına sığınmışdı. Qərbi Azərbaycandan təzə köçkünlük düşən vaxtlar idi. Onu ağır bir xəstəlik tapdı. Türkün özü, arvadı və qızı gecə-gündüz azəri türkünün qulluğunda dayandılar, növbə ilə keşiyini çəkdilər, altını-üstünü dəyişdilər. 45 gün yataqdan dura bilmədi o zavallı. Heç öz doğmaları ona belə cani-dildən qulluq göstərə bilməzdi. Xəstə, nəhayət, üzü bəri düşdü. Belə də olmalıydı. O cür qayğının qarşısında, atalar demiş «Ölü də dirilərmi».

Azəri türkünün xəstəlik xəbərini eşidən, lakin o sağalandan sonra yığılıb gələn qohum-əqrabası əziyyət çəkdiklərinə görə türkə, onun həyat yoldaşına və qızına xeyli dil-ağız edirlər, minnətdarlıqlarını bildirirlər. Lakin sağalan xəstə heç dinib-danışmadı. Qohumlar bir də minnətdarlıq edəndə türk dedi

--Xahiş edirəm, bir az da məni eşidin. Siz gələndən təşəkkür edirsiniz, iltifat göstərirsiniz, dil boğaza qoymursunuz, amma qulluğunda durduğumuz bu dostum heç bir «sağ ol!» da demir, axı.

Azəri türkü sakitcə dillənir

--Qardaşım, bu sənin borcun idi.

Bu ibrətamiz misaldan da görünür ki, türklərlə azəri türkləri arasında heç bir fərq yoxdur, nə qədər yüksək səmimiyyət, nə qədər doğmalıq var. Bizim soyumuz da, kökümüz də birdir, biz bir millətik. Dar günlərdə həmişə türklər öz qardaşlarının köməyinə çatıblar, onları bəlalardan xilas ediblər. Özləri şəhid olublar, amma qan qardaşlarını ağır fəlakətlərdən qurtarıblar. Zaman-zaman belə olub. Tarixin səhifələrində bu qardaşlığın təməlini isbatlayan təkzib edilməz dəlillər qalmaqdadır.

**TARİXİ GERÇƏKLİKLƏR**

Azərbaycan xalqı 1918-ci ilin mart-aprel aylarında dinc əhalinin qanlı soyqırım hadisələrini heç vaxt unutmayacaq. 1918-ci ilin mart hadisələrinin təşkilatçısı və icraçıları erməni millətçiləri, Daşnaksütyun partiyası və onun terrorçu birləşmələri, eləcə də əksəriyyəti erməni və slavyan millətlərin nümayəndələrindən təşkil olunmuş Bakı Kommunasının bolşevikləri idilər. Mart soyqırımını qabaqcadan planlaşdıran bolşevik-daşnak güruhu belə bir şayiə yaymışdı ki, guya Bakıda müsəlmanlar Osmanlı sultanının himayəsi ilə silahlı üsyan hazırlayırlar. Odur ki, Bakıda yaşayan ermənilər 1918-ci ilin əvvəlində Cənubi Qafqaz cəbhəsindən çıxarılmış rus əsgərlərinin silah və sursatlarilə təchiz olunurdular. Müxtəlif cəbhələrdən bolşeviklərin razılığı ilə bir neçə min erməni əsgəri də gətirilib Bakıda

yerləşdirilmişdi. Vəziyyətin ağırlığını hiss edən müsəlman siyasi xadimləri qanlı qırğının qarşısını ala bilmək üçün qüvvələri səfərbər edə bilmədilər. Hələ mart hadisələrinin yarım il əvvəl Bakı Sovetinə keçirilmiş seçkilərdə «Müsavat» partiyası bolşeviklərdən iki dəfə çox səs qazanmağa müvəffəq olmuşdu. Bu, bolşevikləri çox narahat edirdi və onlar müstəqil milli dövlətin yaradılmasına imkan vermək istəmirdilər. Buna görə də soyqırım təşkilatçılarının əsas məqsədi get-gedə siyasi nüfuzu artmaqda olan «Müsavat» partiyasını məhv etmək, Azərbaycanın müstəqilliyi ideyalarına, milli-demokratik qüvvələrə ağır zərbə vurmaq idi.

Milli qırğına başlamaq üçün bəhanə isə martın 24-də şəxsi heyyəti müsəlmanlardan ibarət olan «Evelina» gəmisinin bolşevik-daşnaklar tərəfindən tərk-silah edilməsi oldu. Azərbaycanlılar yaşayan məhəllələrin əhalisi buna qarşı ciddi etiraz edərək, müsadirə olunmuş silahların geri qaytarılmasını tələb etdilər. «Hümmət» təşkilatının vasitəçiliyi ilə alınmış silahların geri qaytarılması barədə razılığı nail olunsa da, son anda bolşevik-daşnak hökuməti vədinə əməl etmədi. Bu vaxt ermənilər belə bir şayiə yaydılar ki, guya azərbaycanlı zabitlər Muğanda yaşayan rus əhalisini məhv etmək barədə əmr vermişlər. Bu təxribata rus millətindən olan Xəzər donanması matrosları, habelə eser və menşeviklərin bir hissəsi də uymuşdular.

Martın 30-da qırğının həyata keçirilməsinə rəhbərlik etmək üçün başda bolşevik-daşnak Şaumyan olmaqla Bakı Soveti yanında İnqilabi Müdafiə Komitəsi yaradıldı. Həmin gün saat 1700-da döyüşlər başlandı. Qırğın ərəfəsində öz bitərəfliyini elan etmiş Daşnaksütyun partiyası və erməni Milli Şurası Bakı Sovetini müdafiə etdi. Soyqırıma Bakının erməni mənşəli əhalisi də qoşuldu. Eserlər və kadetlər də bolşeviklərin tərəfinə keçdilər.

Mart hadisələri mahiyyət etibarilə əsil soyqırım idi. Xəzər hərbi donanmasının topları müsəlmanlar yaşayan məhəllələri şiddətli top atəşinə tutdular. Martın 31-də erməni başkəsənləri «Kərpicxana», «Məmmədli» və «Zibilli dərə» məhəllələrində yaşayan azərbaycanlıları tamamilə məhv etdilər. Heç kimin qaçmasına yol veməmək üçün bolşeviklər «müsavatçıları məhv etmək» pərdəsi altında Bakı limanını ələ keçirmiş, içərişəhəri mühasirəyə almışdılar. Aprelin 1-də erməni əsgərləri buraya daxil olaraq dəhşətli qırğınlar törətdilər. Erməni-bolşevik vandalları «Kaspi» mətbəəsini, «Açıq söz» qəzetinin redaksiyasını, «İsmailiyyə» binasını yandırmış, «Təzəpir» məscidinin minarələrini top atəşi ilə deşik-deşik etmişdilər. Üç gün ərzində təkcə Bakıda 12 mindən çox azərbaycanlı qətlə yetirilmişdi.



Erməni-bolşeviklər bununla kifayətlənmədilər. Qanlı qırğınlar Andronikin, Hamazaspın, Haykın, Dronun, Njdenin, Lalayansın, Əmirovun başçılıq etdiyi quldur-terrorçu erməni dəstələri tərəfindən Azərbaycanın ətraf qəzalarındı dı davam edirdi. Şaumyan tərəfindən səlahiyyət verilmiş Hamazaspın başçılıq etdiyi erməni silahlı dəstələri Quba qəzasının 122 kəndini dağıtmış, yandırmış, təxminən 2000 nəfəri vəhşicəsinə qətlə yetirmişdi. Bundan sonra terrorçular Xaçmaz, Göyçay, Ağdaş, Kürdəmir, Cavad, Salyan və Lənkəran qəzalarında talanlar və qırğınlar törətmişdilər. Atarbekovun və Lalayansın erməni hərbi hissələri Şamaxı qəzasında 8000 nəfəri qətlə yetirmişdi ki, onların da 1653 nəfəri qadın, 965 nəfəri uşaq olmuşdur. Lalayansın göstərişi ilə kəndlərin birində qadınlar məscidə doldurularaq diri-diri yandırılmışdır. Burada cəmi 58 kənd yandırılmışdı. Kürdəmirdə quldurlar 56 ev və 2 məscid binasını yandırmışdılar. Mikoyanın başçılıq etdiyi dəstələrə isə sonradan Şamaxıya soxularaq burada 20 kəndi dağıtmışdılar. Baloğlan kəndində isə 535 nəfər (250 kişi, 150 qadın, 135 uşaq) öldürülmüş, 69 nəfər yaralanmışdı. Navahı kəndində 1050 nəfər öldürülmüş və yaralanmışdı.

Qanlı soyqırım İrəvan, Göyçə, Cavanşir, Zəngəzur qəzalarının müsəlman kəndlərində, Naxçıvan və Qazaxda da davam etdirilmişdi. İrəvan, Göyçə və Qazaxda 200, Qarabağ və Zəngəzurda 75 kənd yandırılmışdı.

Belə kədərli rəqəmləri daha çox sadalamaq mümkündür. Soyqırım 1918-ci il sentyabrın ortalarınadək davam etmişdi. Bu soyqırımda 600 minə yaxın azərbaycanlı vəhşi erməni millətçiliyinin qurbanı olmuşdu.

Erməni başkəsəni S. Şaumyan 1918-ci il aprelin 18-də bolşevik cəlladlarının başçısı V. Leninə yazdığı məktubunda daşnakların milli qırğında iştirakının bolşeviklər tərəfindən qəsdən təşkil olunduğunu etiraf etmişdi. Bu faciə Bakı Sovetinin antiazərbaycan siyasətini xalqa nümayiş etdirdi. Azərbaycanda sovetləşmə ideyasına güclü zərbə vuruldu. Azərbaycan xalqı arasında milli birlik və müstəqil dövlətçilik ideyalarını gücləndirdi. Yalnız Azərbaycan Xalq Cümhuriyyətinin yaradılması və qardaş Osmanlı dövlətinin Qafqaz İslam Ordusunun köməyə gəlməsi nəticəsində bu qanlı faciələrə son qoyuldu.

**İsmayılın dediklərindən**

***Mən gözümü açmışam Türkiyənin İqdır şəhərində, Haqveyis kəndində. Bura ermənilərlə müharibə zamanı pərən-pərən düşmüş çoxlu azəri türkünün məskunlaşdığı yerdir. Haqveyisdə ikinci sinifdən sonra orta məktəbdə oxuyası olmadım. Burada orta məktəb onillik idi. Mənsə cəmi beş il oxumuşam.***

***Atam son zamanlar fiziki gücünü itirmişdi, evdə atamla mən qalırdım. Bir qardaşım vardı, adı Abdulla. O, polis işçisi idi, Ankarada işləyirdi. Anamı itirəndən sonra atama və özümə baxmaq məcburiyyətində qalmışdım. Elə uşaq vaxtından başlayaraq həyatın bütün keşməkeşli, əzablı yollarını keçmişəm. Satıcı köməkçisindən tutmuş ayaqqabı mazlayana, avtoeleklrikin yanında şagirdliyə qədər hər işlə məşğul olmuşam. Çayçılıq da etmişəm. O vaxt cəmi 3-5 lirə pul alırdım.***

***Atamın Haqveyisdə torpağı da vardı. Lakin o, daha həmin torpaqda işləyə bilmirdi…***

İsmayıl hələ İqdırdan Azərbaycana gəlməmişdi, hələ öz qan qardaşlarına qoşulub Tərtər bölgəsində ermənilərə ölüm-dirim müharibəsinə qoşulmamışdı. Hələ atası ona «Get dədə-baba torpağının düşmənlərdən qorunması üçün sən də döyüş»—

vəsiyyətini etməmişdi. İsmayıl hələ qan içən erməni quldurlarının vəhşiliklərini gözlərilə görməmişdi. Onların türk millətinin başına gətirdikləri müsibətlər haqqında kitablarda oxumuş kinolarda baxmışdı. Hələ İsmayılın bədəninə çalın-çırpaq qəlpələrin dolmasına, mərmilərin qırdığı ağacın onun üstünə düşməsinin qan içində inildəməsinə çox vardı. İndi ölümlə qucaqlaşan İsmayıl hələ bu faciəli məqama qədərki ömrünü yaşayırdı…

Kim deyir ki, ölümlərin fərqi yoxdur, ölüm, ölümdür, mən bununla razılaşmıram. Ölümlərin fərqi var özü də lap ciddi fərqi var. Vətən yolunda ölümü alnıaçıq qarşılayanlara, ölümün gözlərinin içinə dik baxanlara, ölümün üstünə gedənlərə: «Öldü!»-- demək ən azı insafsızlıqdır. «Onlar ölmürlər, şəhid olurlar». Bir var ölmək üçün öləsən, biri də var yaşamaq üçün öləsən. Bir var diriykən ölüsən, bir də var öləndən sonra da dirisən.

Koroğlunun ölümü hara Keçəl Həmzəninki hara? Babəkin ölümü necə ölümdü, Səhl Sumbatınkı necə? Nəsimi də öldü, Şeyx Əzəm də… Belə ölümləri eyniləşdirmək olarmı? Ona görə İsmayıl kimiləri öz əqidəsi yolunda ölməyi yox, şəhid olmağı üstün tutanlardır.Belə adamlar diriykən də sağdırlar, öləndən sonra da sağdırlar.

İndi öz ana vətəni Türkiyədən uzaqlarda, bir ağacın altında öz amalı, öz əqidəsi yolunda qanına qəltan olan İsmayılın gözləri yumulmuşdu, ağır-ağır, zorla nəfəs alırdı, ürəyi dayanmaq üzrəydi. Əsl kişi belə ölümü özünə şərəf bilər!

Hələ İsmayılın bu gününə xeyli günlər vardı və hələ İsmayıl öz yeniyetməlik dövrünü yaşayırdı.

Atası «Dədəcan Abbas» ona erməni quldurlarının azəri türklərinin başına gətirdikləri müsibətlərdən çox şeylər danışırdı. Söhbət edirdi ki, indi qəbri Türkiyədə Daşlıçayda olan atası Əbdüləhəd bəy sağlığında ona Azəbaycanın bütün bölgələrini Bakıdan tutmuş Qubaya, Şamaxıya, Qarabağa, hətta aran rayonlarına qədər hər tərəfi bürüyən ermənilərin törətdiyi soyqırım haqqında ağrılı-acılı xeyli dəhşətli əhvalatlardan söz açırdı. Sonralar tarixi faktlar onun dediklərini sübuta yetirəcəkdi. Qəzetlərdə yazacaqdılar ki, 1918-ci ilin əvvəllərində Azərbaycanın ictimai—siyasi həyatında dəhşətli hadisələr baş verirdi. Ölkə başdan-başa fırtınalı bir faciə dənizinə dönmüşdü.

**Tarixi gerçəkliklər**

Verdibasar mahalı (Verdi və Qarabağlar rayonları) Qərbi Azərbaycanın (indiki Ermənistan) tarixinə görə ən qədim, coğrafi-siyasi mövqeyinə görə ən strateji, təbiətinə görə ən zəngin bölgələrdən biridir. İndiki Ermənistan Respublikası ərazisində, Ermənistan, Azərbaycan, Türkiyə və İranın bu günkü dövlət sərhədlərinin kəsişdiyi yerdə, Araz çayının şərq sahilində, Ağrıdağ vadisinin Böyük Ağrı və Kiçik Ağrı dağ zirvələri ilə üzbəüz hissəsində yerləşir. Bir tərəfdən Ağrı dağının ətəyindən axan Araz çayı ilə Göyçə və Dərələyəz mahalları, digər tərəfdən isə Şərur mahalı ilə Gərnibasar mahalı arasında barlı-bərəkətli, aranlı-dağlı böyük bir ərazini əhatə edir.

Vaxtilə qədim Sak çarlığının, Almaniya ölkəsinin, Şəddadilər, Atabəylər, Səfəvilər kimi qüdrətli dövlətlərin bir bölgəsi, XVIII yüzilliyin ortalarınlan etibarən İrəvan xanlığının tərkibindəki 15 mahaldan biri olmuşdur.




Verdi çayı Verdibasar mahalını iki hissəyə bölür. Elə mahalın adı da (Verdi-basar) Verdi çayının adından götürülüb və Verdi çayının yatağı anlamındadır. Verdi sözünün ərəbcə «vadi»şəklində izahı hələlik bütün versiyalardan daha çox həqiqətə uyğundur.

Burada qış çox sərt—qarlı, çovğunlu, yay isə sərin keçir. Ərazisi həm dağ, həm də aran rayonlardan ibarətdir.

Verdibasarın tufanları çox dəhşət olur.

1905-ci ilin faciələri və ermənilərin törətdikləri bundan sonra qanlı hadisələr Verdibasar mahalından da yan ötməmişdi. Bu mahalın elliklə müdafiəsinə qalxan verdibasarlılar İrəvandakı və Naxçıvandakı soydaşlarına kömək əli uzatmağı da yaddan çıxartmamışdılar.

1914-cü ildə Birinci Dünya Müharibəsinin başlanması Verdibasar mahalına yeni-yeni fəlakətlər gətirdi. Doğrudur, o vaxtlar çar hökuməti azərbaycanlıları məcburi hərbi xidmətə cəlb etmirdi, lakin kimin atı-arabası və s. varıdısa, biyara aparırdı. Buna görə də, müharibənin Qafqaz cəbhəsinin bu bölgəyə yaxınlığı, xüsusilə Qars, Ərdəhan, Sarıqamış, Ağrı dağı ətrafında gedən döyüşlər Verdibasar camaatına böyük maddi ziyan vururdu. Buradan cəbhə xəttinə durmadan ərzaq, mal-qara, minik və qoşqu heyvanları, vasitələri daşınmaqda idi.

Birinci Dünya müharibəsi ilə bağlı yaranmış vəziyyətdən sui-istifadə edən ermənilərin Türkiyədə silahlı qiyam qaldırması, türkləri bu müharibələ uduzmaq üçün onlara arxadan zərbə vurması, bu işdə maraqla olan Rusiyanın erməniləri silah-sursatla təmin etməsi bölgədə vəziyyəti daha da gərginləşdirir. Türkiyə də geri çəkildikcə qarşı çıxan böyük kəndləri başlayırlar. 180 min nəfərlik quduzlaşmış bu vəhşi ordu uç diviziyada bölünüb, hər birinin qarşısına konkret bölgələrdə türk-müsəlman əhalinin soyqırımını həyata keçirmək vəzifəsi qoyulur. General Andronikin diviziyası Naxçıvan, Zəngəzur, Qarabağ zonasını, generallar Arişyanın və Dronun rəhbərlik etdiyi 2-ci diviziya İrəvan, Zəngibasar, Üçkilsə, Gərinvasar,

Vedibasar ərazilərini, polkovnik Silikyanın komandiri 3-cü diviziya Göyçə gölünün ətrafındakı rayonları işğal etməli idi.
Zəngəzurda Dro, Nijde, Xımpapet, Yapo, Nazar Ağa başlarına quldur dəstələrini yığıb azəri türklərinə qarşı qırğın törədirdilər.
Verdili Abbasqulu bəy Şadliniskinin məşhur «Qırmızı Tabor» dəstəsi erməni qaniçənlərinə qarşı vuruşurdu.
1880-ci ildə Verdibasarın Çimən kəndində anadan olmuş Kərbəlayi İsmayıl Məhərrəm oğlu Abbasqulu bəyin taborundan olan 500-600 əskəri un, yağ, ət, bal, geyim şeyləriylə təmin edirdi. Kərbəlayının üç oğlu—Əsəd, Caməddin, Firudir, qardaşı oğla Məhərrəm həmin dəstədə vuruşurdular.
Kərbalayı İsmayılın yüz hektardan artıq torpaq sahəsi, qapısında yüz baş ana qoyunu, üç yüz baş sağmal inəyi, əlliyə yaxın atı vardı.
1918-ci ilin qarlı qış günlərində erməni qaniçənləri Vedibasarın bir çox yaşayış məntəqələrinə hücüm edib, əhalini qrıb-çatırdılar, oda qaladılar. Dörd kəndin qocasını, südəmər uşağını, ərsəyə çatmış qızını, oğlanını damlara yığıb od vurdular. Adamların başına kötüyün üstündə baltayla kəsib bədənlərilə birlikdə meydanda yandırdıqları gur tonqalın içinə atırdılar. Tonqalda yanan insan ətlərinin, cızhacızla əriyən insan yağının dözülməz iyi və tüstüsü altında ermənilər şərab içib nəşələnir, oynayır, ləzzətlə kefə baxırdılar. Bir nəsildən olan (səttar uşağı) 37 nəfəri öz ata ocaqlarında bir dəfəyə qətlə yetirdilər.
«Ermənilər azərbaycanlıları özlərindən 300-400 metr aralıda ağaca sarıyıb, mərc gəlib, nişan atırdılar. Mərc yolu ilə ağaca bağlanmış qız-oğlanları kim gözündən vursa, ona 5 qiymət və 10 patron, göz, ağız, burun arasına vuran 4 qiymət və 10 patron, başdan aşağı, bədən hissəsinə vuran 3 qiymət və 5 patron alırdı. Güllədi boşa çıxana lağ ilə «türklərin dostu» adı verirdilər.
Erməni daşnaq hökuməti 1918-ci il may ayının son günlərində Vedibasar mahalı üzərinə növbəti, mahalın mərkəzi Böyük Vedi kəndi üzərinə isə ilk güclü hücuma keçir. Böyük Vedinin şimalından—Ağdağ tərəfdən kəndə top mərmiləri yağdırılması ilə başlayan bu hucümda Qəmərli-Dəvəli stansiyaları arasında hərəkət edən ermənilərə məxsus zirehli qatar da iştirak edir. O, Vedibasarın dəmiryol xətti boyu yerləşən müsəlman kəndlərini pulemyot atəşinə tutur. Bununla belə, Abbasqulu bəyin güclü sərkərdəlik bacarığı sayəsində ermənilərin bu planlı hücumu onların tam məğlubiyyəti ilə başa çatır. Həm əsgəri hissəsi, həm də zirehli qatarı Vedibasar qüvvələri tərəfindən mühasirəyə alınmış daşnaklar bu döyüşdə xeyli itkiyə məruz qalırlar.
Az sonra—1918-ci ilin iyulunda ermənilər Vedibasar üzərinə yenidən hücuma keçirlər. Buna bəhanə mahal ərazisində gecə ikən quldurluq əməliyyatına çıxmış 17 erməni mauzerçisinin mahalın Dəvəli və Şahablı kəndləri arasındakı Aydoğmaz adlanan yerdə öldürülməsi olur. Bölgədə böyük hay-küyə səbəb olan bu hadisədən dərhal sonra daşnak hökuməti Vedibasarın üstünə xüsusi təlim görmüş silahlı cəza dəstələri və zirehli qatar göndərir. Kəndləri mühasirəyə alan daşnak qoşunları Vedibasar hökumətinə ultimatum verərək, öldürülən hər mauzerçinin əvəzinə 17 min manat pul və qisas almaq üçün 1 nəfər adam (cəmi 17 nəfər) tələb edirlər. Təbii ki, daşnakların tələbləri vedibasarlılar tərəfindən qətiyyətlə rədd edilir.
Vedibasarlıların belə mövqeyindən hiddətlənən daşnaklar ciddi hazırlaşdıqdan sonra Böyük Vedi kəndi üzərinə ikinci, bu dəfə daha böyük hücuma keçirlər. Bu döyüşdə erməni tərəfdən Dronun, Aram paşanın, Dəli Kazonun mauzerçiləri, milliyyətcə erməni olan polkovnik Doluxanovun və erməni generalı Bek-Pirimovun

daşnak polkları iştirak edirlər. Vedibasarın bir sıra aran kəndləri—qaralar, Şirazlı, Avşar və s. darmadağın edilir. Böyük Vedi ətrafında yenidən qanlı döyüşlər gedir və yenə də Abbasqulu bəyin sərkərdəlik bacarığı və şəxsi igidliyi sayəsində Vedibasar qüvvələri ermənilər üzərində yenidən qələbə çalırlar.
Türkiyədə məğlub olub, Arazın bu tayına keçən qisasçı daşnak «Van» və «Sasun» polkları qulağıkəsik Andronik paşanın başçılığı ilə Naxçıvan, Zəngəzur, Dərələyəz və s. bölgələrdə misli görünməmiş cinayətlər törədir, dinc müsəlman əhalini qılıncdan keçirir, arvad-uşağı iri damlara doldurub, od vurub yandırırlar.
1918-ci ilin dekabrında həmin polklar Vedibasar mahalına da gəlib çıxır və Şahablı, Qədirli, Qaraxaç, Birəli və b. kəndlərdə dinc əhalini vəhşicəsinə, misli görünməmiş qəddarlıqla qətlə yetirilir. Belə ki, əvvəl kəndlər mühasirəyə alınır, sonra dinc əhali silah gücünə iri damlara doldurulub, diri-diri yandırılır, qaçmağa cəhd edənlər güllə ilə, süngü ilə vurulub öldürülür, körpə uşaqlar tüfənglərin süngülərinə keçirilir. Həmin qırğın vaxtı Şahablı Aşıq Cəlilin əvvəl dili dibindən qoparılır, sonra da üstünə neft tökülüb, sazı ilə birgə kərmə qalağı içərisində diri-diri yandırılır.
1919-cu il iyunun sonlarında yenidən qızışan hərbi münaqişə ermənilərin Böyük Vedi üzərinə üçüncü hücumu ilə nəticələnir. Vedibasarın bir sıra kəndlərini dağıdan ermənilər Böyük Vedidə güclü müqavimətə rast gəlib, bir neçə uğursuz hücum cəhdindən sonra, nəhayət, biabırçı məğlubiyyətlə yenə də qaçmağa üz qoyurlar. Bu döyüşdə vedililər 4 pulemyot, 400 tüfəng və çoxlu hərbi sursat qənimət götürürlər. Ermənilər isə 200 nəfərdən çox əsgər, on nəfərdən çox zabit, 2 top, 8 pulemyot itirirlər.
Ermənilərin dördüncü hücumu zamanı Abbasqulu bəy onları Böyük Vedi kəndinin içərisinə buraxıb, qəfil əks-hücumla darmadağın edir.
1946-cı il ildən Ermənistana köçürülməyə başlanan ermənilərin bir hissəsi də Vedi rayonunun azərbaycanlı kəndlərinə paylaşırdılar. Onların, demək olar ki, əksəriyyəti azərbaycanlıların tövlələrində, istifadəsiz uçuq-sökük damlarında yerləşdirilirlər.
Bunun ardınca ermənilər daha məkirli bir plana əl atır, xaricdən «köçüb gələn» ermənilərin məskunlaşdırılmasındakı çətinlikləri guya aradan qaldırmaq məqsədilə ermənistanda yaşayan azərbaycanlı əhalinin bir hissəsinin Azərbaycanın Kür-Araz ovalığında köçürülməsi ideyasını ortaya atırlar.
1948-1953-cü illər köçürülməsinin Vedibasar Mahalı üçün ağır nəticələrindən biri də bu oldu ki, mahal ərazisində 48 azərbaycanlı kəndi həmişəlik xarabalığa çevrildi.
Vedibasar kəndlərində növbəti kütləvi ixtişaş 1988-ci ilin 11 mayında baş verdi. Həmin gün rayonun Şirazlı kəndi erməni millətçilərinin irimiqyaslı planlı hücumuna məruz qaldı.
Dörd böyük dəstəyə bölünmüş və hər dəstədə 400-500 nəfər erməni qulduru azərbaycanlı evlərinə hücum etdi. Həmin hücum zamanı ermənilər 64 azərbaycanlı evini dağıdıb sıradan çıxartdılar, onlardan 8-ə od vurub yandırdılar. 330 ailənin əmlakı talan edildi, 80-dən çox azərbaycanlı döyülərək bədən xəsarəti aldı.
Yerdən-göydən əli üzülən şirazlılar gecə ikən axışıb Türkiyə sərhədinə pənah apardılar. Həmin gecə rayonun başqa azərbaycanlı kəndləri də qorxu altında saxlandı. Xüsusilə Xalisa səhərə qədər gülləyə tutuldu. Bununla belə, heç kəs öz kəndini, ev-eşiyini tərk eləmək istəmirdi. Lakin ermənilər azərbaycanlı evlərinə əvvəl-əvvəl cüzi qiymət qoyur, sonra hədə-qorxu gəlir, bir şey çıxmayanda öz sahibini döyür, hücum edib ev-eşiyini dağıdır, od vurub yandırırdılar. Artıq başqa

yol görünmürdü. Beləcə, rayonun azərbaycanlı kənd və məhəllələri ev-ev boşalır, erməniləşirdi.
1988-ci il noyabrın sonu ermənilər bütün Ermənistan üzrə azərbaycanlılara qarşı qəti hücuma keçdilər. 1988-ci il dekabrın 3-də sonuncu azərbaycanlı Vedibasar mahalını tərk etdi. Qədim Türk Oğuz yurdu, əzəli Azərbaycan torpağı olan Vedibasar diyarı beləcə murdar ermənilərin tapdağı altında qaldı.

**İsmayılın dediklərindən**

**… Türkiyədə təhsil ala bilməmişəm. Sonralar əsgərliyə getdim. Burada Jandarma Okullarında komandor, yəni bir yaxşı əsgər kimi yetişmişəm. Bilik və bacarığımı elmi cəhətdən daha da möhkəmləndirmişəm.**
**Uşaqlıq illəri elədir ki, heç vaxt yaddan çıxan deyil. O vaxtkı tay-tuşlarım, dostlarım indi də gözlərimin önündədir. «Çilik-ağac» oynayardıq, aşıq, top oynadardıq. Əmimiz oğlu Oruc, dostlarım Səfər, Həmid, Oruc, Fikrət varıydı. Sonralar onların hərəsi bir yana üz tutdu—birisi İstanbula getdi, o biri Amerikaya. İndi, demək olar ki, Haqveyisdə, İqdırda azəri türkləri xeyli azalıb. Bilirsiniz, hər şey şəraitdən asılıdır. Şərait ağırdır, əkinçilikdən başqa bir şeylə məşqul ola bilmirlər, böyük fabriklər yoxdur. Kəndimizlə İqdırın arası 5 kilometrdir. Elə bilin ki, İqdırın məhəlləsidir. Haqveyisdən Ərzuruma isə 200 kilometr kəndimiz Ağrı dağın ətəyində yerləşdiyinə görə sanki əl uzatsan zirvəsinə çatar.**
**Yadımdadır. O vaxtlar Bakı radiosunun «Azərbaycanın səsi» adlı 2 saatlıq verilişi olurdu. Yaşlı adamlarla birlikdə, yəni azəri türkləri atam və uşaqlar yığışardılar radionun başına və «Danışır Bakı»yla başlayan həmin verilişə axıra qədər qulaq asardılar. Sonra ağız dolusu Azərbaycandan danışardılar. Biri-birinə: «Görəsən ölmədən o vətənimizi, torpağımızı görmək bizə nəsib olacaqmı?»-deyə, sual verərdilər.**
**O vaxt kommunist rejimində yaşayırdı Azərbaycan, ağır şəraitdə idi, vətənə gedib gəlmək ixtiyarları yox idi azəri türklərinin, sərhədlər bağlı idi. Həmin yaşlı adamların çoxu: «Azərbaycan!»-- deyə-deyə bu dünyadan getdilər. Onlara Azərbaycanı görmək nəsib olmadı. Əsgərliyi qurtarmamış mənə təklif etdilər ki, türk ordusunda qal, jandarma okuluna səni qəbul edək. Tuncay adında bir yarıbay vardı, mənə deyirdi ki, ay bala, qal, səni bu məktəbdə kursa qoyum oxu…**
**Tuncay demişkən bu «Tunc» sözünün də mənasını açıqlamaq istəyirəm. Tunc-igidlik rəmzidir. Qızıldan sonra qiymətli metaldır. Gümüşdən daha möhkəmdir, ona görə də Tuncdan heykəl düzəldirlər.**
**Bu, «Tunc» soyadı dədə-babadan gələn bir famildir. O rəhmətlik Əbdüləhəd bəydən sonra bu Tunc soyadını götürmüşük.**
**Mənim nəsil kökümdən olan Tunc soyadını daşıyan xeyli qohum əqrabam var. Əmim oğlu Hacı Əsəd Almaniyada yaşayır. «Tunc»lardan bu gün Belçikada da Hollandiyada da, Amerikada da gedib yaşayanları var. Yaşar Tunc var, Haqveyisdə yaşayır. «Tunc»lar, demək olar ki, dünyanın hər yerinə yayılıb. İstanbulda, Bursada yaşayanlar var—o da Molla Ağəlinin oğludur. «Tunc»lardan olan Əhəd əmi bizim böyüklərimizdəndir.**
**Kəlba Hüseyn əmimin uşaqları Hümbət, Həsən, İmdad, Molla Bayram Əli İstanbulda yaşayırlar.**

## TARİXİ GERÇƏKLİKLƏR

Neçə dəfə Türkiyəni, Qərbə, Cənuba və Şimala parçalanmış Azərbaycanı müharibələrə sürükləyən erməni quldurları son iki departasiyada (1948-1953 və 1988-1989-cu illər) azəri türkləriinin həyatına olmazın müsibətləri və məşəqqətləri gətirmişlər.

Monoetinin dövlət yaratmaq məqsədi daim ermənilərin qanında, canında yaşamışdır. Buna görə də onlar bütün hiyləgərliklərdən istifadə edərək öz Çirkin niyyətlərini ömrü boyu həyata keçirmək istəmiş, bu yolda hər cür qeyri-insani hərəktlərə əl atmış və nəhayət, öz istəklərinə nail olmuşlar. Bu alçaq siyasət 1948-1953-cü illərdə də həyata keçirilmişdir. Ermənistandan başqa millətlərin nümayəndələrini tamamilə çıxarmaq üçün onlar o zaman Moskvada rəhbərlikdə təmsil olunan Mikoyanın, Beriyanın və bunlar kimilərinin havadarlığı ilə Stalin tərəfindən 23 dekabr 1947-ci il tarixli, 4083 saylı Fərmanın verilməsinə nail olmuşdular. «Azərbaycan millətindən olan kolxozçuların və digər azərbaycanlı əhalinin Ermənistan SSR-dən Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi barədə» adlı bu iyrənc Fərmanın nəticəsində 100 min nəfər azəri türkü dağlıq zonalardan Azərbaycanın isti aran bölgələrinə zorla köçüroülmüşdü. Bu, vətəndaşların öz tarixi dədə-baba yurdlarından əsl departasiyası idi.

İqlimə adabtasiya oluna bilməyən əhalinin çoxu «qara qızdırma»-- malyariy a xəstəliyinə tutularaq ölmüşdü. Tarixi mənbələrdə göstərilir ki, 1935-ci ildən başlayaraq ermənilər həm xəritələrdə, həm də 1917-1920-ci illərdə işğal olunmuş Azərbaycan mənşəli 15 min coğrafi Adı dəyişdirib «özününküləşdirmişlər».

Digər bir mənbədə göstərilir ki, 1948-1950-ci illərdə, ümumiyyətlə, 9000 təsərrüfatı əhatə edən 42000-ə yaxın azəri türkü öz torpaqlarında zorla çıxarılmışdır.

Ermənistanın Azərbaycana sonuncu hərbi təcavüzü nəticəsində 5000-dən artıq Azərbaycan vətəndaşı, o cümlədən 55 uşaq, 326 qadın, 409 qoca İtkin düşmüşdü.

Erməni əsirliyindən azad edilmiş 1500-ə yaxın vətəndaşımıza o cümlədən uşaq, qadın və qocalara işgəncələr verilmiş, onlar ömürlük şikəst olmuşlar.

1988-ci ilin yanvarından etibarən Ermənistanın 185 yaşayış məntəqəsində 250 mindən artıq azərbaycanlı zorla qovulmuş, 217 azərbaycanlı ermənilər tərəfindən xüsusi qəddarlıqla qətlə yetirilmişdir.

Hələ 1905-1915, 1918 və 1920-ci illərdə indiki Ermənistan ərazisində rus ordu hissələrinin köməyilə daşnaklar etnik təmizləmə əməliyyatları aparmışlar. Başqa bəlalar da var idi. 1920-1930-cu illərdə qolçomaq, mülkədar Adı ilə çoxlu azərbaycanlı ailəsi Sibirə və Orta Asiyaya ərazilərinə sürgün olunmuşdu.

Lakin unutqanlığımız, ürəyiyumuşaqlığımız bizə hər şeyi tez unutdurur.

1915-ci ildə soyqırımına məruz qalan Türk xalqı soyqırım törətmiş bir xalqı soyqırım törətmiş bir xalq kimi ermənilər tərəfindən çığır-bağırla həyasızcasına dünyanın bir çox dövlətlərinə yayılır və çox qəribədir ki, bəzi dövlətlər bu tarixi şantaja uyurlar. Onlar 1915-1923-cü illərdə güya 1 milyon 500 min nəfər ermənin Türkiyədə soyqırım qurbanı olduğu kimi 1914-1920-ci illərdə ermənilər tərəfindən 2 milyon 500 min nəfər türk, kürd və azərbaycanlı qətlə yetirilmişdi. Hələ o vaxtlar «Türkiyə ilə müharibə ermənilər üçün müqəddəs müharibədir» çağırışını zəhər kimi özünkülərinin başına elə yerləşdirmişdilər ki, az yaşlı gənclər də könüllü olaraq türklərə qarşı vuruşa qoşulurdular.

Tarixi faktlar onu sübut edir ki, 1915-ci ildə Osmanlı İmperiyasında ermənilərə qarşı heç bir soyqırım törədilmişdir.

***

İsmayıl  belə olaylar haqqında fikirləşdikcə damarlarında Qanı od tutub yanırdı. Öz-özünə düşünürdü: «Bunlar nə qədər iyrənc, murdar və alçaqdılar! Manyaklar kimi qan içməyə hərisdilər. Türklərə qarşı bu k in, bu küdrət, torpaq acgözlüyü, insanlığa nifrət bu bədbəxt xalqı «axırda Yer üzündən siləcək, onda «Böyük Ermənistan»yox ey heç «Kiçik Ermənistan» da qalmayacaqdır!.»

## İsmayılın dediklərindən

***Atam 1990-cı ilin qanlı 20 Yanvar faciəsindən sonra məni yanına çağırıb dedi:***
***-- Oğlum mənim ana Vətənim dardadır. Sən Azərbaycana gedib, öz övlad borcunu yerinə yetirməlisən.***
***Bu, mənim ürəyimcə idi. Çünki həmin müthiş gecədə azəri xalqının—mənim qan qardaş-bacılarımın başına gətirilən müsibətlərdən xəbərim vardı.***

## İsmayılın Azərbaycana gəlişi

İsmayıl gecə-gündüz fikirləşirdi. Sərhədlər bağlı idi, heç kimi Azərbaycana buraxmırdılar.
«Bəs necə etməli hansı yolla ata-babasının vətəni Azərbaycana getsin? Müşkül məsələ idi. Hər halda, ilk növbədə pasport almaqdan başlamaq lazım gəlirdi. İsmayıl belə də etdi. İndi qalırdı qaçaqçılıq yolu…
Atası Abbasa bircə onu dedi ki, bu gün yola çıxacaq.
Atası ona uğur arzuladı. Ürəyində isə İsmayılın nigarançılığına necə dözə biləcəyini fikirləşdi. Lakin vətən təəssübü hər şeydən üsiün olur. Ona görə də «Dədəcan Abbas» ayrı heç bir söz demədi.
İsmayıl bilirdi ki, yenicə müstəqillik qazanmış Azərbaycanda hələ intizamlı ordu yaranmayıb. Erməni quldurlarına qarşı vuruşan dəstələrin əksəriyyəti təcrübəsiz, təlim görməmiş, ayrı-ayrı adamlar tərəfindən bir yerə cəmlənmiş könüllülərdən ibarətdir. Əlbətdə, onların çoxu vətən yolunda öz canlarını qurban verməyə hazır olan əsl igidlər idi. Lakin müharibədə yalnız qorxmazlıq və comərdlik hər şeyi həll etmir. Gərək döyüşün həm nəzəri, həm də praktiki taktikasını da billəsən.
Buna görə də İsmayıl özünün Azərbaycan torpaqlarının yağı düşməndən müdafiəsində gərəkli olacağını düşünürdü. Atası onu Azərbaycana göndərməsəydi də özü getməyə hazır idi. Çünki onun qanında dədə-babadan irsən keçmə bir ərənlik, bir vətən eşqi, bir vətəndaşlıq qeyrəti çalxalanırdı. Həm də atasının illər boyu ermənilərin türklərə qarşı törətdikləri vəhşiliklər haqqında danışdıqları onda bu xəyanətkar və əzazil millətə qarşı bir qəzəb, bir nifrət doğurmuşdu. İnsan da insana qarşı bu qədər zalım, bu qədər qəddar olarmı?!
İsmayıl çox fikirləşmiş, yalnız Gürcüstanın ərazisindən keçərək Azərbaycana getmək planının üstündə dayanmışdı. Bilirdi ki, bu yolda ölüm də ola bilər, həbs də. Lakin içindən püskürən bir vətən sevgisi onu Azərbaycana doğru qarşısıalınmaz bir qüvvəylə dartırdı.

## İsmayılın dediklərindən

***Min bir əzab əziyyətlə, gah gizlənə-gizlənə, gah düzlə, gah dərəylə, gah piyada, gah maşınla gecə-gündüz yol qət edib, sərhəddi keçərək gəlib Gürcüstana çıxa bildim. Əlbəttə, Qarsdan aldığım pasportun da mənə böyük köməyi dəydi.***
***Tbilisidən qatara minib Bakıya yola düşəndə hələ də özümə inanmırdım. Tbilisiyə necə gəlib çıxdığımı fikirləşəndə bədənimi bir həyəcan bürüyürdü. Görünür, Ulu Tanrı mənə yar idi. Mən həmişə Rəbbimin dərgahına şükür və dualar etmişəm.***

*Yoxdan bu külli-aləmi var edən İlahi hər şeyə qadirdir. Onun mərhəmətinə, izzəti-cəlalına həmd-sənalar olsun!*
*Azərbaycan torpağına çatanda elə bil udduğum hava da doğmalaşdı, nəfsim genişləndi, özümdə bir yüngüllük hiss etdim. Haqveyisdən bura qədər çəkdiyim əzablar, keçirdiyim iztirablar bir anda əriyib yoxa çıxdı. Bütün varlığımı bir sevinc hissi bürüdü, ovqatımda xoş duyğular yarandı. Uşaqlıqdan arzusunda olduğum, atam «Dədəcan Abbas»ın sözlərindən qaynaqlanıb vurulduğum əziz bir məmləkətdə idim. Bəlkə də ömrümdə bu qədər xoş əhval-ruhiyyədə olmamışdım. Bakıya çatmağa elə tələsirdim ki, sanki körpə uşaq anasının ağuşundan ötrü darıxmışdı.*
*İnsanın varlığı belədir. Sənə ən əlçatmaz bir arzu kimi görünənlərə nail olandan sonra yeni arzular doğulur. Türkiyədə olarkən Azərbaycana getmək mənə bir xəyal, heç vaxt həyata keçməyən bir dilək kimi gəlirdisə və bunun qeyri-mümkünlüyünü fikirləşəndə tamam tutulurdumsa, indi Azəri torpağına qovuşandan sonra Bakıya tez çatmağa tələsirdim.*
*Nəhayət, Bakı, qatar vağzalı…*
*«Xoş gördük səni, mənim xəyali doğma şəhərim!». Burada «Cem» ləqbli bir türk vətəndaşı ilə görüşdüm. Fikrimi biləndən sonra dedi ki, mən də Qarabağa döyüşə getmək istəyirəm…*
*Qarabağın Azərbaycanın dilbər bir guşəsi, əzəli və tarixi ərazisi olduğunu, lakin ermənilərin bu torpaqları zəbt edərək «Ermənistana birləşdirib, sonda «Böyük Ermənistan yaratmaq niyyətlərini atamın dediklərindən və tarixi qaynaqlardan bilirdim. Mənə məlum idi ki, son 200 ilə yaxın bir müddətdə ermənilər bu məqsədlərinə çatmaq üçün dəfələrlə qanlı faciələr törətmiş, müharibələr etmiş, separatizm və terrorizm əməllərinə əl atmışlar. Sonuncu təcavüzə isə Sovet İmperiyası dövründə və onun rəhbərlərinin köməyilə siyasi və hərbi hazırlıq görmüşdü. 1988-ci ildən açıq-aydın şəkildə növbəti dəfə öz çirkin niyyətlərini həyata keçirməyə başladılar.*

**TARİXİ GERÇƏKLİKLƏR**

1988-ci il fevralın 20-də DQMV Xalq Deputatları Sovetinin yalnız erməni deputatlarının iştirakı ilə keçirilən növbədənkənar sessiyası vilayəti Azərbaycanın tərkibindən çıxarıb Ərəminstanın inzibati ərazi bölgüsünə daxil edilməsi haqqında qərar qəbul etdi. Azərbaycan SSR Ali Soveti DQMV XDS-nin Konstitusiyaya zidd qərarını rədd etdikdən sonra Ermənistanın millətçi rəhbərləri «Daşnaksutyun» partiyasının «Türksüz Ermənistan» proqramını həyata keçirməyə başladılar.
1988-ci il fevralın 19-dan etibarən Yerevanda yenidən kütləvi mitinqlər başladı. Mitinq iştirakçıları «Ermənistanı türklərdən təmizləməli!», «Ermənistan yalnız ermənilər üçündür!» kimi şüarlar irəli sürdülər. Mitinqlərin üçüncü günü Yerevanda salamat qalmış yeganə məscid binası (XX əsrin əvvəllərində şəhərdə 8 məscid mövcud olmuşdur) və azərbaycanlı məktəbi, C.Cabbarlı adına Yerevan Dram Teatrının ləvazimatı yandırıldı. Yerevanda bu hadisələrə qarşı etirazını bildirən azərbaycanlıların evlərinə od vururdular. Yerevanda bütün bunlar törədilən zamanı Sumqayıt faciəsi hələ hazırlanırdı. «Sumqayıt qırğınları» proqramının icraçılarından ən fəalının 1959-cu ildə anadan olmuş Eduard Robertoviç Qriqoryan adına ermənінin olması (öldürülən 26 ermənidən 6 nəfəri onun payına düşür), hadisədən on gün əvvəl Sumqayıtın bütün əmanət kassalarından ermənilərin öz əmanətlərini kütləvi şəkildə götürmələri, qırğınların videolentə alınması üçün erməni operatorlarının əvvəlcədən hadisələrin planlı şəkildə törədiləcəyi yerlərdə özlərinə

xəlvəti çəkilmiş mövqeyi  seçmələri, iki gündən sonra həmin lentlərin montaj edilib bütün dünyanı dolaşdırılması, «Sumqayıt qurbanları»nın xatirəsini «əbədiləşdirmək» üçün əvvəlcədən hazırlanmış abidənin dərhal Stepanakertdə qoyulması və bu kimi faktlar sübut edir ki, bütün bunlar erməniləri, eləcə də dünya ictimaiyyətini Azərbaycan xalqına qarşı ayağa qaldırmaq məqsədini güdmüşdür. Sumqayıt qırğınlarının fəal təşkilatçılarından erməni Ohanyanın, Samoylov və Paplovskinin adları isə uzun müddət mətbuatdan gizli saxlanmışdır.

Erməni millətçiləri üçün Ermənistanda ən münbit rayonlarda yaşayan 250 mindən artıq azərbaycanlını respublikadan zorla çıxarmaq Qarabağ məsələsini həll etmək qədər vacib idi.

1988-ci il noyabrın ortalarında Azərbaycana 80 mindən artıq qaçqın pənah gətirmişdi.





**QƏRBİ AZƏRBAYCANIN (İNDİKİ ERMƏNİSTANIN) ERMƏNİLƏR TƏRƏFİNDƏN TAM İŞĞALI**

BARANA
VORONTSOVKA
ALLAHVERDİ
QIZIL QOÇ
CALALOĞLU
AMASİYA
KARVANSARAY
TOVUZQALA
HAMAMLI
BÖYÜK QARAKİLSƏ
GÜMRÜ
DİLİCAN
QIRMIZIKƏND
ƏRTİK
ABARAN
YELENOVKA
MOLLA GÖYÇƏ
AXTA
YUXARI TALİN
OSTORƏK
KƏVƏR
Göyçə gölü
ELLƏR
BASARKEÇƏR
ÜÇKİLSƏ
İRƏVAN
AŞAĞI QARANLIQ
SƏRDARABAD
ZƏNGİBASAR
QƏMƏRLİ
VEDİBASAR
KEŞİŞKƏND
SOYLAN
QARAKİLSƏ
QAFAN
MEĞRİ

1905
1915
1937
1948
1988

Ötən yüzilliyin 20-ci illərindən 1989-cu ilədək Türkiyəyə, İrana, Azərbaycana, Gürcüstana, Şimali Qafqaza və Orta Asiyaya buradan gedən ata-baba yurdunu tərk etməyə məcbur qalan, «xalq düşməni», «şübhəli ünsür» damğası ilə sürgün edilən, 1948-1953 və 1988-1989-cu illərdə didərgin düşmən azərbaycanlıların sayı 1,5 milyon nəfərdən çox olmuşdur. Bundan əlavə 1905-1907-ci və 1918-1920-ci illərdə olan qanlı vuruşmalarda yarım milyon azərbaycanlı Ermənistan ərazisində qətlə yetirilmişdir.

1988-1989-cu illərdə Ermənistandan qovulan azərbaycanlıların sayı müxtəlif mənbələrdə göstərildiyi kimi, 165 min, 189 min, hətta 200 min deyil, daha çoxdur. Tərk etdikləri ərazi isə bəzən mətbuatda göstərildiyi kimi 6.000 kv. km deyil, 9.800 kv. km-dən çoxdur. Nəzərə almaq lazımdır ki, Ermənistanın indiki ərazisinin 36 rayonundan 33-də 1918-ci ilədək azərbaycanlılar yaşamışdır. 1976-cı ildə Ermənistanda 319 azərbaycanlı kəndi vardı. Ermənilər tədricən kəndlərin adlarını dəyişdirdiklərinə görə 1988-ci ildə 22 rayonda 185 azərbaycanlı kənd adı qalmışdı.

SSRİ Nazirlər Soveti iki qərar qəbul etmişdi. Birincisi 23 dekabr 1947-ci il tarixli «Ermənistan SSR-dən kolxozçuların və digər azərbaycanlı əhalinin Azərbaycan SSR-nin Kür-Araz ovalığına köçürülməsi haqqında» qərar idi. Stalinin imzaladığı həmin qərar azərbaycanlılar üçün gözlənilməz zərbə, açıq repressiya idi. Bu qərarda bütün azərbaycanlıların Ermənistandan köçürülməsi tələb olunurdu. SSRi Nazirlər Sovetinin 10 mart 1948-ci il tarixli qərarında isə birinci qərarın yerinə yetirilməsi üçün tədbirlər planı şərh edilirdi. 77-83








## İLK DÖYÜŞ

Türkiyədə hərbi məktəbi qurtardıqdan sonra İsmayıla çavuş rütbəsi verilmişdir. Ona görə də hərbin bir çox sirlərini bilirdi. Bu, döyüşlərdə onun köməyinə çox çatacaqdı.

Azərbaycana yola düşməzdən əvvəl atasıyla birlikdə anası Dilbərin qəbrini ziyarət etmiş, məzarının üstünə tər güllər qoymuşdu. Atası Abbas da, İsmayıl da baş və sinə daşlarnı qucaqlayıb doyunca ağlamışdılar.

İndi nədənsə İsmayılın yadına həmin gün düşdü. Ani də olsa ürəyini kövrək bir hiss bürüdü. Özünü ələ alıb, sakitləşdi.

Bakıdan Tərtərə onunla gələn türkiyəli «Cem»in heç bir sənədi yox idi. Bu səbəbdən də ondan şübhələnmişdilər və döyüşə buraxmaq istəmirdilər. İsmayılı da həmçinin. Belə vəziyyət İsmayıla ağrıtsa da, neyləyə bilərdi ki? Bir çıxış yolu axtarırdı ki, imkan tapıb döyüşə getsin və nə məqsədlə gəldiyini isbat etsin. Çox fikirləşdi axırda xeyli yalvarışdan sonra pasportunu bir oğlana verib, onun avtomatını müvəqqəti aldı və döyüşə gedənlərə xəlvəti qoşuldu.



İlk döyüş Tərtərlə qonşu olan Ağdərə rayonunun (ermənilər onun adını Mardakert qoymuşdular) Levonarx kəndi uğrunda gedən döyüş oldu. Bu kəndə yaxın olan Maqauz və Madağız kəndləri də vardı. Azərbaycan Respublikasının Ağdərə rayonundakı bütün kəndlərin adı əvvəllər öz dilimizdəydi, sonradan erməniləşdirdilər və başbilənlər də buna göz yumdular.

İlk vaxtlar döyüşən dəstənin komandiri Pənah Məmmədov idi. Bu dəstədə ölümlərindən sonra Azərbaycanın Milli Qəhrəmanı adı verilmiş Vəzir Surxayov oğlu Orucov və Elman Süleymanov oğlu Hüseynov kimi qorxmaz, igid oğullar da döyüşdürdülər.

İsmayıl döyüş bölgəsində Suliddin, Şakir, İlham, Habil, Firudin, Vaqif, Fikrət, Akif, «Qəmlo», İntiqam, «Qoçu», Mahir, Əyyub, Hafiz, Vasif, «Dombro», Ədalət, Oruc, İdris, Saleh, Yolçu, Nikolay, İsmayıl, Yaşar, Sərvər, İslam, Zabil, Mərkəz, «Umudlu Şakir», Rafiq, İlqar, Məzahir, Mirzə kimi əsl vətəndaş, Vətən uğrunda canlarından keçməyə hazır olan, yağılara qan udduran, qorxmaz, cəsur, hər biriylə ayrıca fəxr duyulası ərənlərlə tanış olmuşdu.



«Levanarx döyüşünə» komandirliyi Vəzir Orucov edirdi. Vəzirin adı gələndə ermənilər tir-tir əsirdilər. Onun başına rul da qoyulmuşdu. Yəni kim Vəziri öldürsə ona xeyli məbləğində mükafat veriləcəkdi.

Vəzir Orucov həm kəşfiyyatçı həm də döyüş əməliyyatlarına gedirdi. Onun «PK»-sının və qumdaraatanının sorağı hər yana yayılmışdı. Şəhid olduğu ana qədər yalnız Vəzir yüzlərlə erməni quldurunu məhv etmiş, onlarla hərbi sursat və texnikanı sıradan çıxarmışdı. Bu adamın qorxu deyilən hisslə işi yox idi. Onun haqqında rəvayətə bənzəyən, əslində isə gerçək olan neçə-neçə söz-söhbət gəzirdi.

Rusiyada yaşayırdı. Vətənin darda olmasını eşidib, bütün şanslarını tərgidib, hətta həyat yoldaşı Marinanı, körpə oğlu Camalı, orada qoyub gəlmişdi döyüşə.
İsmayılın ən əvvəl tanış olduğu və sonradan ən yaxın dost olduğu da Vəzir idi.
«Cem» bir-iki gündən sonra qayıdıb çıxıb getmişdi. İsmayıl isə Vəzirin əsl silahdaşına çevrilirdi.
«Levonarx döyüşü»ndə İsmayıl çox böyük qaçaqlıq və qorxmazlıq göstərdi. O, həm də ağıllı tədbirləri və məsləhətlərilə dəstə üzvlərindən seçildi.
Döyüşün qızğın yerində bir də görürdün ki, silahı yerə qoyub fotoaparatıyla şəkil çəkməyə başlayır. O, bütün hərəkətləriylə döyüşçü yoldaşlarına qorxmazlıq və igidlik nümunəsi göstərirdi. İsmayılın döyüşçü yoldaşlarının arasında Məlahət adlı bir qız da vardı.
Xocalı faciəsindən sonra anasından xəlvət yaşadığı Xaçmaz rayonundan Bakıya gəlmiş, könüllü olaraq müharibəyə getmək istədiyini bildirmişdi. Onu Tərtər cəbhəsinə göndərmişdilər.
O vaxt hərbi hissənin komandiri olan Elman Hüseynov bu qızın boy-buxununa baxıb, demişdi:
--Göndərin arxa cəbhəyə. Qoy getsin Yəmən həkimin yanına, bir iş tapşırsın ona.
Məlahət həkimin yanında bir ay sarğıçı işləyəndən sonra, inad etmiş, silah atmağı öyrənmiş və əsgər paltarı geyərək birinci dəfə «Ucar bölməsi»ylə Ağdərənin Kasapet kəndi uğrunda döyüşə getmişdi. Məlahət bu döyüşdə özünü cəsur bir döyüşçü kimi göstərmişdi—həm döyüşmüş, həm də tibb bacılığı etmişdi.
Məlahət sonradan «Tərtər batalyonu»na gəlmişdi.
Levonarx uğrunda çox gərgin vuruşma oldu. İsmayılın da iştirak etdiyi bu döyüşlərdə Zabil şəhid oldu, Firudin isə yaralandı.

## KƏŞFİYYAT

…Elman Hüseynov, Pənah Məmmədov,Vəzir Orucov və İsmayıl Tunc bir yerdə oturub növbəti döyüşün planını hazırlayırdılar. Vəzirin məsləhətilə qərara gəldilər ki, əvvəlcə kəşfiyyata gedib, vəziyyəti öyrənməliydilər.



Vəzir on nəfər igid seçdi.
Vəzir bütün kəşfiyyatlara cəsur döyüş yoldaşı və yaxın dostu, özünə doğma qardaş bilən, ermənilərə qarhı pələng kimi vuruşan Suliddin Yusibovla və son zamanlar həm də İsmayıl Tuncla birlikdə gedərdi. Bunlarsız o, kəşfiyyatın uğuruna inanmazdı. Seçdiyi adamların qalanlarından isə həmişə soruşardı:
---Kim getmək istəmirsə, gizlətməsin, desin. Çünki burda hər şey ola bilər.

Vəzir çox vaxt İsmayılın ağıllı fikirlərinə və təkliflərinə əməl edirdi. Bu da onlara hər bir əməliyyatda zəfər qazandırardı.
Vəzir seçdiyi on nəfərlik dəstə özüylə bərabər İsmayıldan, Suliddindən, Ədalətdən, Ələddindən, Sərvərdən, İlhamdan (Mustafayev), Müzakirdən, Mayıldan və Vaqifdən (Abdullayev) ibarət idi.
Kəşfiyyatın planı hazırlandı. Vəzirlə İsmayılın təklifləri hamı tərəfdən bəyənildi.
Vəzir qabaq tərəfdə, qalan döyüşçülər isə onun arxasınca yola düzəldilər. Çaylı və Madagiz kəndləri bizimkilərdə olsa da kanal üstü getmək olmazdı. Bu yol təhlükəli idi. Madagiz Su Hövzəsində Goranboy rayonundan olan döyüşçülər dayanmışdılar.
Heç kim danışıb-dinmirdi. Tapdandıqca qurumuş otların səsi gəlirdi. Çaylağa endilər. Vəzir beş addım öndəydi. Birdən dayandı və uşaqlara işarə elədi. Hamı aşağı sindi.



Artıq toran çalmışdı, lakin ay işıq saçırdı.
Vəzir bir az irəli addımladı, aşağı oturdu. İsmayıl sürünə-sürünə onun yanına getdi. Onlar vəziyyəti sakitcə götür-qoy etdikdən sonra, uşaqlara işarə ilə sağ tərəfə göstərdilər. Xeyli gedəndən sonra dayandılır və nəzərdən keçirməyə başladılar. Ay işığında uzaqdan Lüləsaz kəndi görünürdü.
Onlar döyüşü harda və necə aparacaqlərını tam dəqiqləşdirəndən sonra səhərə yaxın geri qayıtdılar. Kəşfiyyatçıları sağ-salamat görən döyüş yoldaşları xeyli sevindilər.
Bu hərbi əməliyyatda «Tərtər Batalyonu» ilə yanaşı «Lənkəran», «Mingəçevir» və «Goranboy» batalyonları da iştirak edəcəkdilər.
Kəşfiyyatın gətirdiyi məlumatlar bütün komandirlərə gətirdilər.
Döyüşdə Pənah Məmmədovun ayağından aldığı yara sağaldığına görə hissəyə onun komandirlik etməsi qərara alındı.
Səhər yeməyindən sonra əsgərlər silahlanıb «Lüləsaz yüksəkliyi» uğrunda döyüşə yola düşdülər.
İsməyıl Suliddin yenə Vəzirin yanında idilər.
Hissələr dərəylə bir az yuxarı qalxdıqdan sonra ayrıldılar və hərə əvvəlcədən müəyyən olunmuş mövqeləri tutaraq hücüm əmrini gözləməyə başladılar.
Uşaqların «qız qardaşı» Məlahət və burada idi. Onun əynindəki əsgər paltarı arıq bədənini bir az dolu göstərirdi.
Bir azdan «hücüm !» əmri verildi. Tanklar, toplar dağı dərəni lərzəyə gətirdi. Düşmənin topları üç tərəfdən atmağa başlasa da, qəfil hücum onları çaşdırmışdı.

Sol tərəfdən «Lənkəran»lılar, ortadan isə «Tərtər»lilər atəş aça-aça irəli gedirdilər. Birdən «Lənkəran» tərəf susdu. Erməninin bir tankını görüb onlar atəşi dayandırmışdılar.



Vəzirlə İsmayıl məsləhətləşib belə qərara gəldilər ki, düşmən toplarının arxa tərəfinə keçib, onları məhv etmək lazımdır. Yoxsa xeyli itgi verəcəklər. Bu anda Suliddin, Sərvər və Mayıl da onların yanına gəldilər. Bu plan qorxulu olsa da, ayrı çarə yox idi. Buna görə də onlar ölüm riskinə gedərək müxtəlif yerlərlə hərəkət edib, nəhayət, düşmən toplarının arxa tərəfinə keçə bildilər. Onların sağ-salamat bu mövqeyə çıxmalarında İsmayıl Tuncun məsləhətləri əsas rol oynadı.
Vəzir Orucov topçunun birini nişan aldı. Atəş açılan kimi topçu yerə sərildi. O biri topçunu isə İsmayıl vurdu. Topatan erməni quldurlarını öldürdükdən İsmayıl fotoaparatı çıxarıb bütün bu görüntülərin şəklini çəkdi, sonra toplardan birinin arxasına keçdi, istiqamətini tərsinə düşmənə tərəf dəyişərək mərmi yağdırmağa başladı.
«Goranboy Batalyonu»nun bir tankı vurulmuş, sürücü tankın içində qalmışdı. Habil özünü təhlükəyə ataraq yanan tankın içindən onu çıxara bildi, lakin özü qarın nahiyyəsindən yaralandı.
«Tərtər Batalyonu»nun da bir hərbi maşınını vurmuşdular. Oruc kişi maşının yanında idi.
Elman, Şakir və Məlahət irəli qaçarkən düşmən gülləsi rabitəçi Şakiri yerə yıxdı. Güllə onun düz sinəsindən dəymişdi. O, öldü yaralanan da çox idi.
Vəzirlə İsmayılın dəstəsi arxa tərəfdən düşməni atəşə tutmuşdular. Üç tərəfdən Lüləsaz yüksəkliyinə onunan hücum və arxadan vurulan zərbələr nəticəsində ermənilər tamamilə geri çəkildi. Lüləsaz kəndi bir gecə sakinsiz qaldı. Sonra «Tərtər Batalyonu» kəndin içinə girib hər tərfi yoxladıqdan sonra «Lənkəran Batalyonu»na təhvil verilərək geri qayıtdı.
Düşmənlər Çardaxlı kəndinin aşağı tərəfində mövqe tutmuşdular.
Yenə kəşfiyyata gedib vəziyyəti öyrənmək məcburiyyəti ortaya çıxmışdı. Vəzirin rəhbərliyi altında yenə bir dəstə yarandı. Əlbətdə, İsmayılla Suliddin başda idi.
Onlar plan üzrə ermənilərin yerləşdiyi mövqeyinə qədər girib çıxmış, çox şey öyrənmişdilər. Lakin düşmənin əhatəsində sakitcə hərəkət edərkən mingəçevirli bir döyüşçünün özündən asılı olmayaraq barmağı qəfildən tətiyə dəymiş və güllə açılmışdı. Ermənilər bu səsi eşidib, həmin tərəfi güclü atəşə tutmuşlar. Beləliklə, bizimkilərin kəşfiyyat planı pozulmuş, canlarını ölümdən zorla qurtarmışlar. Əgər Vəzirlə İsmayıl olmasaydı bölmə büsbütün əsir düşəcəkdi.



Bundan üç gün keçməsinə baxmayaraq, hiddətdən Vəzirlə İsmayıl hələ özlərinə gələ bilməmişdilər. Axırda Batalyonun komandiri Pənah Məmmədov onları bir təhər sakitləşdirmişdi. Bu sakitləşməyə digər tərəfdən də Çardaqlı kəndi istiqamətində hazırlanan hücum xəbəri səbəb olmuşdu.

Çardaqlı çox vacib strateji bir mövqedə yerləşirdi. Vəzirli İsmayılın kəşfiyyat dəstəsi vəziyyəti öyrənmək üçün üçüncü dəfə həmin məntəqənin ətrafına getmişdi. Sonuncu dəfə düşmənin lap arxa tərəfinə keçmiş və ərtaflı məlumat toplayaraq geri qayıtmışdı. Düşmən qüvvələrinin əsasən kəndin qəbiristanlığında və «Alma bağın»da mövqe tutduqlarını öyrənmişdilər. Onlar kəndin hər bəndini-bərəsini nəzərdən keçirmiş, yüksəkliyə gedən yolu tapmış Sərsəng su anbarının ətrafını gəzmiş, buradan axan qola qədər hər şeyə diqqət yetirmişdilər.

«Ferma» deyilən binanın içinə baxmaq üçün Vəzir tək özü getmiş, orada xeyli meyid görmüşdü.

«Lüləsaz döyüşü»ndə ən çox «Lənkəran Batalyonu» itgi vermişdi. Bunlar Lənkəran uşaqlarının cəsədləri idi, ermənilər öldürmüşdülər.

Vəzir geri dönüb əhvalatı danışandan sonra İsmayıl dedi:

--Meyidləri burada qoyub getmək bizim qeyrətimizə yaraşmaz. Beş cəsədi biz on nəfər götürüb apara bilərik, lakin kom halda getmək olmaz.

Cəsədləri götürdülər. Biri-birlərindən xeyli aralı aparırdılar. Qabaqdakılar diki yenicə aşmışdılar ki, arxadakıları güclü atəşə tutdular. Atışmada Dağıstan adlı igid bir oğlan şəhid oldu. Onu da götürdülər.

Hücum sabaha planlaşdırıldı.

Vəzirlə İsmayıl dincəlməyə getdilər…

## ÇARDAXLI DÖYÜŞÜ

Sübhün alatoranında qoşun hissələri Çardaqlı istiqamətində hərəkət etməyə başladı.

«Çardaqlı döyüşü» ermənilərlə müharibədə ən qanlı döyüşlərdən biriydi.

Tüstü göyə bülənd olmuşdu. Atəş səslərindən qulaq tutulurdu. Qayalar göydə mərmi qəlpələrinə dönürdü. Köklü ağaclar yerlərindən qopur, gövdələrindən qırılıb şaqqıltı ilə yerə dəyirdi. Sanki göydə də, yerdə də müharibə gedirdi. Raketlər, top mərmiləri dəhşətli səslə ulaya-ulaya gəlib harda partlayırdısa oranı viran qoyurdu. Elə bil dünyanın sonu, axır-məşhər günüydü. Sanki İsrafil «zur düdüyü»nü çalmışdı. Dünyanın altı üstünə çevrilirdi. Çığırtı, bağırtı atılan güllələrin səsinə qarışırdı.



Bu döyüşdə «Mingəçevir», «Lənkəran», «Xanlar», «Qurtuluş» batalyonları «Tərtər Batalyonu»ilə birlikdə vuruşurdular.

Pənah Vəzir, İsmayıl, Mlahət, Elman, Suliddin, Əhəd, Dilqəm və digər döyüşçülər özlərinə elə mövqe seçirlər ki,

ermənilər mütləq oradan keçəcəklər və burada İsmayılla bir ermənininin arasında baş verən qəribə «Parol» əhvalatını sonra oxuyacaqsınız.
Bizimkilər düşmənə ağır itgi verə-verə «Alma bağı»na çatdılar. Yaman yorulublar. Aclıq da bir yandan üzür onları. Çörək gətirmək üçün 4 nəfər—Vaqif (Abdullayev), Vəkil, Müzakir və «Umudlu Şakir» gediblər. Lakin gəlib çıxmaq bilmirdilər. Adamların ağlına yüz cür fikir gəlirdi: «Görəsən nə baş verib?».
Sən demə çörək gətirən maşın yolda minaya düşüb, «Qara İslamın qolunu, qıçını qəlpələr aparıb. Pənah Məmmədov onu xəstəxanaya çıtdırmışdı.
Sonra həmin əraziyə mina-axataranlar gəlmiş və 19 mina tapıb çıxarmışdılar.
Burada isə döyüşçülər çörək gözləyirdilər. Acından kal alma, qarağat, moruq tapıb çıxarmışdılar.
Burada isə döyüşçülər çörək gözləyirdilər. İsmayıl da onlarla birgə çox yorğun və ac idi…
«Alma bağı»nın qarşı tərəfində od tutub yanmış bir ev görünürdü, bina hələ də tüstülənirdi. İsmayıl Elman Hüseynova yaxınlaşıb xahiş etdi:
-- İcazə Verin 3-4 nəfərlə o evə bir baş çəkim. Bəlkə nəsə tapdıq?
Elman hüseynov dedi:
-- Olar. Lakin ehtiayatlı olun, əvvəlcə ətrafa dəqqətlə baxın,sonra binaya girin.
İsmayıl,Suliddin,Qoçu və Sərvərehtiyatla evə sarı getdilər, çəpəri aşıb binaya yaxınlaşdılar. Hər tərəfi diqqətlə nəzərdən keçirəndən sonra Qoçu və Sərvər çöldə dayandılar, İsmayılla Suliddin içəri girdilər. Evin üst otaqları tamam yanmışdı, zirzəmi isə salamat qalmışdı. Onlar ehtiyatla zirzəmiyə endilər, kibrit yandırıb ətrafa baxmağa başladılar. Birdən gözləri ipdən asılmış kolbasalara və təpə kimi qalanmış ağ təndir lavaşına sataşdı. İkisi də sevincdən az qaldı oynayalar. İsmayıl bir boş çuval tapdı, gördüklərini onun içinə yığdı. Yenə künc-bucağı axtarmağa başladı. Soyuducu gördü, qapısını açdı, burada nələr yoxuydu kolbasa, mal əti, təzə pendir, yağ… Bunları da bir ayrı çuvala doldurub götürdülər. Qoçuyla sərvər onların yükünü görəndə uşaq kimi sevindilər. Gətirib ortaya tökdülər, uşaqların hamısı doyunca yedi.
Səhərə xeyli qalırdı. Vəzir yenə nəsə duymuşdu. Yaxınlıqdan qarışıq səslər gəlməyə başladı. Elman bölmə ilə bərabər bağda mövqe tutdu, Vəzirlə İsmayıl isə burdan çıxdılar. Sağda böyük su anbarı vardı. Deməyəsən erməni qüvvələri burada cəmləşiblər. Onun üçün çox yaxşı seçilmiş mövqe idi. Onlar buradan birbaşa yola nəzarət edə bilirdilər. Vəziyyət çox ağır idi. Burada ermənilərin xeyli texnikası da vardı.
Vəzirlə İsmayıl ətrafı diqqətlə öyrənib geri qayıtdılar. Arxaya məlumat verdilər. Düşmən bütün yolları bağlamışdı. Bir azdan hücuma keçdilər. Yenə yer-göy silkələnməyə başladı. Ermənilərin texnikası da, canlı qüvvəsi də bizimkilərdən qatqat üstündü.



İsmayıl hiss etdi ki, uşaqlar vahiməyə düşüblər. Birdən ayağa qalxdı, əlindəki avtomatı yuxarı qaldırıb qışqırdı.
-- İrəliii !!! İrəli!!!
Və düşmən mövqyeinə tərəf cumdu. O tez-tez qışqırdı:
-- Uşaqlar, qorxmayın! İrəlii!!! İrəliii!!! Allahu Əkbər! Allahu Əkbər!

Döyüş dotları onun bu qoçaqlığını görüb hərəkətə gəldilər. Hamı irəli cumdu. İrəlidə isə qəbiristanlıq vardı, elə nicat yolu da bura idi. Bizimkilər atəş aça-aça qəbiristanlığa doldular. Ermənilər yüksəklikdən buranı atəşə tutmağa başladılar. Düşmən mərmilər qəbir daşlarını havada çərpələng kimi oynadır, parça-parça edib çınqıl daşına göndərirdi.
Bizim qüvvələrimiz də az deyildi, lakin düşmən yüksəklikdə olduğundan və hər yeri aydın gördüyündən bizimkiləri güclü artilleriya atəşinə tutmuşdu.
Hünərli olmaq bədənin ölçüsündən asılı deyil, gərək ürəyində təpər ola. Cılız adamlar görmüşəm ki, öküz boyda natarazları yazıq günə qoyub. Müharibədə də çox şeyi cürət, çeviklik və ağıl həll edir.
Xaçmazlı qızı Məlahət oda-alova dönmüşdü, mövqedən-mövqeyə atılırdı, yaralılara tibbi yardım edirdi.
Xeyli itgimiz və yaralımız vardı. Elmir, Nəbi, Babək şəhid olmuşdular, Mətləblə Saleh yaralanmışdı.
İsmayıl böyük bir ağacın arxasına keçib, düşmən tərəfə atəş açırdı. O, qumbaraatanla yağıların bir «PDM»-ni vurub sıradan çıxarmış və sonra fotoapparatı ilə onun şəklini çəkmişdi.
Vəzir atəş yerini tez-tez dəyişərək «PK»-nı işə salır, yoldaşlarına müxtəlif göstərişlər verir, həm də onların mövqelərini izləyirdi.
Bir mərmi uğultuyla gəlib arxasından İsmayılın atəş açdığı ağacın yanında bomba kimi partladı. Ağac şaqqıltıyla qırılıb yerə dəydi. İsmayıl görünmədi. Məlahət bir az uzaqdan da bu hadisənin şahidi oldu. İsmayıl tərəfə köməyə qaçarkən o da vuruldu. Hissə geri çəkilməyə başladı. Düşmənlər bir az da qabağa gəldilər.
Bizimkilərə kömək üçün arxadan göndərilən qüvvələr artıq döyüş yerinə çatmışdı. Yenidən şiddətli müharibə başladı. Ermənilər yavaş-yavaş geri çəkildi. Nəhayət, çox itkilər və qanlar bahasına bizimkilər həmin yüksəkliyi tuta bildilər. Ermənilər tərəfdən də itki az deyildi.
İsmayıl kürəyindən və başından ağır qəlpə yaraları almışdı, qolu sınmışdı. Başının yarası daha dərin və qorxulu idi. Onu təcili Tərtərin Sarov kənd xəstəxanasına götürdülər.

## KÖVRƏK GÜNLƏR

Xəstəxana çarpayısında dərin xəyala dalan İsmayılın gözləri özünə öz doğma yerləri gəldi, İqdırı Haqveyisi xatırladı, atası Abbas, bacıları Gülçün, Seyran və Ceyran qardaşı Abdullah yadına düşdü. Onlardan ötrü burnunun ucu göynədi. Əmizadələri Hümbəti, Hacınxatırladı, xəyalən, anası Dilbərin qəbrini ziyarət etdi, Həsənlə, İmdadla, Almaniyada yaşayan Əsədlə görüşdü. Dəli bir həsrət sardı könlünü, dərindən «ah!» çəkdi, gözləri doldu…



Və yadına yaralandığı an düşdü. Öz-özünə əsəbiləşdi: «Qismətə bax! Mərmi gəlib harda partladlı! Yoxsa, bu köpəkuşağı ermənilərin dərsini yaxşı verəcəkdik! Vəzirin dediyinə qulaq asıb, həmin arxasından tez çəkilsəydim, indii burda uzanmazdım. İndi uşaqlar orda ermənilərlə döyüşür, mən də yanımı yerə vermişəm. Barı, tez sağalsaydım! O erməni «dığa»larını

pərən-pərən eləməsəm, rahat ola bilmərəm. «Əlimin duzunu» onlara hələ çox daddıracağam!».
Başının yarası çox şiddətlə ağrıyırdı. Üç gün idi ki, xəstəxanadaydı. Həkimlər məsləhət gördülər ki, başının yarasını müayinə etmək üçün mütləq Bakıya aparılmalıdır.

Yenə onu kövrək hisslər bürüdü. Oturub qardaşı Abdullaha bir məktub yazdı:

**Əziz qardaş, yaman ağır yaram var,**
**Məlhəm üçün bircə yarpaq götür, gəl.**
**Bəlkə öldüm, gözlərimə səpməyə**
**Anamın qəbrindən torpaq götür, gəl…**
**(Sərraf Şiruyə)**

Qələmini yerə qoydu. Dərin fikrə getdi. Azərbaycan torpağının faciələrini yadına saldı. Bu torpaq ta qədimdən həmişə müharibələr meydanı olub. Zaman-zaman Azərbaycan gah zorla, gah xoşla dövlətlər arasında bölünüb, param-parça edilib, böyük bir ərazidən—indiki bir tikə qalıb. Onun da üstündə yenə davadır. Allah-Allah! Bu zavallı xalqdan nə istəyirlər?!

## YENƏDƏ MÜHARİBƏ

Yenə də on nəfərdən ibarət bir dəstə (Vəzir, İsmayıl, Suliddin, Saleh, Ələddin, Qoçu, Sərvər, Mayıl, İlham, Hafiz) kəşfiyyata yollanır. Onlar yenə təhlükəli yerlərdən keçərək Çardaqlı tərəfə gedirdilər. Meşədə xeyli erməni tankı, zirehli hərbi maşın və canlı qüvvə gördülər. Bu barədə, geriyə, Pənah Məmmdovla Elman Hüseynova məlumat verdilər. Uluqarabəyli kəndi (Metşen) ermənilərdən alınmışdı.
Hücum başladı. «Gəncə», «Goranboy», «Mingəçevir», «Lənkəran», «Qurtuluş», «M—2» hərbi hissələri «Tərtər Batalyonu»ilə birlikdə döyüşə atılmışdılar. «Tərtər Batalyonu»nun könüllüləri «Turbaza» deyilən strateji mövqe uğrunda vuruşurdu.
Vəzirin kəşfiyyat dəstəsi düşmən qüvvələrinin arasında qalmışdı, arxa da, ön də ermənilər idi. Lakin öndəki ermənilərdən o tərəfdə yenə bizimkilər mövqe tutmuşlar. Buna görə də həmin ermənilərin də vəziyyəti ağırıydı.
Kəşfiyyatçılardan kimsə işarə elədi ki, qarşıdan gələn var. Hamı kolların arxasında gizləndi. Baxanda gördülər ki, erməni onlara tərəf gəlir. Qəfildən onun qarşısını kəsdilər. Erməni geri qaçmaq istəyəndə Suliddin onun ayağından atdı, erməni üzüstə yıxıldı. Onun başının üstünü kəsdirəndə yalvarıb imdad istəməyə başladı. Bu köpəkuşağı belədir, mənlikləri yox, şərəfləri yox.
«Tərtər Batalyonu»nda Nikolay (Kolya) adında bir döyüşçü də vardı. Atası azəri türkü olmuşdu.



Qazaxıstanda yaşayarkən Kolya həbs olunmuşdu. Türmədə sayca çoxluq təşkil edən ermənilər ona çox əzab-əziyyət vermişdilər. Azərbaycanda ermənilərin müharibə apardığını eşidib, qisas almaq üçün bura gəlmiş və döyüşən könüllülərə qoşulmuşdu. Nikolay burada xeyli müddətiydi ki, düşmənə qarşı igid tək döyüşürdü.
O, Sərvərdən iri bir bıçaq alıb yaralanmış erməniyə tərəf yaxınlaşanda İsmayıl duydu ki, Kolya erməninin başını kəsəcək. Kolyanın gözləri qan çanağına dönmüşdü. Çox güman ki, həbsxanada bu nankorların ona verdikləri zülmlər yadına düşmüşdü. Qəzəbdən əl-ayağı əsirdi. Traf mühitdən təcrid

olunmuşdu, özündə deyildi. Təsəvvür edin ki, onun başına hansı oyunları açmışdılarsa indi belə bir halda idi.
Kolya erməniyə çathaçatda İsmayıl onun qarşısını kəsdi. O qışqırdı:
--Çəkil, İsmayıl!



İsmayıl onu dilə tutmağa başladı:
--Kolya, özünə gəl. O bizə hələlik diri lazımdır. Bir az səbrli ol. Qoy bundan məlumat öyrənək, sonra nə bilirsən elə.
Kolya bu sözləri eşidəcək halda deyildi:
--İsmayıl, sənə dedim çəkil! Bu oğraşın başını kəsib, qanını içəcəyəm! Çəkil, İsmayıl.
--Kolya, taxta, --İsmayıl ona yalvarırdı. Bir az hövsələli ol. Sən indi onun başını kəssən, bizə heç bir xeyri olmayacaq. Qoy istədiyimizi ondan alaq, sonra kəsərsən…
İsmayıl hiddətindən tir-tir əsən Kolyanı yoldaşlarının köməyilə bir təhər özünə gətirib, azacıq sakitləşdirə bildi.
Bu vaxt atılan erməni gülləsi Asimi yaraladı. Növbəti bir güllə isə Mirzəni şəhid elədi.
Mirzə Ermənistandan qaçqın düşənlərdən idi. Şuşaya gəlmişdilər, elə Şuşada da döyüşə başlamışdı. Şuşadan sonra Mingəçevirə, oradan da Tərtərə döyüşə gəlmişdi. Çox qoçaq oğlan idi. Ermənilərin az qala Milli Qəhrəman səviyyəsinə qaldırdıqları, ratsiyada həmişə bizimkilərə söyüş söyən, əli çox qanlara batmış heyvərə bir vəhşiyə oxşayan cəllad Kamonu Mirzə öldürmüşdü. Vəzirin yaxın dostu, dayağı idi. Birlikdə çox əməliyyatlar aparmış və biri-birilərini qorumuşdular.
İndi isə bir alçaq erməninin atdığı güllə onu susdurmuşdu…
«Tərtər Batalyonu» «Turbaza»ya hücuma başlamışdı. İsmayıl yenə qəfil ayağa qalxaraq qışqıra-qışqıra irəli cumdu:
--Qardaşlar, irəliii, irəliii!!!
Dəstədə olan döyüşçülərin hamısı (Pənah, Vəzir, Suliddin, Oruc kişi, Mürsəl, Mehman, Nizami, Mayıl, Adil, Amil, Seyid, Mütalib, Mahir, VAhid, Babək, Əlyar, Taleh, Tağı, Mətləb, Kolya…) bu nərədən həvəsə gəlib irəli şığıdılar.
«Turbaza»ya birinci Pənah Məmmədov, VƏZİR Orucov və İsmayıl Tunc daxil oldular.
Gölün sağ tərəfində isə Elman müəllimlə Məlahətin olduğu digər bir dəstə bərəni kəsmişdi. Bu zaman yaxın dikin başındakı bir erməni bayrağı Məlahətin gözünə dəyir. O, yerindən sıçrayıb bayrağa tərəf qaçmağa başlayır. Dəstənin üzvləri heyrətlə bu qızın nə edəcəyini gözləyir. Məlahət bayrağa çatır, onu asıldığı yerdən qoparır, ayaqları altına atıb cırıq-cırıq eləyəndən sonra sakit addımlarla Elman müəllimin yanına qayıdır. Yaxşı ki, ermənilərin gülləsinə tuş gəlmir.
«Turbaza»nı aldıqdan sonra dəstə Drambon kəndinə tərəf irəliləməyə başlayır. Onlar bir azdan yarıya bölünürlər. Bir hissə Kəlbəcər yoluna tərəf gedərək oranı nəzarətə götürür.
Digər dəstə isə «Rus bulağı»nı ələ keçirir. Qarşı tərəfdən xəbər gəlir ki, «Kəlbəcər» batalyonunun döyüşçüləri artıq buradadırlar, siz geri qayıdın.
«Tərtər»in igidləri Kasapet səmtinə dönərək oradakı hərbi bölmələrə kömək etməyə getdilər…

## HƏDİYYƏ

İsmayılın xəbəri yoxdu ki, hazırda atası Abbas əlində bir məktub sevincindən az qalır oynasın. Onun üstünə təşəkkür məktubu gəlib. Məktubun içərisinə İsmayılın döyüş zamanı çəkilən şəkillərindən də qoyulub. Bu məktub və şəkillər əl-əl gəzir, təkrar-təkrar oxunur. Məktubda İsmayıl kimi igid oğul böyütdüyü üçün atası Abbas bəyə təşəkkür edildikdən sonra göstərilirdi ki, Azərbaycan hökumətinin qərarı ilə döyüşlərdə göstərdiyi igidliyə görə İsmayıla Bakı şəhərində ev veriləcək və o, bu ölkənin vətəndaşlığına qəbul ediləcək.
«Dədəcan Abbas»ın sinəsi qürur hissilə doluydu. O, ürəyində oğlu ilə öyünür, «halal olsun!» deyirdi.
Kəşfiyyata gedərkən İsmayıla həmişə çox kömək edən bir durbin də götürərdi. Bu durbinin qəribə bir tarixçəsi vardı.
Böyük vətən Müharibəsində Berlin üzərinə Sovet Ordusunun hücumu zamanı şəkli Ramizin qənimət kimi ələ keçirdiyi durbin idi bu. Ramiz uzun müddət müharibənin yadigarı kimi onu özündə saxlamış, qarabağ Müharibəsi başlayandan sonra fikirləşmişdi ki, bəlkə kiminsə gərəyi oldu. Ona görə də həmin durbini Bakıya gətirərək «Səhər» qəzetinin redaksiyasına aparılmış və xahiş etmişdi ki, onu Qarabağ savaşında ən cəsur və igid döyüşçülərdən birinə çatdırsınlar. İsmayıl bu hadisəni belə xatırlayır: Drambon ətrafında döyüşdə idim. Hücumdan sonra məni Tərtərə çağırdılar. Burada «Səhər» qəzetinin Mahir adlı bir jurnalistlə o mənə dedi:
-- Qardaş, mən gəlib Tərtərdə kimdən soruşdumsa burada döyüşən altı hərbi biriqadanın içində ən igid, qəhrəman döyüşçü kimdir? Çrxusu dedi ki, İsmayıl Tunc—türk oğlu. Ona görə də sizi çağırtdırdım ki, qəzetimiz üçün müsahibə alım.
Dedim:
--Özüm haqqında nə deyə bilərəm ki? Sadəcə olaraq oğulluq borcumu yerinə yetirirəm. Müsahibəni başqalarından alın.
O, təkid elədi, əl çəkmədi:
--Mən istəyirəm ki, aparılan döyüş əməliyyatları haqqında şəxsən Sizin dilinizdən eşidim.
Nəhayət, razılaşmağa məcbur oldum.
(Mahir o vaxtlar «Səhər» qəzetində mənimlə bir səhifəlik müsahibə çap etdirmişdi.
Müsahibə götürəndən sonra dedi:
-- şəki şəhərindən Ramiz adlı bir oxucu qəzetimizin redaksiyasına bir durbin gətirərək deyib ki, bilirəm, cəbhədə durbin azdır, faşistlərdən qənimət götürdüyüm bu durbini Azərbaycanın ən cəsur, ən igid döyüşçülərindən birinə çatdırmağnızı sizdən xayiş edirəm.
Məndə sordum-soraqladım, bu bölgədə sizi isnad verdilər. Ona görə də bu hədiyyəni sizə təqdim etmək istəyirəm.
Mən dedim:
--Belə bir hədiyyəni mənə layin görürsünüzsə, çorx sağ olun! Xayiş edirəm ki, mənim ən səmimi salamlarımı Ramiz kişiyə (indi o, rəhmətə gedib) çatdırarsınız. Onu əmin edin ki, hədiyyə göndərdiyi durbindən Azərbaycan əskərləri dgyüşdə yetərincə faydalanacaqlar.
(Həmin durbin dgyüşlərdə mənim çox işimə yaradı).
O vaxtlar Türkiyədə nəşr olunan «Ərəblər», «Sabah» və digər qəzetində də mənim haqqımda yazılar dərc olundu. «Sahil» qəzetində isə mənim çağrışımı sərlövhə seçmişdilər: «hər kəs Azərbaycan cəbhəsinə qoşulmalılır!».

# HUCUM ƏMƏLİYYATLARI

İndii ismayıl həmin dürbinlə Dranbon kəndinə tərəf baxırdı. Hər ağacı, hər kolu, hər daşı diqqətlə nəzərdən keçirtdi. Düşmənlər bu kəndin çox uca bir yüksəklikdən mövqe tutmuşdular. Həmlə edib orəni almaq müşkil bir məsələ idi. Müşküllüyü ermənilərin əlverişli döyüş şəraiti yaradırdı. Burda yalnız bir yol qalırda—az bir dəstəylə onların arxasına keçib başlarını qatmaq, həmin anda qarşıdan isə güclü hücuma keçmək.

Nəzərlər Vəzir Orucova, İsmayıl Tunca və Süliddin Yusifova dikildi.

46 nəfər dgyüşçü yaralanda. Rəhbərlik Vəzirlə İsmayıla tapşırıldı. Bu yerlərə yaxşı tanış olan Şakir bələdçi müəyyən edildi.

Dəstə Darambona tərəf 7 saat yol getdi. Dolayı və gizlin yollarla bəzən əyılə-əyilə, bəzən sürünü-sürünə, düşmənlərə görünmədən dərəylə, təpəylə, kol-kosun arasıyla həmin yüksəkliyin arxasına keçmək çox əziyyətli, təhlükəli vəz or iş idi. Həradam günün günorta çağı heç bir qorxu olmadan belə piyada gedib o biri yüksəkliyə çıxa bilməzdi. Amma vətən eşqi, düşməndən qisas almaq məqsədi bizim igidləri itgisiz mənzil başına çatdırdı. Hissə bu uca yüksəklikdə ikiyə bölündü. Hərn yan bu uca yüksəklikdən aydın görünüdü.

Vəzir gzünə bir Qayanı səngər seçdi. İsmayıl da «PK»-sını qayanın üstündə qurdu. Süliddin onun sol tərəfində, İlham isə sağ tərəfində mövqe tutmuşdular. İsmayıl bu vəziyyətdə yenə fotoaparatını işə saldı. Aşağıda olan hərbi hissəmizə vəziyyət haqqında məlumat verildi. Yolda yüklü bir «KAMAZ» markalı maşın göründü. Arxasınca bir «UAZ» gəlirdi. Maşının səsindən hiss olunurdu ki, yükü çox ağırdır, deməli, hərbi susatdır.

Dəstənin üzvləri Vəzirlə İsmayıla baxdılar.

Vəzir:

-- Atəş!-əmrini Verdi.

Əmrlə bərabər Vəzirin qumbaraatanı guruldadı. «KAMAZ» oda bələndi İsmayıl «UAZ»-ıhədəf seçdi. Güllələr maşını xəlvirə döndərdi. İki erməni zabiti elə maşının içində dehik-deşik olub canlarını tapşırdı. Sürücü isə maşından yerə atılıb kolun dibində yatır. O, qəfil atəş açaraq Mahiri yaralayır. Uşaqlar onu diri tutmaq istəyirlər. Erməni gələcək aqibətini fikirləşib gülləni öz başına çaxır. İlqar hikkəsindən onun sinəsinə bir neçə atəş açdı.

«Lənkəran» və «Qurtuluş» batalyonları nədənsə döyüş zonasından geri qayıdırdılar. Yolda «Tərtər Batalyonu» ilə qarşılaşdılar. Onlara qoşulub hücum mövqeyinə döndülər.

Vəzirlə İsmayılın 46 nəfərlik dəstəsi düşmənin arxasında fırtına qoparmışdı.

İrəlidən tanklar və canlı qüvvələr hücuma keçmişdilr. Toplar guruldayırdı, Pulemyotlar, avtomatlar ara vermədən şaqqıldayırdılar. Ermənilər siçovul kimi ora-bura qaçıb, canlarını qurtarmaq tstəyirdələr. Lakin güllələr onları ot kimi biçirdi.Vəzirlə İsmayıl arxalarını qayaya söykəyib düşmənlərin üstünə od yağdırırdılar. Havadan barıt qoxusu gəlirdi. Tüstü hər yanı bürümüşdü. Mərmilərin, güllələrin səsi dərələrdə, qayalarda əks-səda verərək qulaq batırırdı. Aləm bir-birinə qarışmışdı.

Düşmən tərəfdən bir tank görünürdü. O, atəş aça-aça irəliləməyə başladı. Vəzirlə İsmayıl qumbaraatanlarla tankı nişan alırlar.

Bir atəş, iki atəş… Tank tüstülənib dayanır.

Mayıl yaralı-yaralı döyüşür. Vəzirlə İsmayıl tutduqları mövqelərini dəyişirlər. Bizimkilərin iki tərəflə hücumu qarşısında ermənilər dürüş gətirə bilmirlər. Onlar

Drambonu tərgidib Koçaqot kəndinə tərəf qaçırlar. Düşməni tum kimi çırtlayan Vəzirlə İsmayıl onlardan əl çəkmirlər. Onların gülləlləri ermənilərі hər yerdə düşmən cəsədlərilə dolur. Heyif ki, müharibənin əvvəlindən həmişə, hər yerdə qəhrəman kimi vuruşan ağıllı məsləhətlərilə hamının karına gələn və bütün döyüşçülərin sevimlisi olan Oruc kişi də bu savaşdan həlak oldu!



Beləliklə ən güclü və strateji nöqtə sayılan Drambon ələ keçirilir. Qələbə çox vaxt qurban tələb edir. Əqidə, məslək yolunda həlak olmaq isə şərəfdir!

Döyüş bir az səngiyir. Komandirlər ətrafı gəzib öz əsgərlərini axtarırlar. Ölən və yaralananlar çoxdur. Düşmənin çəkildiyi mövqe yaxın yerlərdə bunlar daha çoxdur. Elə meyidlər var ki, düşmənin on metirliyində, həm də açıqlıqda qalıb. Hansı yolla olur-olsun, ölənlərin hamısı götürülməlidir. Yenə Vəzirlə İsmayıl imdada çatır. Onlar əlavə qüvvə götürərək sağdan və soldan qəfil güclü həmləylə ermənilərі çaş-baş salırlar. Bu döyüşdə Suliddin çox böyük hünər göstərir. Erməni leşləri üst-üstə qalanır.

Bu döyüşdə yaralılara kömək göstərərkən igib bir oğlan, yaxşı bir dost və gözəl insan olan Kamil həkim də həlak oldu!

Meyidlər açıq taladan götürüldü.

Drambobda olan hərbi hissələrimiz növbəti döyüşə hazırlaşırlar. Qarşıda Koçaqat və Poqosaqmer kəndlərinə hücum dururdu. Əməliyyata sabah başlanacaqdır.

Vəzir və İsmayıl 42 nəfərlik kəşfiyyat dəstəsini götürüb həmin kəndlərə gedirlər. Ermənilər qorxularından Koçaqotu boş qoyub qaçmışdılar.

Vəzir durbinlə ətrafa baxırdı. Gördü ki, Çıldırana gedən yolla sursat aparan maşınlar irəliləyir. Rabitəçi mövcud vəziyyəti arxaya xəbər verir. Bizim hissələr həmin səmtə hücuma keçdilər.

Vəzirin, İsmayılın və Suliddinin olduğu dəstə isə pusqu üçün dərədə bir bərə seçib ermənilərі gözləməyə başladı. Vəzir komandirliyi İsmayıla tapşırıb, Suliddini və Qoçunu özüylə götürərəkbaşqa bir səmtə çəkildi və pulemyotunu orada qurdu, qumbaraatanı hazırladı. İki düşmən tankı həmin istiqamətdə sürətlə gəlməyə başladı. Atəş məsafəsinə çatanda Vəzirin qumbaraatanın açılmasıyla tankın birinin olavlanması bir oldu. Suliddinin atəşi ayağını sürüyən bir ermənini torpağa sərdi. Obiri tank yerində fırlanıb geri dönmək istəyərkən İsmayılın atəşi açıldı, tank yanmağa başladı.Tankdan çıxan ermənilərі güllələr quş tək dənlədi. Vəzir bir piyadılıların döyüş maşınını («BTR») da sıradan çıxarır. Ermənilər bu vəziyyəti görüb arxadan gələn «Piyadalıların zirehlimaşınından»(«BMP»)tökülərək geri qaçırlar. Onlar kənardan öz döyüş maşınlarının yandırmaq istəyirlər ki, bizimkilərə qalmasın. İsmayılın öləni ölür, sağ qalanı başını götürüb qaçır.Bu döyüşdə Vəzirin həm kənlisiHafiz şəhid oldu. Vəzir isə sol budundan ağır yaralınmışdı…

**ERMƏNİLƏR HAQQINDA DEYİLƏNLƏR**

Ermənilər daim qana can atmış, ixtilaflaryaratmış, qırğınlara səbəb olmuş, terrorlar törətmiş.

«Böyük Ermənistan»xülyası ilə türklərə qarşı həmişə soyqırım siyasətini həyata keçirmiş və nəticə etibarı ilə özlərinin də qanlarının tökülməsinə bais olmuş,

qırılmışlar, həm özləri üçün, həm də digər xalqlar üçün fəlakətlər, faciələr törətmişlər. Ona görə məşhur adamlar onların iç üzünü eybəcərliyini göstərən fikirlər söyləmişlər.

## İSMAYILIN DEDİKLƏRİNDƏN

**Atamın bir vəsiyyəti həmişə mənim üçün müqəddəs olubdur: «Oğul səni böyütmüşəm, boya başa çatdırmışam ki, Türk dövlətinə xidmət etdiyin kimi gedib mənim anna vətənim Azərbaycanında keşiyində durasan». Və məndə gəlib ata vəsiyyətiylə boynuma qoyulmuş vəzifəni yerinə yetirərəm.**
**Torpaq heç kəsin şəxsi mülkü deyil. Xalqın özünə məxsuz olan o torpaq !!o namus o qeyrət bir gün azadlığa çıxarıq.**
**Allah ulu öndər Atatürkə rəhmət eləsin! Deyib ki, bir türk dünyaya bələddir. Əksini iddia eləyən varsa, gəlsin sübüut edim. «Türkün türkdən başqa dostu yoxdur». Bunu da türk xalqının xilaskarı Mustafa Kamal Atatürk deyib.**
**İndi ikilli ölçüylə bütün münasibətlərə baxan dünyanın özü bu sözlərin möhtəşəmliyinə dəlildir. Elə bir dünya iki qütbə bölünübdür. Bunların birində həmişə günahı olmadan günahkar sayılan və qırğınlara sürüklənən müsəlman dünyasıdır.**
**Gözəgörünməz Ulu Tanrı bizim köməyimiz olsun!**
**«Türkün türkdən başqa dostu olmadığını Çanaqqala döyüşçüləri də təsdiq etdi. Bu döyüşlərdə azəri türkləri türk qardaşları ilə birlikdə vuruşurdular, qan tökürdülər, şəhid olurdular,amma öz soydaşlarını tək buraxmırdılar.**
**Bakıda «Şəhidlər xiyabanı»nda Azərbaycan uğrunda şəhid olan türk ordusunun əskərlərinə ucaldılmış əzəmətli abidə bu qardaşlığın, bu dostluğun əbədi və əzəli abidəsi deyilmi? Və nəhayət, məni və mənim kimi neçə-neçə türk oğlunu özümüzə doğma vətən sandığımız Azərbaycan uğrunda döyüşlərə qatan təəssübə, istəyə dostluqdan, qardaşlıqdan ayrı nə ad vermək olar?**

**Bu yolu bizə dədə-babalarımız vəsiyyət eləyib, bu yolu bizə türk dünyasının şöhrətli və görkəmli övladları musafa Kamal Atatürk və Məmm Ədəmin Rəsulzadə qoyub gediblər.**
**Türkiyədə orduya döyüşə əsgər yola salanda deyərlər ki, oğlum, üzünün ağı ilə ya şəhid ol, ya qazi ol və qayıtsan, üzünün ağı ilə də geri qayıt.**
**Qurban Bayramı Günü kəsiləcək qurbanlıq qoçların başına xına qoyarlar. Biz tərəfdə döyüşə gedən əsgərlərin də başına xına qoyarlar. Yəni «Qəzan mübarək olsun!».**
**Azərbaycanın, ikinci anna vətəninin uğrunda qanımın axmasını mənim əbədi, axirət dünyamda Allahım qiymətləndirəcək və inşallah əgər günahlarım varsa, onları yüngülləşdirmək üçün «savab dəftərinə» yazılacaq.**
**Mənim fikrimcə bütün Türkiyə azəriləri də, Avropada, Amerikada, bir sözlə, dünyanın hər yerində yaşayan azəri türklərinin hər biri də Azərbaycanın qədrini bilməlidir. Vətəndən uzaqda yaşayanlar vətənin qiymətini daha çox anlayır.**
**Mən Türkiyədə yaşayıram. Ömrü boyu Azərbaycan haqqında atam-anam danışıb, mən dinləmişəm. Onlar məndə bu mənlətə qarşı elə ülvi məhəbbət, elə saf və pak istək yaradıblar ki, Azərbaycanı görmək ən böyük arzum, diləyim olub. Həmişə Allahıma yalvarmışam ki, mənə o torpağa getməyi, o vətəni ziyarət etməyi nəsib elə! Türkiyədə yaşamaq da mənim üçün şərəflidir, Azərbaycanda yaşamaq da. Amma bura dədəmin, nənəmin, babamın, ulu əcdadımın vətənidir, bu torpaqlarda mənim doğmalarımın qəbirləri uyuyur, onların ruhları Azərbaycan adlı bir vətənin səmasında dolşır. Düzdür, bu yurdda çox millətlərin nümayəndələri—ləzgiləri, talışlar, avaralar, yəhudilər, ruslar—yaşayırlar. Bunların hərəsi bir etnik qruppa mənsub olsa də**

**Azərbaycanın vətəndaşıdırlar, onlar də gərək buy urdu türklər kimi sevsinlər, bu torpağı göz bəbəyi kimi qorusunlar. Daha ermənilər kimi nankorluq etməsinlər.**

**Bir azəri türkü və Türkiyə azərisi kimi mən çox millətçi Adamam və hər zaman hər iki torpağa böyük sevgim olub. Vətən olmayan yerdə millət də olmur. Vətəni birinci sevməyi bacarmalısan ki, millətini sevəsən, dünyanın harasında olsan da millətindən olanın ən pisini belə başqasının ayağına verməyəcəksən. Əgər sən öz xalqına hörmət bəsləmirsənsə, heç Kim sənə hörmət bəsləməyəcək, heç doğma bacı-qardaşın da. Türkiyədə də bu üzdəniraq ermənilərdən yaşayanı çoxdur. Elə İstanbulun özündə 100 minə yaxın erməni var. Onların dədə-babaları da Türkiyədə yaşayıblar. Amma çox Xain və satqın millətin nümayəndələri olduqlarına görə bəzən öz ermənilikləri danıb. «Türkəm»-deyirlər.**

**Qorxalq millət olduqlarına görə onlar Qarabağı ala bilməzdilər, havadarlarının hesabına aldılar. Ermənistan hazırda Amerikada, Fransada, İngiltərədə, ümumiyyətlə dünyada yaşayan imkanlı ermənilərin maddi köməyi hesabına yaşayır.**

**Belə bir şey eşitmişəm ki, tarixən onların dünyadakı sayı üç milyonu keçəndə elə bil qaşınma tutur bu bədbəxtləri, gərək azalsınlar ki, özlərinə gəlsinlər. Türkün kim olduğunu ermənilər yaxşı bilir. Onları silmək lazımsdır, bunun vaxtı çatıb. Böyük dövlətlərin çaldıqları zurnaya oynadıqlarına baxmayın.**

**Bir əhdim var----Allah –təala mənə imdad versin, Qarabağa Azərbaycan bayrağını sancım, sonra ölsəmdə əhtim olmaz. Onu da deyim ki, müharibə göründüyü kimi deyil müharibə çoxlu qurbanlar tələb edir. Yaşamaq üçün öldürməlisən. Öldürmək isə asan iş deyil. Müharibənin nə olduğunu bilmək üçün müharibə günlərini yaşamalısan, ölümü, qanı-qadanı öz yanında hiss etməlisən. Buna hər adam dözə bilmir. Məsələn, «Cəmdə mənimlə gəlmişdir, 3-5günlük qalıb getdi. Sonra ondan heç bir xəbər olmadı. Sağolsun, yenə o gəlmişdi! Allah onun işlərini rast gətirsin! O vaxt 3-5gündə olsa ürəkdən döyüşən hər bir kəsi mən qəhraman hesab edirəm.**

**Mənim varlığım iki qütbdən ibarətdir—birini adı Azərbaycandır o birinin Adı Türkiyyədir. Bizim «Tunclar» soy kökü Azəri Türklüyüylə fəxr edir. Bizim Koroğlumuz,Babəkimiz, Cavanşirimiz var. Bizim ulu sərkərdələrimiz olub. Ona görədə biz mütləq qalıb gələcəyik! Yolumuz müqəddəs yoldu. Çün ki, haqq yoludur, vətən torpaqlarının yarı tapdağından azad olunmasına gedən yoldur. Bizim ayrı xalqların, ayrı dövlətlərin torpaqlarına göz tikməmişik. Bütün xalqlarla qardaş kimi yaşamaq istəyirik. Lakin heç zamn razı ola bilmərik ki, o boyda nəhəng Osmanlı imperyasından bir tikə qalan Türkəyyənin və cəmi yüz səkksən il əvvəl 410min kvadrat klometr ərazisindən indii cəmi on yeddi faizi qalan Azərbaycanın bir ovuc torpaqlarının düşmənlər yenə zəbt eləyib öz torpaqlarına çevirsinlər. Biz bu amal, bu əqidə uğrunda vuruşuruq və fəxr edirim ki, məndə müqəddəs savaşda bir əsgər kimi öz borcumu yeainə yetirirəm Ona görədə ölüm belə məni qorxutmur. Ömrümün sonuna qədərdə bu mübarizəni həyatımın əsas qayəsi hesab edəcəyəm!**

**Sevgi**

İnsani doğulur yaşayır və həyatdan gedir. Bunlar ta yaranışdan həyat fəlsəfəsinin nizamlanmış və heç kəsin iradəsinə tabe olmayan qanunlarıdır. Bu dünya durduqca pozulmayacaq, bu üçbücaq düturu idrakıyla duyub anlayanlar aqil insanlardılar və onların qəldində heç vaxt, heç zaman pis deyilən bir şey ola bilməz. Niyə də olsun ki?! Axı, bu dünyanın faniliyini anlayırlar o insanlar Fanilikdə isə əbədilik yoxdur, ötərilik var və bu ömür ötəridirsə, yaxşılıq və məhəbbətdən bir əməl kimə lazımdır?! Kiminsə pis əməlinə görə yaxşı əməllərinizdən əl çəkməyin! Düşməniniz mərddisə, ona da yaxşılıq eləyin! Bunun əvəzi sizə çatmasa da, övladlarınıza çatacaq. Bütün

insanları, varlığı Sevin ki, siz də seviləsiniz, siz idə sevsinlər.sevgi üçün yaşayı, yaşamaq üçün sevməyin! Ömrünüzü hörmət qazanmağa həsr edin, qazanmaq üçün hörmətə yox! Ürəyiniz dağ çiçəyi kimi təmiz, bulaq suyu kimi duru olsun! Onda deyə bilərsiniz ki, yaşadım. Mənasız yaşamaqdansa mənalı ölüm yaxşıdır! Sevgisiz ömür-bir zərrə toz və… külək.

İnsana həyatda həyat yoldaşı lazımdır həm də ona görə ki, biri-birinə həyan olsunlar, bu düyanın qayğılarını böyüldürüb çəksinlər, sevinc və kədərlərini bölüşdürdükləri kimi.

Ailə qurmaq həyati zərurətdir və bu zərurət reallığa çevirmək o zaman xoşbəxtliyə səbəb olur ki, orada qarşılıqlı sevgi və məhəbbət olsun. Onda ailə bəxtəvərliyə qovuşur.

İsmayılın Rasim adlı bir dostu vardı, Şamaxıdan idi, Bakıda yaşayırdı. Şəhərə çatan kimi İsmayıl onunla görüşdü. Birlikdə Rasimgilə getdilər. Bir az dərdləşdilər, çay-çörək süfrəsindən sonra İsmayıl şəkil albomuna baxmağa başladı. Nəzərləri bir qız şəklinin üstündə ilişib qaldı. Onun çöhrəsindən bir məsumluq, bir doğmalıq yağırdı. Şəklə xeyli baxandan sonra ismayıl Rasimdən soruşdu:

--Bu qız kimdir?

Rasim onun göstərdiyi şəklə baxıb cavab Verdi:

--Xalam qızıdır, institutda oxuyur.

İsmayıl bir də qızın şəklinə baxdı. Onun gözlərindən ürəyinə bir nur süzüldü. Bu nurda bir mehr, bir isti duyğu vardı. Bütün valığını bir xoş ovqat bürüdü. Sanki bu qızla çoxdan idi ki, tanışıydı. Onun baxışlarının sehrindən, təbəssümünün ovsunundan nəzərlərini yayındıra bilmirdi.

Rasim İsmayıldakı heyranlığı hiss edib dedi:

-- Hələ ailə şəyatı qurmaq fikrində deyil.

İsmayıl özündən asılı olmayaraq az qala dostuna yalvardı:

-- Nə olar, bu qızı mənə göstər!

Rasim tərsə düşüb razılaşmırdı, inadından dönmürdü ki, dönmürdü. «Olmaz!»-deyib durmuşdu. İsmayıl isə xahişində israr edirdi. Bu söhbət Rasimin həyat yoldaşı Azadə xanım şitdi. O da Rasimdən xahiş etməyə başladı:

-- Nə olacaq ki? Apar göstərər də. Dostunun xahişini yerə salma. Onsuz da hər şey qismətdən asılıdır.

Rasim ,nəhayət ki, yarı zor, yarı xoş razılaşdı. Qərara gəldilər ki, birlikdə xalasıgilə getsinlər.

İsmayıl artıq qızıq adını da öyrənmişdi. – Mətanət. Bu ad da könlünə  yatmışdı.

İsmayıl yol boyu özünü Mətanətin yanında necə aparacağını, orada danışası olsa nə deyəcəyini götür-qoy edirdi. Fikirləşdikcə onu bir həyacan bürüyürdü. Ən ağır döyüşlərdə belə belə özünü itirməyən, ölümdən pəhsinməyən İsmayıl Mətanətlə qarşılaşanda özünü itirməyəcəyinə əmin deyildi. O, bir-iki günlüyə icazə alıb, Bakıya gəlmişdi. Hələ də döyüşürdü. Döyüşçü İsmayılın qardaşını səbirsizliklə gözləyirdilər.

Rasimgildə öyrənmişdi ki, Mətanət Abşeron Rayon İcra Hakimiyyətində işləyir. Bir üniversitet qurtarıb, indisə ikinci ali təhsil alır—İqtisadiyyat Universitetinin 3-cü kursunda oxuyur

## İSMAYILIN DEDİKLƏRİNDƏN

**Rasimlə bərabər getdik onun xalasıgilə. Mətanət xanımı gördüm. Elə bil ürəyimə bir eşq doldu, ona elə oradaca aşiq oldum. Demək, qismətim, alın yazım beləymiş ki, Türkiyədən, İqdırın Haqveyisindən gəlib burada, ata-baba vətənimdə öz azəri türkümün qızına vurulum. Deyəsən, o da mənə biganə deyildi, duyurdum ki,biri-**

**birinizi bəyənmişik. Varlığımı xoş bir əhval-ruhiyyə sarmışdı. Bilirsiz, məhəbbət çox geniş məna kəsb edən bir məvhumdur. Bu hissin çövhərində dünyada insanlığa şamil olunan yaxşı nə varsa, hamısı uyuyub, mürgüdədir. Oyatsan, varlığında bir çalxanma, bir Alov püskürtüsü, bir pərvəriş hiss edəcəksən. Mənim də bütün bədənimi belə duyğular bürümüşdü. Mənim Mətanətlə görüşməyimə səbəb edən o fotoşəklə və bir də Rasim nə qədər minnətdar idim! Bir təsadüf bizi rastlaşdırdı və təsadüfən zərurət doğulduğunu bir daha həyat təsdiq etdi.**
**Deyəsən, doğrudan da biri-birmizə əməlli-başlı vurulmuşduq və elə sevgi də bu idi**

**Yenidən qan iy**

Havanı qan qoxusu bürümüşdü. Torpaqdan qan iyi gəlirdi. Sular qan rəngində axırdı. Günəşin işığı da Qana boyanmışdı. Dünya qan içində idi. Və bu qan dünyasında insanlar biri-birinin qanını içirdi. Ölüm çox adiləşmişdi. Çünki adamlar ölüm və öldürməyə vərdiş etmişdir. İnsan ölümü hər şeyin ölümündən ucuz olmuşdu elə bil.
Dünyanın bu çağında İsmayıl Qana bələnmişdi. Bədənindən, başından qan fışqıqıdı. Kəfən dediyi əsgər paltar büsbütün qan içində idi. Onun Qanı axıb torpağın da rəngini dəyişdirmişsə-əvvəlcə al qırmızı, sonra qapqara. Sanki torpaq Qana yerikləmişdi—elə qan içirdi.
İnsanlar burada hər gün öldürməklə məşhuruydular və bunu qəhrəmanlıq sayırdılar. Daha fikirləşmirdilər ki, onsuz da hər gün minlərlə insan köçüb gedir bu dünyadan və onların özlərini də öldürəcəklər, nə fərqi varmış ya Əzrayıl öldürdü, ya insan? Yəni öləcəklərmi?
İsmayılı ölüm ağuşuna alıb aparanda dostları onun qabağını kəsiblər, qoymadılar ki, əcəl bir igidi də yesin.
Görünür, Allahı İsmayılı çox istəyirmiş, onun vaxtsız ölümünə qoymamışdı.
Yaradan bəndəsinin ürəyini özündən yaxşı bilir. Əlbətdə, bilirdi ki, İsmayılın ürəyi təzə qar kimi təmiz və pakdır, orada məhəbbətdən özgə heç nə yoxdur.
Ölüm İsmayılın gözlə qaşının arasındaydı, girəvə gəzirdi.
Deyirlər ki, insan anna bətinində olanda onun ömrü proqramlaşır. Qismətinə neçə il yazılırsa, ən çox bir o qədər yaşaya bilərsən, bundan uzun ola bilməz. Qısaltmaq isə olar. Bu da ki, insanın öz əlindən və Yaradanın ixtiyarındadır. Yenə də deyirlər ki, insanın ürəyi bir sutkada ton 800 kq Qanı çəkib vurur damarlara. Özü də cəmi 5 litir Qanı və insanın ömrü boyu. Əgər bu, ömürlə ölçülsə, yazıq yumruq boyda ət parçasının yükünə görəsən ayrı nə dözə bilər? Bir yandan da insan ağılsızlığı zülmə salır onu-siqaret, içki, stresslər, qayğılar, qan, qada, vurulan yaralar.
İsmayılın bu yaralardan və sel kimi axan qanından sonra nəbzinin vurması möcüzə idi.
Onun yaralanmasını Haqveyisdə atası «Dədəcan Abbas» eşitmişdi. Elə bil dünyası dağılmışdı, yurdu viran olmuşdu, evi bərbad edilmişdi. Gözünün işığı oğlunun yaralı vəziyyətini təsəvvürünə gətirəndə az qalırdı dəli olsun. Azərbaycanacan atırdı. Amma bu, heç də yüngül məsələ deyildi. Nə qədər kağız yığını hazırlamaq lazım idi!..
Bütün qohum-əqrabaya xəbər çatmışdı. Hamı sarsılmışdı. İsmayılın gözəl ürəyi və təmiz əxlaqı onu bütün tanıyanlara sevdirmişdi. Doğmaları və yaxınları onun xətrini çox istəyirdilər. İstambulda yaşayan bacıları Gülçün, Seyran və Ceyran, qardaşı Abdullah, antaliyada yaşayan və orada bank müdürü işləyən o biri qardaşı

Qəzənfər bəy? Əmisi uşaqları və digər yaxın qohumları onun üçün ciddi narahatlıq keçirirdilər.
İsmayıl isə müalicə olunurdu.
Onun ürəyinin parası Türkiyədə, parası isə döyüşçü dostlarının yanında qalmışdı.
Atası Abbas gəlib İsmayılı Azərbaycanda tapa bilmişdi. Oğlunun yaralı halı kişiyə çox pis təsir etmişdi. Bu dərd Türkiyəyə qayıdanan sonra «Dədəcan Abbası»ı yaşamağa qoymadı…

**Tərxis**

O dövr Azərbaycan rəhbərliynin səriştəsizliyi və intisamsızlığı ucbatından ordu də pərakəndəlik, özbaşınalıq və «mənəm-mənəm»lik baş alıb gedirdi. Zər rayon özü üçün bir hərbi dəstə yaratmışdı və hərəsinin də özünün öz «qayda-qanunlar» vardı. Bu hissələr yalnız könüllülərdən təşkil olunmuş döyüş təcrübəsi olmayan, hərbin sirlərini bilməyən naşı, lakin vətənini sevən adamlar idi. Onların başı üzərində komandirlik edənlərdən çoxunun də bu sahədə qəabiliyyəti yoxdu. Bəziləri heç hərbi xidmətdə də olmamışdılar. Texnikanı idər edə bilənlər çox azıydı. Bəzi kbnülllülər heç silah atmağı da bacarmırdılar. Yevlax Yun Zavodunun direktoru Surət Hüseynov özünə bir polk yaratmışdı, Talış-Lənkəran Zonasında Əlikram Hümbətov özü üçün bir hərbi hissə düzəltmişdi, təşkil etmişdi, Goranboyda biri vardı, ağdam, Bərdə, Mingəçevir… Ümumiyyətlə, hər bir rayonun özünün ayrıca hərbi dəstəsi vardı və bunlar, əslində dövlətə tabe olmayan qüvvətlər idi, hamısında ümumi nəzarətdən çıxmışdı. Və digər səbəblərlə yanaşı, bütün bunlara görə də Azərbaycanın ermənilərə qarşı apardığı müşaribə nizamsız, başıpozuq və çox vaxt uğursuzluqla nəticələnən bir müharibə idi.
Faciələrdən biri də orasındaydı ki, tamamilə ayrı bir sahənin Adamı olan, müharibədən başı çıxmayan, heç danışığına nəzarət etməyi bacarmayan Rəhim Qazıyev adlı birisini Azərbaycanın Müdafiə naziri təyin etmişdilər.
Hansı bölgədə vəziyyət kəskinləşdirdisə, ora təcrübəli hərbçiləri deyil, yalnız pafosla danışmağı yaxşı bacaran, rəhbərliyə küçələrdən gəlmiş məqsədli adamları göndərirdilər. Buna görə də həm döyüşənlər arasında, həm də mülki vətəndaşlar arasında, itgin çox olurdu, bir-birinin ardınca gələn uğursuzluqlar bizi izləyirdi. Və açığını deyim ki, bu məğlubiyyətlərdə həm də taxt-tac hərisliyi, tamah, satqınlıq və xəyanət də az rol oynamırdı. Zaman hər şeyi xəlbirləyib üzə çıxaracaq. Gələcəkdə gün kimi aydın olacaqdır ki, bu tarixi ləkə kimlərin hesabına və nə üçün Azərbaycan tarixinin qara səhifələrinə pərçimləndi.
Artıq ağıllı adamlar başa düşürdülər ki, yuxarılarda oyunlar gedir və kasıb balaları bu oyunların qurbanları kimi döyüşlərdə şəhid olurlar. O vaxtın vəzifə sahəillərindən və imkanlı adamlarından heç birinin övladı düşmənlə üz-üzə olan döyüşlərdə iştirak etməmiş, bəziləri adlarını ya arxa cəbhənin siyahısına, ya da elə-belə siyahılara saldıraraq orda-ğurda kef çəkir, bəziləri isə Azərbaycandan uzaqlara göndərilib gizlədilirdi. Döyüşən də, ölən də kasıbların qeyrətli uşaqları idi.
İsmayıl Tərtər bölgəsində gedən müharibədə əsil türk oğlu türk olduğunu (nə fərqi var ki, ya azəri türkü, ya da Türkiyə azərisi) öz igidliyi cəsarəti, döyüş bacarığı və vətənpərvərliyilə sübut etdi. O, ağıllı tədbirlərilə neçə-neçə dostunu ölümün ağzından xilas etdi. Bütün təhlükəli kəşfiyyatlara özünə qardaş bildiyi qəhrəman Vəzir Orucovla birlikdə rəhbərlik etdi, ən dəqiq məlumatlar əldə edib, hücumların Zəfərlə başa çatmasına zəmin yaratdı. Bu bölgələrin ən ağır və ən dəhşətli döyüşlərində iştirak edirdi, şəxsən özü duşmənin canlı qüvvəsi və hərbi texnikasını ağır itgilərə məruz qoyurdu. Hətta onun da başına ermənilər Vəzirin başı kimi

qiymət qoydular. İsmayılın Adı dillər əzbəri oldu, haqqında əfsanələrə bənzər əhvalatlar danışılırdı, göstərdiyi igidliklər ağızdan-ağıza gəzirdi, bütün Azərbaycana yayıldı.
Döyüşdə göstərdiyi sücaətə və igidliyə görə Respublikanın o vaxtkı Prezilenti Əbülfəz Elçibəy Tunc İsmayıl Abbas oğluna «Azərbaycanın Milli Qəhrəmanı» Adı verilməsi haqqında Fərman imzalandı.
Nəhayət, İsmayıl ordudan, özü də istəmədən, tərxis olundu, daha doğrusu onun tərxis olunması üçün məcburi şərait yaratdılar. O, döyüşlərdən aralanmasaydı, kimi bilir, başına hansı oyunları gətirəcəydilər?!
O, döyüş yoldaşlarından ağlaya-ağlaya ayrıldı. Dedi ki, mütləq yenə döyüşəcəkdir, mənfur ermənilər son nəfərinədək müqəddəs Azərbaycan torpaqalından təmizlənənə qədər vətənindən ötrü daim bir əsgər olaraq qalacaq. Harda olur olsun ürəyi Azərbaycanla, onun mərd, igid oğulları ilə birlikdə döyüşəcəkdir.

**İsmayılın sonrakı taleyi**

İsmayılın  Azərbaycanda qohumlarından heç kimi yox idi. Mətanətgilə dostlarını elçi göndərdi, Aydın, Rasimi, Rasimin özünü…
Rəhmətlik Rasim xalasının qızı olan Mətanətə elçi getmək istəmirdi. Bunun adətdən kənar bir şey sayırdı.  Ama yenə yoldaşı Azadənin xaişləri Rasimin inadını yumuşaltdı.
Lakin Mətanətin atası və anası İsmayılın elçilərinə «yox» deyib, onlırı pərt halda geri qaytarmışlar. Və konkret olaraq demişdilər ki, bu iş baş tutması sevda deyil. Bir yolluq çəkilib farağat otursun yerində.
İsmayıl Mətanətlə gizli görüşlərini yenə davam etlirmişdi. Atasının-anasının heç vaxt yumuşalmayacaqlarına inanan Mətanət İsmayılın təklifilə razılaşmış və onlar qəti qərara gəlmişlər. Bundan sonra İsmayılla Mətanət heç kimi xəbəri olamadan «ZAKS»-a getmiş və kəbinlərini kəsdirmişdilər. Bu «özbaşınalığı» eşidəndə Mətanətin atası Əşrəf kişi və anası Ədilə möhkəm əsəbləşmişdilər.
1993-cü ilin avqustunda onların toyu oldu. Toy olan günü yüksək rütbəli məmur məclisdə İsmayıl yaxınlaşıb dedi:
-- Qarabağda qəhrəman kimi döyüşmüsən böyük hünərlər göstərmisən. Mən sənə toy hədiyyəsi olaraq Bakının mərkəzində bir yaşayış mənzili bağışlayıram, gedin yaşayın.
İsmayıl təklifdən çox nəzakətlə imtina edərək dedi:
-- Allahın rızası ilə vətənimə xidmət etmişəm, keşiyində durmuşam onun qiymətini Allah verə bilər.
Təklif iki-üç dəfə təkrar olunsa da öz inadında qalıb israr etdi, razılıq vermədi, dedi:
-- Haqqım olmayan bir şeyi mən qəbul edə bilmərəm!
İsmayıl bu hərəkətni belə əsaslandırırdı: «Vətənim uğrunda tökülən bir damcı qanımın əvəzinə heç bir dünya malı mükafat ola bilməz. Mən hansısa məqsədə görə doğma Azərbaycanıma gəlib, burda düşmənlə vuruşmamışam. Nuru Paşanın övladı heç vaxt öz yurduna təmənnalıq məqsədlə xidmət etməz!».
Sonra dolstlarına üz tutdu:
-- Mən İsmayıl Tunc müharibə meydanında öz sözümü demişəm. Övladlarımı da belə tərbiyə edəcəm. Kəbin kəsdirməyə gedərkən İsmayılın tutduğu bir iş şirin söz-söhbətə səbəb olmuşdur. Mətanətə gül əvəzinə banan almışdı. İçindən belə gəlmişdi. Fikirləşmişdi ki, banan yaxşıdır, çünkü yeməlidir. Və bu, mətanətə çox ləzzət vermişdir. O, xeyli gülmüşdü:
-- İsmayıl sonralar deyirdi:

-- Yaxşı ki, ətrafda heç Kim yoxuydu, ikimiziydik!
İsmayılla mətanət o vaxt nigah üçün şahid tapa bilməmişdilər. Mətanət öz bacısı Sürayəni İsmayıl isə «Türk Məmməd» adlı dostunu şahid «tutmuşdular»
Mətanətin atası Əşrəf kişi əziyətkeş bir adam olub, Böyük Vətən Müharibəsinin iştirakçısıdır. İsmayıl həmişə deyir ki, anamdan sonra Mətanətin anası Ədilə xalanın çox böyük sevgisini və mehribanlığını hiss etmişəm. Onad sayagəlməz yaxşılıqlar görmüşəm. Mənim yolumda Ədilə xalanın unudulmaz əməyi olub.
İsmayılın lent yazısından:
Digər igid döyüşçülər kimi mən də Milli Azərbaycanın Qəhrəmanı Adı verildi, Prezidenti Fərmanı ilə. Lakin nə səsbdənsə, hansı «texniki qüsurlara»görə qəhrəmanlığını təsdiq edən sənədləri ala bilmirəm. İnşallah, imakan verəcəklər ki, səsim cənab Prezidentə gedib çatsın. Ondan sonra inanıram ki, bu məsələ mütləq həll olunacaqdır.

**İSMAYILIN DEDİKLƏRİNDƏN**

**Mən Mətanət xanımla ailə quranda söz vermişdim ki, qalıb Bakıda yaşayacam. Çünki, dəfələrlə dediyim kimi, Türkiyədə Azərbaycanda mənim üçün iki ərazidə yerləşən bir doğma vətəndir.**
**Toydan sonra onunla İqdıra getdik. Yaşadığım evi görəndən sonra mətanət xanım dedi.**
**-- Elə burada Azərbaycan kimidjir. Burada Türk ləhcəsində yox, azəri türkü ləhcəsində danışırlar və Azərbaycan dilini təmiz bilirlər biz yaşadığımız yerdə öz xalqımızın adət ən-ənələrini qoruyub saxlayırıq. Novruz bayramını, «Xıdır»ı, novruzdan qabaqkı «çərşənbələri qeyd edirik, Məhərrəmliyi «matəm ayı» nı yaddan çıxarmırıq. Ümumiyyətlə, Azərbaycan xalqını inancları İqdırlıların da inancıdır.**
**Orada olarkən biz azəri türkcəsinə danışırdıq. Onu da qeyd edirəm ki iqdırlılar dünyanın bütün ölkələrində yaşayırlar, çoxu isə Avropa dövlətlərində məskunlaşıb.**
**Dünya Azərbaycanlıfların Qurultayında iştirak edən nümayəndəlrin əksəriyyəti ayrı-ayrı ölkələrdə yaşayan İqdırlı azəri türkləri idi. Onlar Almaniyadan, İsveçrədən belçikadan və digər Avropa öləklərindən gələn azərbaycanlılar idilər və çoxu məni tanıyırıdı.**
**Türkiyədə olarkən doğmalarını məndən çox mətanətə  qayğyla, sevgiylə, diqqət və məhəbbətlə yanaşırdılar. Mətanət, həqiqətən də elə istəyə layiq xanımdır. O mənim ən ağır günlərinmdə, döyüşdə ola-ola, burda kimsəsiz olduğum halda qəbul edib. Buna görə də ömrüm boyu mən arxa və dayaq həyatımın sədaqətidir, etibarlı dostu, yoldaşı kimi ona çox yüksək mərtəbədən hörmət-izzət bəsləmək mənim mənəvi borcum, onun isə bu, öz sevgisi ilə qazandığı haqqıdır. Bu borc, o biri borclardan deyil, ürəyini məhəbbətilə yoğrulmuş həyatı və halal borcudur. Çünki, o bayaq dediymi kimi, ən keşməkeşli və əzablı günlərində yanımda olub.**
**Mətanət xanımla mən Türkiyyənin bir çox şəhərini—İstanbulu,Antaliyanı,Bodrumu, İqdırı, Ankaranı, İzmiri, Biş adasını və digər yerləri gəzdik.**
**Dəfələrlə demişəm, indidə deyirəm, mənim üçün Türkiyyə də vətənimdir, Azərbaycan da. Hər iki vətəndə yaşamaq mənim üçün çox xoşdur.Azərbaycan da qalıb yaşamağı qət etməyim isə, Hacı İsməyıl kimi, Mətanət xanıma düzünü söz səbəb oldu. Bəlkə mənə burda yaşamaq Türkiyyədə yaşamaqdan daha çox çətindir. Soruşa bilərsininiz ki, niyə? Çün ki, hər şey güzarandan asılı deyildir. Azərbaycanda olaq bir milli əhval-ruhiyyə oyatmaq lazım gəlirdi.İnsanlarda milli Şur formalaşdırmağa,vətənpərvərlik hissələrini gücləndirməyə, ümumixalq mənafeyi şəxsi mənafeydən yüksək tutmaq üçün pisixoloji maddi mühüd yaratmağa ehtiyac vardır. İnsan aləminə daha çox**

**diqqətlə yanaşmaq, sivill standartlara uyğun qanunlar işləyib hazırlamaq və həyatata tətbiq etmək lazım gəlirdi. İnsanlar arasında da Türklüyü hər yerdə daha çox anlatmaq, halallıq haramdan aid etməyin vacibliyini onlara başa salmaq tələb olunurdu.**
**Azərbaycan çox gözəl və qədim vətənimizdir. Azərbaycan xalqı isə öz qürurula ilə, qüdrətiylə, maddi- mənəvi dəyərləriylə ölməyə layiq olanq bir xalqdır. Lakin yazıqlar olsun ki, 70illik sovet rejimi çox şeyi onun əlindən alıb, və çox şeyi ona qadağan edib.**
**Bilirsiniz, Lelin Həzrəti Məhəmməd Salavtılarım bir çox deyimlərini və bir çox fikirlərini özününkiləşdirib. Bir az ayrı formada, ayrı birləşmədə deyib, amma məntiq və nəticə eyni olub. Əziz Peyğəmbərimiz deyib: «İnsan hərşeydən əvvəl öz zəmanəsinin övladıdır». Lelin isə bu fikri belə ifadə edib: «İnsanın şürunu düşdüyü mühit formalaşdırır». Eyni «Loqika» deyilmi. Demək istəyirəm ki, Azərbaycanda uzun illər boyu hököm sürən sovet pisixologiyası insanları dünyadan  təcrid edib, cəmiyyəti tamamiylə ayrı yöndə tərbiyələndirib, onların şürunu həmin mühitə uyğun formalaşdırıb. İndiysə bütöv bir xalqın yeni dünyaya tez bir zamanda adabtasiyası, yəni uyğunlaşması mümkün olan bir şey deyil. Onu izzah etmək istəyirəm ki, o zaman Azərbaycanda ictimai və siyasi aura və abu-hava lazım olan səviyyədə deyildir, paklıq, şəffəflıq, qorunmurdur, açığını desək bir xaus bir anaxiya, bir cəzasızlıq mühiti hököm sürürdü.Bunlar isə bir millətçi Azəri Türkü kimi məni narahat edirdi.**

## İsmayılla üz-üzə

Adını eşidib üzünü görməmişdim.Tanış olmağı isə çox arzulamışdım. Məqsədim nəysə yazmaq deyildir, sadəcə olaraq haqqında rəvayətlərə bənzər söz-söhbət dolaşan bu qəhraman oğlanla istəyirdim.
Dostum şair Sərraf Şiruyyə Bərdənin Daşkənd kəndindəki evindən zəng etdi mənə.Dedi ki, arzusunda olduğun İsmayıl Tunc bizdədir, oda səni görmək istəyir, dur gəl.
Qapıdan içəri girəndə ilk nəzərdən mənə xoş təsir bağışlayan baxışlarla qarşılışdım. Yanında bir cavan oğlanda oturmuşdur. Şiruyyə bizi tanış etdi. Mə nonu diqqətlə süzdüm İsmayılı adi adamlardan fərqləndirən nəysə vardır, ama nəydi bilmirdim. Deyəsən, gözləriydi, dənizə oxşayırdır. Çox şirin ləhçəynən danışırdı. Azərbaycan dilini Bakıda yaşayan azərbaycanlıların çoxuna örnək ola biləcək bir təmizliklə və sərisliklə bildirdi. Boylu-buxunluydur. Hiss olunurdu ki, güclü nitqə malik pak mömin bir insandır, yəni Allah adamıdır. Onunula söhbət etmək məni yormadı, ünsiyyəti vaxta ağırlıq gətirmədi, əksinə çox maraqlı oldu. Söhbətimiz, müsahibə yönünü aldı, əslində mən belə fikirləşməmişdim, öz-özünə bu məcaraya düşdü və əlbətdə,bundan nə mən, nədə İsmayıl narazı qalmadıq. Bəlkədə elə bu yaxşıydı. Mənim suallarımdan o çox təmkinlə cavab verirdir. Hiss edirdi ki, onun ömür yolunun hər dönümü-döngəsi mənim üçün maraqlıdır, ona görə də həvəslə söhbətini davam etdirirdi və həmin söhbətin bəzi məqamları indidə yadımdadır.
Soruşdum:
--Dostlarımsız dünya necədir?
Dedi:
--Döyüşçü silahdaşlarımdan birinci Vəziri özümə qardaş bilirdim. Neçə dəfə məni ölümdən xilas eləmişdi. İgid oğul idi, cəsur bir qəhrəman idi. Azərbaycanın belə cəsur oğulları çox olsaydı, torpaqlarını itirib yazıq günlərə qalmazdı.
Vəzir Orucovdan saatlarla, günlərlə danışsam, qurtaran deyil. Bu andan ər oğlu ər kimi dünyaja da yaşadı, sözün geniş mənasındı kişi kimi döyüşdü və kişi kimidə dünyadan getdi.  Bəziləri kimi arxasından vurulmadı, Anasından çox sevdiyi vətən

yolunda gülləni alnının ortasından qəbul elədi. Bu xalq Vəzir kimi ogulları dəyərincə qiymətləndirməyi bacarmalıdır. Yoxsa qara günlü olar.
«Qurani- Kərim»in «Bəqərə» sürəsində buyurub ki, siz şəhidlərə öldü deməyin, onlar yaşayırlar və axıra qədər bizimlə bərabrdilər.
Allahın rızası ilə şəhid olan hər kəs yaşayır.
Vəzir Orucov mənim qəlbimdə yaşayır və mən onun həmişədə yaşadacağam!
Ahseta? Türkü varıydı, «Topçu İsgəndər».Allah ona rəhmət eləsin. O mənim əsil döyüşçü yoldaşım idi. Gədəbəy bölgəsində topçuluq edərdir. Çox böyük qəhramanlıqlar göstərmişdi. Topu ilə hər bir hədəfi dəqiq vururdu. O, ermənilərin ən qorxulu röyasıdır. O, igidliklə şəhid olsa da həmişə yaşayır. Gədəbəydə dəfn olunub.
Mətanət xanım «Tərtər Batalyonu»na tibb bacısı kimi gəlmişdi. Sonra da əlinə avtomat alıb çardaqlı döyüşündə iştirak elədi. Döyüşün qızğın çağıdır, mən atıram. Bir də gördüm ki, bir qız mənim avtomatımın «maqazin» lərini doldurur.
O, mənim annam-bacımdı. Mən onu hər herdə kişi kimi görmüşəm. Suliddini, Ələddinin, Elmanın, Oruc kişini igid ər kimi necə tanıyırdısa, Məlahətidə elə tanıyırdım, namuslu , vicdanlı, və qeyrətli bir kişi kimi.
Sual:
--Təhsilin elə Türkiyyədə oxuduğundu?
Cavab: --Yox. Gəncə Məişət Texnikomunu bitirib, İbtidai sinif müəllimliyi ixtisasını aldım. Sonra Polis Akademiyasına qəbul olundum…
Sual:--Vətə təəssübüynən Türkiyyədən gəlib burda həm öz qanımı həmdə düşmənimin qanını axıtmağın sənə nə Verdi?
Cavab:--Nə umurdum ki, nədə versin?! Məni dədə-baba yurduna çəkib gətirən ata vəsiyyəti və vətən, və torpaq qeyrəti oldu. Mən heç bir əvəz düşünmədən döyüşdüm və sabah da döyüşməyə hazıram. Təki vətən yaşasın. Siz şairlər bilərsinin, Hüseyn Cavid deyib ki:
Torpaqları Vatan yapan üstündəki qandır,
Torpaq uğrunda ölən varsa Vatandır.
Həqiqətən, torpaq vətən deyil, adi torpaqdır, üstünə qan töküləndən sonra vətən olur.
Nə qədər ki, Azərbaycan torpaqları dardadır, bizim hamımız yoxdur ki, rahat nəfəs alaq. Döyüş əhval ruhiyyəsi ömrümüz boyu canımızdan qanımızdan çıxmamalıdır. Mübarizə ruhu həmişə ğizimlə yaşamalıdar.
Türk dünyasının Atatürkdən sonrakı lideri, Müstəqil Azərbaycan Respublikasının qurucusu Heydər Əliyevin (Allah ona rəhmət eləsin!) şəxsən özu mənə «İgidliyə görə» medalını təqdim etmişdir. Bu böyük şəxsiyyətlə ilk dəfə 1993 cü ildə Naxçıvanda görüşdüm.Mənə müraciətlə demişdi:
--Övladım,sən innən belə mənim oğlumsan mənimlə mütləq əlaqə saxla.
(Görünür Qarabag Müharibəsində döyüşdüyümü ona deyiblər). Dəfələrlə onun qəbuluna getmək istədim, ancaq əlim çatmadı.
Ülü öndər görüşümüz zamanı demişdi:
--Sən Azərbaycan müstəqilliyi üçün çox şey eləmisən.
Və bundan sonra ulu öndər məni öpmüşdu. Və haqqımda xeyli xoş sözlər demişdi. Onda Naxçıvanda Ali Məclisin sədri işləyirdi.
Belə bir dahi şəxsiyyətin şəxsən öz əlindən medal almaq hər bir adama nəsib olmadı. Mən fəxr edirəm ki, Heydər Əliyevin medalını gəzdirirəm.

Oktyabr gecəsində mərhum ulu öndərimiz Heydər Əliyevin tapşırığıyla məni Prezident Aparatına çağırdılar. Evimdə idim, saat 12 olardı. Gəldim Prezident İqamətgahına. Bu, o vaxtlar idi ki, Sürət Hüseynov dövlət əleyhinə qiyam törətmişdir.
Prezident Sarayının qarşı tərəfində Azərbaycan televiziyası bir qəhqəman kimi məndən müsahibə aldı. Həmin lenti indii də tez-tez göstərirləi və ümummilli liderimiz Heydər Əliyevin özü mənə medalı təqdim etdi.
Mən bütün dünyada, o cümlədə Azərbaycanda yaşayan bütün azərbaycanlıları daha sıx birləşməyə çağırıram! Çünki onun bizim üçün, Azərbaycan xalqı üçün işıqlı yoldu, müqəddəs yoldu.
Bundan əvvəl qeyd olunan kimi rəhmətlik Əbülfəz Elçibəy də öz fərmanıyla məni «Milli Qəhrəman» Adı vermişdi. Amma indiyə qədər onu ala bilməmişəm. Lakin məni Azərbaycanda da Türkiyədə də bir Milli Qəhraman kimi tanıyırlar. Bütün dünya azərbaycanlıları bunu bilir. Prezidentin fərmanı ilə mənə «Milli Qəhrəman» Adı verilibdir, nə olsun ki, sənədimi ala bilmirəm.
Heç nədən aslı olmayaraq mən doğma Azərbaycanıma ömrümün axırına kimi xidmət edəcəyəm, burada da yaşayıb-yaşamağımdan asılı olmayaraq.
**Sual:--**Siyasətlə araanız necədil?
**Cavab:--**Vallah, mən heç bir siyasi partiyanın üzvü olmamışam. Amma bilirəm ki, dünyanın hər yerində siyasi oyunlar gedir, olanlara və olacaqlara cürbəcür qiymətlər veririlir.
Azərbaycanda heç bir siyasi fəaliyyətim olmayıb. Heç bir siyasi qruplaşmayla əlaqəm yoxdur. Ancaq müstəqil Azərbaycan xalqın və Azərbaycan dövlətinə xidmət etmişəm. Mən bir Azərbaycan vətəndaşı kimi, bir zabit kimi həmişə vətənim uğrunda döyüşə hazıram, mubarizə əhvar-ruhiyyəsilə yaşayıram, Ali Baş Komandanın əmrini gözləyirəm.
Münafat verilən mənzili də ki,qəbul etməmişdin.
**Sual:**--Bakıda Evin yox, eşiyin yox idi.İşin-gücün də ki, elə fərli deyildi. Bəs necə yaşayırdın, harda yaşayırdın, nəcür dolanırdın?
**Cavab:--**Əhmədli qəsəbəsində kirada yaşayırdıq. Həyatın ağrılı-acılı və keşməkeşli günləri bürümüşdü məni. Dolanmaq üçün alve edirdim. Sonra dövlət işində çalışmağa başladım. Qəpik-qəpik yığıb özümüzə bir ev tikdirdik. Bu əzablı günlərimdə həyatımın sadiq dostu, vəfalı ömür-gün yoldaşım Mətanət xanım həmişə yanımda olub, sevinci də, qəmi də birlikdə yaşamışıq. Mətanət xanım olmasaydı mən indiki mən deyildim.
Lakin ağır günlər müharibənin yaraları artıq öz sözünü deyib-səhətim tam normal deyil, qara ciyərimdə, mədəmdə, öd kisəmdə problemlər var. Başımdan aldığım yaralardan indii də çox əziyyət çəkirəm, ildə 3-4 dəfə müalicə alıram.
Bizim ailəyə ən çox köməyi dəyən, bizdən öirü həmişə ürəkdən can yandıran, göstərdiyi ali yaxşılıqları heç vaxt yadımdan çıxmayan Adilə xanımdır,--Mətanətin anası. Onun mehrini, onun nəvazişini, onun isti qayğı və məhəbbətini həmişə öz üstümdə hiss eləmişəm. Allah Adilə xanımdan həmişə razı olsun!
Qarabağ müharibəsindən sonra da mübarizəni dayandırmamışım. Çox çətin və şərəfli bir vəzifədə-polisdə işləmişəm. Bu sahədə də əlimdən gələni eləməyə çalışmışam, xalqıma sədaqətli xidmət etməe amalı ilə yaşamışam, halal olmuşam. Cinayətkarlığa qarşı mübarizə aparmışam, narkotik maddələrin istifadəsi, alveri və saxlanması kimi cinayyət əməllərinin aşkar olunmasında butun bacarığımı sərf

etmişəm. Çünki bilirəm, «ağ ölüm» adlanan narkotik maddələr cəmiyyətin bəlasıdır. Narkomanlıq hər yerdə ciddi təhlükə sayılır, o, fəlakətlərin və faciələrin mənəyidir.
10-15 kloqramlarla nakotiklərin tutulub təhvil verilməsi əməliyyatlarında iştirak etmişəm, qanunsuz silahlar aşkar etmişik.
Müsətəqil Azərbaycanın, dövlətçiliyimizə qəsd etmək istəyən daxili düşmənlərimizhə, siyasi ambissiyalı xainlərə qarşı keçirilən əməliyyatlarada yaxından fəaliyyət göstərmişəm.
20 oktyabr hadisələri zamanı mərhum prezdentimiz Heydər Əliyevin ölkəmizin vətəndaşlarına ölkəmizə müraciəti zamanı bir başa Prezident Sarayının qarhısında bütün dünya azərbaycanlıların Heydər Əliyevin ətrafında sıx birləşməyə, həmrəyliyə çağırmışam. Həmin çağırışın lent yazısı «AzTV» -nin arxivində saxlanınlır.Bu gün dünya azərbaycanlıları məni bir qəhraman kimi tanıyırlar. Çün ki mən haqqımda Sərraf Şiruyənin yazdığı «Cəsurlar» kitibını al hamı oxuyur.
Bundan 5 il əvvəl qatarların təhlükəsizliyi üzrə öz xidməti vəzifəmi yerinə yetirərkən talış qardaşlarımızın zəmbilləri mənə şübhəli göründü və axtarışa başladım. Birt naməlum qara əşya tapdım. Axtarışı davam etdirərkən 13 kiloqram tiryək aşkar olundu. Onlar mənə bu işin açılmaması üçün küllü miqdarda pul təklif etdilər. Bir Allahım şahitdir ki, mən ömür boyu mən kəndi mənfəətimə görə heç vaxt inanclarımın ziddinə getməmişəm, heç vaxt nəfsimin qarşısında aciz qalmamışam və heç vaxt harama əl uzatmamışam, həmişə halal yaşamışam.
Bir dəfə Rastova gedəndə qatarda Çeçenlərdə gizli yolla aparılan avtomat silah aşkar etmişdir.
Belə halda üstümüzə bıçaq çəkənlər, bizə cumanlar və hətta qumbara atanlar da olub. Bu cür hadisələrlə çox qarşılaşmışam.
Minvoda əli avtomatlı qatar aparmışam. Rusiya hərbçiləri məni tutublar. Halbuki Azərbaycan dövlətinin adından qatar aparırdım. (Elə məxfiliklər var ki, onları açmaq düzgün deyil). Onda hələ müharibə qutarmamışdır.
Bir neçə ay bundan əvvəl mənim təlimatlandırmağım nəticəsində qatarda 13
kiloqramm tiryək aşkar olunub. ( Elə işlərnən məşğul olanlar bilirlər ki, bu, nə deməkdir).
İl ərzində bizim şəxsi heyyətin ən azı 10-15 narkotik maddə toplumuz olur.
--Sual:--Bir dəqiqə, üzr istəyirəm, bir ziyalı kimi ölkəmizin bu keçid dövründəki, ictimai-siyasi hüquqi, və kriminogen durumdan mənimdə az-çox xəbərim var. Yəni göydən zəmbillə düşməmişəm. İnana bilmirəm ki, bu gün polis işləyəsən, siz Allah xətrinizə dəyməsin, amma heç vaxt pul götürməyəsən. Bu, indiki vaxtda bir az absurd görünür. Aydındır ki, mənimlə razılaşmayacaqsınız və öz dedeyinizin üstündə duracaqsanız, deyilmi? Hələ bəlkə də deyəcəksiniz ki, Azərbaycanın polis sistemində öz vəzifəsini vicdanla yerinə yetirənlər çoxdur. Düz fikirləşirənmi?
Cavab:-- Bilirsininz, müəllim, birincisi, mən özümə cavabdehəm və sizin mənim dediklərimə inanıb- inanmayacağınız şəxsi işinizdir. Mən inamlı bir adamam. Həcc ziyarətinədə olmuşam və «Qurani-Kərim» də buyurduğu kimi, yalanı ən böyük günah hesab eləyirəm. Həm də burda nə məcburiyyət var ki,? Mənim ürəyimdə nə var dilimdədir, dilimdə nə var ürəyimdədir. Ürəyim də, dilim də Alllahnan düzdür.
Mən heç vaxt dünya malına görə mənəviyyatıma kölgə sala bilmərəm və hamıya da məsləhət bilirəm ki, belə olsunlar. Mən tabeçiliyimdə olan şəxsi həyatın üzvlərinə də həmişə deyirəm: Həmişə xalqınızın keşiyində sədaqətlə durun, dövlətin qanunlarına düzgün əməl edin, vicdanınızı nəinki maddi marağa, heç nəyə qurban verməyin. Onların hər birinə Azərbaycanın Dövlət Himmini əzbər öyrətmişəm, digər dövlət

rəmzlərini izah etmişəm,  onlara çox uca hörmətlə yanaşmaq vərdişini aşılamışam. Bunu onların vətəndaşlıq borcu olduğunu anlatmışam.
Sual:--Yaxşı, qardaşım, deyəsən sözlərim xətrinizə dəydi. «Öz arşımızla ölçdüm» sizi. Bağışlayın. Söhbətimizi davam etdirəkmi?
Cavab:-- Polis Akademiyasında oxuyu-oxuya Azərbaycan dövləti məni göndərdi Amerikaya. Orda Nyumeksino Ştatında terrorizmə qarşı mübarizə ilə əlaqədar ay yarımlıq kurslarda iştirak etdim. ABŞ Departamentinin düzənlədiyi bu kursları fərqlənməylə bitirib Diplom aldım.
Sonra isə Misirə göndərildim. Burada Qahirə şəhərində dünya terrorizmlə bağlı bir aylıq kurs keçdim və yenə də « Fərqlənmə Diplomu» verdilər. Dörd-  beş Diplomum olsa da, vətən qarşısında həmişə özümü  borclu hesab edirəm.
Ulu öndərimiz Heydər Əliyevin (Allah ona rəhmət eləsin ) banisi olduğu Müstəqil Azərbaycan dövləti günü-gündən çiçəklənir, sürətli inkişaf yolu keçir və bütün dünyada tanınmaqda davam edir.
Bu xalqın ümummilli lideri Heydər Əliyevin layıqli davamçısı, möhtərəm prezident cənab İlham Əliyev Azərbaycan üçün, onun xalqını firavanlığı üçün ciddi işlər görür.
Sual:--İşinizdən sonra yenə danışarıq, qardaşım. Bir azda qohum-əqrabanızdan…
Cavab:-- Hə, olar qohumlarımın hamısının mənə və həyat yoldaşım Mətanət xanıma münasibətləri çox yaxşıdır. Vətən qarşısında öz borcumu şərəflə yerimə yetirdiyim üçün şəxsən mənə böyük hörmət bəsləyirlər. Onlar bilirlər ki, mən Azərbaycan torpağı uğrunda gedən döyüşlərdə iki dəfə yaralanmışam, qanıb axıb bu torpağa axıb, ona görə də mənə qarşı çox diqqətlidirlər. Mənim də onlara böyük hörmətim var. Qardaşımı və bacılırımı, onların uşaqlarını həddindən artıq çox istəyirəm və bunu təbii saymaq lazımdır. O tərəflərə gedərkən onlar məndən Azərbaycanla bağlı, müğam yazılmış «20 Yanvar» faciəsini əks etdirən –video kasetlər, disklər aparmağımı xahiş edirlər. Azərbaycanın tarixi haqqında kitablar istəyirlər. Gəncə, Şəki kələğayılarını çox xoşlayırlar. Gedəndə onların hamısından onlara pay aparıram.
Əmimin uşaqları namaz qılandır, qardaşım Hacıdır, o da namaz qılır, mənim kimi.
Onlar da bizə maddi kömək göstərirlər. Sağ olsunlar! Qardaşım, əmim uşaqları Abdulla, Hümbət, Həsən, Molla Bayram, Almaniyada yaşayan əmim oğlu Hacı Əsəd, hamısı bizə əl tuturlar. Bacılarım ev əşyaları, uşaqlarıma paltar pay qoyurlar. Şükür Allaha, Türkiyədə onların hamısının vəziyyəti yaxşıdır.
İki oğlum var, bir qızım var—Abbas, Əlişah və Həsrəti Dilbər. Əlişah qədirxun bayramı günü anadan olub. Qədirxun bayramı 40 min hacının qarşısında Həzrəti Məhəmməd salavatullahın Həzrəti Əlini vali elan etdiyi gündür. Şiyələr tarixən həmin günü bayram edirlər. Həmin günü dünyaya gəldiyinə görə onun adını Əlişah qoymuşam. Qızıma isə anam Dilbərin adını qoymuşam. «Həsrəti Dilbər» -- yəni anam Dilbərə həsrətəm.
Oğlum 17 yaşına keçibdi. O da mübarizə əhval-ruhiyyəsində yaşayır. Hərdən məndən soruşur: «Ata. Nə vaxt biz gedib Qarabağ torpaqlarını azad edəcəyik?». Deyirəm:
--Oğlum, bizim rəhbərlər çalışırlar ki, bu məsələni sülh yoluynan həll etsinlər. Əgər bu baş tutmasa, prezidentimiz əmr edəcək, biz də gedib müharibə yolu ilə torpaqlarımızı azad edəcəyik.
Mən övladlarımı arzuladığım kimi görürəm, istəyirəm ki, onlar Azərbaycanın layiqli vətəndaşları olsunlar, vətənin keşiyində həmişə ayıq-sayıq durmağı bacarsınlar.

Onlara deyirəm ki, harada istəyirsiniz işləyin, harada olursunuz olun Azərbaycanın və Azərbaycan xalqının mənafeyi üçün çalışın. Dövlətimizi və dövlətçiliyimizi yaşatmaq üçün, lazım gəlsə, canınızı belə qurban verməyi bacarın. Necə ki, mən belə amallarla yaşayıram. Allaha həmişə duaçıyam ki, mənə ömür versin, mübarizə etdiyim o torpaqları azad görüm! Mətanətin anası Adilə xanım bizim uşaqların böyüməsində də çox əziyyət çəkib.
Uşaqlarım Azərbaycanı o qədər sevirlər ki!.. Onlar bu mühitdə yaşayıb-böyüyüblər. Türkiyədə üççə gün qalmış Azərbaycan üçün darıxırlar, qayıtmaq istəyirlər. Amma, deyəsən, məndən çox analarına qarşı məhəbbətləri var. Neynək, qoy olsun, Mətanət xanım hər cür yüksək sevgiyə layiq bir insandır.
Mətanət xanım Azərbaycanın Şamaxı bölgəsindəndir—Mirzə Ələkbər Sabirin, Seyid Əzim Şirvaninin Vətənindəndir. Şamaxının çox qədim tarixi olub. Bu bölgənin insanları çox yüksək mədəniyyətə malikdirlər. Onların mənə qarşı böyük diqqət və qayğıları var. Mənim də onlara hüsnü rəğbətim çox-çoxdur.
Türkiyəyə gedəndə ən çox Qarabağ Müharibəsilə bağlı suallar verirlər: «Müharibədə vəziyyət necədir?
Necə oldu ki, Azərbaycanın torpaqlarını ermənilər işğal edə bildilər?»
Mən onlara buradakı yaşayış tərzi, Azərbaycanın inkişafı haqqında danışıram, torpaqlarımızın tezliklə azad olunacağından söhbət açıram və deyirəm ki, əgər lazım olsa biz də Azərbaycan vətəndaşları kimi döyüşə hazır olmalıyıq!
Bilirsiniz, Türkiyədə yaşayan bütün azəri türklərinin arzusu odur ki, onlar da gəlib bu mübarizəyə qoşulsunlar və Azərbaycan azad olsun.
Türkiyə azəriləri Azərbaycanın dünyaya olduğu olduğu kimi tanınması üçün əllərindən gələn xidməti göstərirlər.
Sual:--Öz ana vətənin Türkiyəyə gedəndə harda qalırsan, kimləri ziyarət edirsən? Ümumiyyətlə, Türkiyə səfərin necə keçir?
Cavab:--Qohumlarının hər birini ziyarət etməyə çalışıram. Əmim oğlu Hacı Hümbətin, qardaşım Abdullahın, qardaşım oğlu Əlinin, bacılarım Gülçinin, Ceyranın, böyük əmimin oğlu Həsənin, Molla Bayramın evlərinə gedib qonaq qalıram. Birinin evinə gedib, o birisinə getməsəm inciyirlər.
Həmişə İqdıra gedib anam Dilbərin, İstanbulda isə atam Abbasın qəbirlərini ziyarət edirəm. (Atam İstanbulda yaşayan qardaşım Abdullahın yanında rəhmətə getdiyinə görə orada dəfn olunub). İstanbulda İqdır bir-birindən çox aralıdırlar. Atamla anamın qəbirləri də orada biri-birindən qərib düşüblər. Sona xanımın qəbri isə Oba kəndində idi. Onların taleyinə öləndən sonra da qürbət, ayrılıq yazılıbmış. Ümumiyyətlə, bizim nəsil-kök bir-birindən pərən-pərən düşüb, ayrı-ayrı yerlərə səpələnibdi, hər birimiz ayrılıqda yaşayırıq. Buna baxmayaraq, mən Azərbaycanın hər bir qarış torpağını özümə doğma hesab edirəm. Qubadlını da, Qusarı da, Lənkəranı da, İqdırı da özümə çox əziz bilirəm.
Sual:--Tərtəri də həmçinin, eləmi?
Cavab:--Mən bəlkə də qəriblik çəkərdim, atam, anam, qardaş, bacım burada yoxuydular, ümumiyyətlə, heç kimim yox idi. Məni Tərtər və tərtərlilər bağrına basdı, mən də onların etimadını doğrultmaq üçün əlimdən nə gəlirsə, onu etdim.
Bu gün də özümü xoşbəxt hesab edirəm ki, atamın vəsiyyətilə bura gəlib çıxdım, Tərtər, Ağdərə, Levonarx, Lüləsaz, Çardaqlı, Dramon və digər strateji məntəqələr uğrunda gedən ağır, çətin, qanlı-qadalı, lakin şərəfli və sonu qələbə ilə bitən döyüşlərdə iştirak etdim. Allahın mənə vermiş olduğu cəsarətdən, ağıldan, bilikdən

istifadə edib, çalışdım ki, Vətənin boynumda olan haqqı-sayından bəlkə bir azını qaytara bilim.
Mən həmişə azəri türkü olmağımla fəxr etmişəm, İqdırda atamdan, anamdan vətənpərvərlik dərsi almışam. Vətən üçün, namus üçün ölmək şərəfdir. «Qurani-Kərim»də də buyrulur ki, əgər torpaqlarınızı işğal etmək istəyənlər varsa, onu müdafiə edin.
Bu gündən sonra beş dəfə yenə dünyaya gəlsəm, Vətən üçün ölərəm. Bizim kimiləri analarımız yenidən doğar, amma Vətən doğulmaz. Buna görə də əlimdə avtomat oğlanlarım Əlişah və Abbasla vətən torpaqlarını azad etmək üçün müharibəyə getməyə hazırıq. Bilin ki, mənim bir düşmənim var, o da torpaqlarımı işğal edən ermənidir.
Mən uşaqlarıma atalarına, babalarına—Əbdüləhəd bəyə, Abbas bəyə, Kəlba Hüseynə, Ağəliyə, Ağammədə, Heydər kişiyə layiq övladlar olmaqlarını arzulayıram.
İndisə sualınıza cavab olaraq bildirirəm ki, mən Tərtərə «Qəhrəman Tərtər» deyirəm. Mənim döyüşdüyüm bu bölgənin insanları da, daşı da, torpağı da, ağacı da müharibənin dəhşətlərini yaşayıb, 308 şəhid verib, amma bir qarış torpağını belə verməyib, əksinə ermənilər yaşayan onlarla kənd alıb, torpaqlarını azad edib və indi də öz əllərində saxlayırlar.
Sual:--İslam dünyasının qanunları həssas, şərtləri də çox və ağırdır. İş-güc, ev-eşik və islami qaydalar… Necə çatdırırsınız?
Cavab:--Allahın buyruğu, yəni «Qurani-Kərim»in ayələri insanlığı şəffaflığa, halallığa və gözəl işlər görməyə çağırır. Hər bir imanlı adam Allahın buyurduğu yolla getməlidir. Bu, işinin, ailə qayğılarının çoxluğundan  və azlığından asılı deyil.
2000-2001-ci illərdə Allah mənə Məkkə ziyarətini nəsib eləyibdi. Kərbəlada, Məşhəddə olmuşam. (Tanrı hər bir müsəlmana bu müqəddəs ziyarətləri qismət eləsin!)
Atam Abbas üç ay—Səfər, Şaban, Ramazan ayları oruc tuturdu. O, 12 yaşından ibadətlə məşğul idi. Hər zaman xumsunu, zəkatını verərdi. Gözümü açandan «Allahu-Əkbər!» sədası altında böyümüşəm. Artıq Sizə məlum olduğu kimi babam Əbdüləhəd bəy dərin alim idi, əmim Molla Əli, Kəlba Hüseyn əmimin oğlu Hacı Bayraməli dindar adamlar. Yəni bizim soykökümüzdə islami dəyərlərə və inanclara yüksək hörmət olubdu. Mən belə bir mühitdə tərbiyə almışam.
Allah bizi haramdan uzaq eləsin, öz halalından bizim ruzimizi versin! Amin!
Sual:--Döyüşçü İsmayıl Tuncla polis İsmayıl Tunc dostluq edə bilirlərmi? Aralarında narazılıq-zad yoxdur ki?
Cavab:--Polis də elə hərbçi deməkdir. İşlədiyim iş şərəflidir, ağırdır, çətindir. Polis işçisi olsam da özümü hərbçi hiss edirəm. Hərbçilik elə bil mənim ruhumdadır.
Rütbəm mayordur. Növbəti rütbəmin də vaxtıçatıb. İnşallah polkovnik-leytenant rütbəsini də alacağam. Bir də ki, Allah yanında rütbən olsun.
İşlədiyim kollektivdə millətçiliyi təbliğ etmişəm. Onlara həmişə şərəflə xidmət etməyi məsləhət bilmişəm. Onların mənə, mənim də onlara hörmət və məhəbbətimiz var.
Həyatda həmişə çalışmışam ki, özümə düşmən qazanmayım, qazanmamışam da.
15  ildir ki, polisdə işləyirəm. Heç vaxt mənim öz marağım xidməti marağımdan üstün olmayıb, dövlətin mənafeyini  bütün mənafelərdən üstün tutmuşam. İşimdə həmişə məsuliyyətli olmağa çalışıram, amma Allah olan borcumu da ibadətlə

verməyi də müqəddəs vəzifəm hesab edirəm. Hədislərin birində buyrulur ki, bir gün səngərdə olmaq bir illik ibadətə bərabərdir.
Sual:--Qardaşım, iki vətənin arasında tərəddüd elədiyim vaxtlar olubmu? Lap səmimi olsaq, ürəyində meylinin daha çox yönü bu qoşa qanadın, iki qardaşın hansınadı?
Cavab:--Birincisi, mən xoşbəxtəm ki, türkəm. Bu bəxtəvərliyi bilməyənlər papaqlarını qoysunlar qabaqlarına, fikirləşsinlər.
İkincisi, heç bir vaxt Türkiyədən gəlməyimə peşiman olmamışam. Bir daha yaransam, mən yenə Azərbaycana gəlib, torpaqlarımızın azad olunması uğrunda döyüşərdim, Mətanət xanımla ailə qurardım.
Mənim həmişə ən böyük arzum o olub ki, Qərbi Azərbaycanı—ata-babamın yurdunu görüm, doğmalarımın qəbirlərini ziyarət edim. O torpaq, həqiqətən də, mənim üçün çox müqəddəsdir.
Eşqin, məhəbbətin ən böyüyü, ən ülvisi Vətən eşqidir, Vətən məhəbbətidir.
Dədələrimiz, babalarımız tarixdə elə üzqaralığı qoymayıblar. Gərək biz də gələcək nəsillərə üzqaralığı qoymayaq—Vətən torpaqlarını yağı tapdağından hansı yolla olur-olsun, lap qanımız bahasına azad edək. Bu, hər bir azəri türkünün müqəddəs borcu, həyati amalı olmalıdır. Bizim hamımız bu dar günlərdə birləşməliyik, yumruq kimi bir olmalıyıq. Bütün dünya azərbaycanlılarına müraciət edirəm: «Harada yaşamağınızdan asılı olmayaraq sizin bir vətəniniz var—Azərbaycan! Azərbaycan güləndə gülün, ağlayanda ağlayın!
Hər il dekabr ayının 31-i Dünya Azərbaycanlılarının Həmrəylik Günüdür. Tək bu gün yox, ilin bütün günlərini həmrəy olaq, bir olaq! Onda bizim torpaqlarımız azad, Vətənimiz və xalqımız xoşbəxt olar!».
Vətəni qorumaq, namusu qorumaq Tanrının bizə tapşırığıdır. Bizim hamımız bunu şərəflə yerinə yetirməliyik! Torpaqlarımıza göz dikən düşmənlərimizin gözlərini çıxarmalıyıq!

Tofiq Yusif

STATİSTİK MƏLUMATLAR

Məcburi köçkünlərin tərkibi

| | |
|---|---|
| Ümumi sayı | 144571 ailə |
| Kişilər | 267223 nəfər |
| Qadınlar | 305229 nəfər |
| 17 yaşadək olanlar | 197948 nəfər |
| Məktəblilər | 126482 nəfər |
| Əmək qabiliyyətlilərinin sayı | 294212 nəfər |
| İşləməyənlər | 199190 nəfər |
| Təqaüdçülər | 116554 nəfər |
| Yetim uşaqlar | 4396 nəfər |
| Kimsəsizlər | 4000 nəfər |
| | |
| Milli tərkib: | |
| | |
| Azərbaycanlılar | 566402 nəfər |
| Ruslar | 792 nəfər |
| Kürdlər | 4526 nəfər |
| Digər millətlər | 90 nəfər |
| | |
| Qaçqınlar və məcburi köçkünlər | |
| (1988-1989-cu illər) | |
| | |
| Erəmnistandan qovulmuş qaçqınlar | 50149 ailə |
| (1988-1989-cu illər) | 243682 nəfər |
| Orta Asiyadan, Qazaxıstandan qovulmuşlar | 9463 ailə |
| Məhsəti (axıska) türkləri (1990-cı illər) | 49239 |

150

Qan iyi

| | |
|---|---|
| Məcburi köçkünlərin sayı | 144571 |
| | 572451 |
| Qaçqınların və məcburi köçkünlərin | 194720 |
| Ümumi sayı | 816133 |
| | |
| Dağlıq Qarbağ ərazisindən azərbaycanlıların qovulması | |
| (1988-1991-ci illər) | |
| | |
| 1988-ci illədək Dağlıq Qarabağ ərazisində yaşayan azərbaycanlıların sayı | 50 min nəfər |
| Dağlıq Qarabağ ərazisində azərbaycanlılar yaşayan məskənlər | 2 şəhər,<br>1 qəsəbə,<br>53 kənd |
| | |
| | |
| Dağıdılmış obyektlər, zəbt olunmuş əkin və meşə sahələri: | |
| | |
| Yaşayış evləri | 102000 |
| İctimai binalar | 7000 |
| Ümumtəhsil məktəbləri | 693 |
| Səhiyyə obyektləri | 695 |
| Avtomobil yolları | 1800 km |
| Körpülər | 160 |
| Su kəməri | 2300 km. |
| Elektrik xətti | 150000 km. |
| Meşə sahəsi | 250000 hektar |
| Əkin sahəsi | 200000 hektar |
| Tarixi abidələr və muzeylər | 464 |

151

| | |
|---|---|
| İlkin hesablamalara görə Azərbaycan Respublikasına 53,5 milyard ABŞ dolları həcmində ziyan dəymişdir. | |
| İşğal olunmuş şəhər, kənd və qəsəbə | 890 |
| | |
| Həlak olanlar | 20 000 nəfər |
| Qarabağ müharibəsi əlilləri | 50 000 |
| Əsirlər və itkin düşənlər | 5 101 nəfər |
| (1 iyul 1999-cu ilə olan məlumata görə) | |
| Şəhid ailələri | 7 737 ailə |
| | |
| Xocalı faciəsinin xronikası (26 fevral 1992-ci il) | |
| | |
| Həlak olanlar | 613 nəfər |
| Həlak olanlardan qadınlar | 106 nəfər |
| Azyaşlı uşaqlar | 63 |
| 6 ailə bütövlüklə məhv edilmiş, valideynlərindən birini itirmişdir. | |
| Ermənistandan, həmsərhəd rayonlardan köçkün düşərək ərazilərdə məskunlaşmış əhali haqqında | |
| Naxçıvan MR üzrə: | 103 ailə 467 nəfər |
| Sədərək rayonu | 93 ailə 273 nəfər |
| Ağstafa rayonu | 328 ailə 1152 nəfər |





| | |
|---|---|
| Ağcabədi rayonu | 681 ailə 3358 nəfər |
| Qazax rayonu | 1712 ailə 6368 nəfər |
| Gədəbəy rayonu | 87 ailə 313 nəfər |
| Tərtər rayonu | 1186 ailə 4973 nəfər |
| Ağdam rayonu | 5462 ailə 20485 nəfər |
| Füzuli rayonu | 11584 ailə 50731 nəfər |
| Cəmi | 21236 ailə 88120 nəfər |






## XATİRƏLƏR



### *Azərbaycan vətən Müharibəsinin II qrupp əlili Yusibov Suliddin Rəhman oğlunun dediklərindən*

Mən 1992-ci il məlum Qarabağ müharibəsində iştirak etmiş Türkiyəli İsmayıl Tunc adlı bir igid döyüşçü haqqında xatirələrimi danışmaq istəyirəm.

Mənim İsmayılla 1992-ci ilin avqust ayının 1-2-si tanışlığımız başlanıb. Onun heç bir hərbiçi kimi yarlı-yaraqlı, papağında türk bayrağının şəklini görəndə həqiqətən fərəhləndim ki, bizə Türkiyədən öz qardaşlarımız, soydaşlarımız köməyə gəlib. Yaxınlaşıb İsmayılla tanış oldum.

İsmayıl türk hərbiçilərinin formasında idi. Bizim əynimizdə isə o zamankı rus forması vardı. Biz müstəqil ölkə kimi hələ formalaşmamışdıq.

Paltarı o Türkiyədən gətirmişdi. Deyirdi ki, bu paltar mənim kəfənimdi. Bir də deyirdi ki, döyüşə gedənlər-şəhidlər yuyulmasa da onların Qanı torpağa bulaşırsa, elə pak olurlar. İsmayılla ilk görüşdə bir saata yaxın söhbət etdik. Dedi ki, Türkiyədən gəlmişəm, hərbiçi olmuşam, gəlmişəm ki, ermənilərdən birlikdə qisas alaq. Mənim üçün Türkiyənin və Azərbaycanın fərqi yoxdur, qardaş ölkədir,

Türkiyə və Azərbaycan. Mən sonralar çalışırdım ki, İsmayıldan hərbinin sirlərini öyrənim. Ona görə ki, mən rus ordusunda olmuşdum, tikinti batalyonunda qulluq etmişdim.

Xeyli söhbət etdik. Fikirləşdim ki, onunla kaş döyüşdə olum, nə cür hərəkətlər etdiyini görüm. 1992-ci il avqustun 6-da Kevonarx kəndindən Akopkamari deyilən kəndə (Ağdərə rayonunun ərazisidir) hücum eliyəsi olduq. Tərtərin və Mingəçevirin iki batalyonu, bir də Lərkəran könüllüləri idi. Günortadan, təqribən saat 1-dən sonra hərəkət eləməyə başladıq. 703-cü hərbi hissənin 5-ci rotası «Tərtər» Batalyonu gedirdi. İsmayıl Tunc da birbaşa bizim rotaya gəldi. Eşitmişdi Ki, orada Vəzir kimi döyüşən qeyrətli oğlanlar var. «Tərtər» Özünümüdafiə Batalyonunun əksəriyyəti Tərtərdən olan uşaqları idi. Ona görə də «Tərtər» Batalyonuna gəlmişdi. Tərtərlilərlə çiyin-çiyinə idi. Dediyim kimi, avqustun 6-da hücuma keçdik.

Mininakan? Deyilən kənd çox yüksəklikdə idi. Hardasa İsmayıl 1 kilometr gedəndən sonra bizi çökdü mövqeli yerə ki, burada erməni bizi görə bilməsin.

Yəni ki, əvvəlki yerimiz çınqıllıq idi, mərəni düşsə idi, qəlpədən çox çınqıl bizə bəs eləyərdi.

Komandirimiz Vəzir idi. İsmayıl bizim aramızda gedirdi, məsləhətlər verirdi. Biz hərbiçi olmamışdıq, axı. Buna görə də onun məsləhətləri ilə hərəkət edirdik. Bir sözlə, təcrübəmiz yox idi. Demək olar ki, biz həmin günü Akopkamari deyilən kəndi hələ tam götürməmişdik. Bir az, 5-10 dəqiqə dincəlməyimiz lazım idi. Ondan sonra yenidən hücuma keçə bilərdik.

İsmayıl o gərgin anlarda fotoaparat çıxarıb, uşaqların kollektiv şəkillərini çəkirdi. Onda o qədər vətənpərvərlik hissi var idi ki, elə bil öz kəndini müdafiə edirdi. Şəkil çəkəndə erməni gülləsindən qorxub eləmədən ayaq üstə dururdu. Açığını deyim ki, bəzi uşaqlar içi mən qarışıq oturaqlı şəkil çəkdirirdik. Düşmən gülləsinin yağış kimi yağdığı bir vaxtda ayaq üstə hər oğul dura bilməzdi. Bəli, İsmayıl bununla bizə ürək-dirək verirdi. Fikirləşirdik ki, əgər bu adam Türkiyədən Qarabağ Müharibəsində döyüşmək üçün Tərtər torpağına gəlib çıxıbsa və heç nədən qoxmursa, biz niyə belə olmayaq? Ona görə də biz qorxu hissini unudurduq. O həmişə bizə ürək-dirək verirdi. O kəndi ayın 7-sində aldıq. «1001 yüksəklik» deyilən yer vardı, gecə qaldıq orda. Rəhmətlik Vəzir, Elman müəllim, İsmayıl, mən elə bir yüksəklikdə qaldıq ki, ora çox qorxulu mövqe idi. Səhər açılmışdı. Gördük ki, kənddən tüstü qalxır. Vəzir İsmayıl dedi ki, o tüstü deyil, buluddur. Həqiqətən də bulud bizdən aşağıdayıydı. Biz belə bir yüksəklikdə idik. Yavaş-yavaş yendik Lüləsar kəndinə. Rəhmətlik Vəzir İsmayıla dedi ki, on nəfər səninlə getsin, on nəfər isə mənimlə. Əgər kənddə heç kim olmasa, bir şey yandırmaq lazımdır.

Deməli, biz on nəfər getdik kəndin aşağısından girdik içinə. Bir azdan ermənilər duyuq düşdülər ki, biz gəlib keçmişik. Onların başlarının üstünə. Ona görə də onlar avqustun 6-dan 7-nə keçən gecə Küləsaz kəndindən çıxmışdılar. Ona görə ki, səhər onları tuta bilərdik.

Dəstəmizdə hardasa 45 nəfər «Tərtər» Batalyonundan, 40 nəfər isə «Mingəçevir» Batalyonundan var idi. Vəkillə mamed də ( allah rəhmət eləsin, müharibədə onradan öldülər) bizimləydilər.

Avqustun 8-i, 9-u Çardaxlı kəndində hücum hazırlandı. Rəhmətlik Vəzir, Elman və İsmayıl məsləhətləşərək plan cızdılar. Biz bu planla hərəkət edərək Lüləsazı götürdük. Çardaxlıda ocaq yandırdıq. Uşaqlar bildilər ki, kənd boşdu, gəldilər. Həmin günü təyyarələr gəldi, bizim solumuzu bombaladılar. Kəndin üstündə bulaq varıydı. Suya çataçatda «Stribitel»lər gəldi bombanı tökdü.

Bulaq çökəkdədi. Onun üst tərəfi qəbiristanlıqdı, bir tərəfi isə təpədir, qayadır. Elman müəllimlə mən, «Qaz 66» markalı bir maşın vurulmuşdu, girdik onun altına. Qəlpələr maşının üstünə tökülürdü. Vəzirlə İsmayıl da gəlib bizim yanımıza çıxdılar. Söhbət etdik. Uşaqlar kəşfiyyata getdilər və bir az keçəndən sonra gəlib dedilər ki, kənddə erməni var. Avqust ayının 6,7,8-i Çardaxlı kəndinə hücum elədik. Vəzir bizi 10 nəfəri seçdi. Düşmənlə lap yaxfnlaşdıq. İsmayıl da bizim aramızda idi. Sonra biz ikimiz qayıdıb, qüvvəni irəli aparmalı olduq. Qəbristanlığa çatanda gördük Ki, ermənilərin bir «MAZ» maşını və bir «Niva»sı dayanıb. Fikirləşdik Ki, görəsən bunların piyada qüvvələri haradadır, müdafiə mövqeləri hardadır? Gördük Ki, 4 nəfər erməni oturub ağacın dibində, əllərində silah təmizləyirlər. Rəhmətlik Vəzir dedi Ki, tam keçməliyik bunların arxasına.  Onların bir tərəfi divara düşürdü, deməli, onlar mühasirə vəziyyətindəydi, diri götürə bilərdik. Çox səssiz-səmirsiz hərəkət edirdik. Bu anda Mirzə adlı oğlanın ayağı nəyəsə ilişdi və əlində güllə açıldı. O, şəhid oldu. Əslən ermənistanlı idi, qaçqınıydı. Onun əlində güllə açılan kimi həmin 4 erməni ayağa qalxdı. Vəzir bir anda «PK»-yla onlara tərəf atəş açdı. Ermənilərin 4-ü də kötük kimi yerə çırpılırıq yumaq kimi çapalayıb qaldılar yerdə. Sən demə onların piyada qüvvəsi lap yaxınlıqda qəbiristanlıqda imiş. Ratsiya ilə danışdılar Ki, Elma müəllimlə bu istiqamətə güllə gəlsin. Həmin göyüşdə mən İsmayıl  Tuncun necə igid, qorxmaz bir döyüşçü olduğunu öz gözlərimizlə gördüm. O, əsl qəhrəman kimi döyüşürdü. Heç nədən qorxmadan irəli atılaraq bizi hücuma səsləyirdi. Belə hərəkətləri mən yalnız kinolarda görmüşdüm. Girmişik qəbiristanlığa, «şaraq-şaraqla» erməni  qırırdıq. Bir də gördük Ki, ermənilərin bir tankı və bir «BMP» si gizləndikləri yerdən çıxıb bizə tərəf gəlir. Onları görən kimi İsmayıl ayağa qalxıb çığırdı. Qardaşlar, irəli!!! Sonra «Allahu-Əkbər!»-qışqıra-qışqıra, atəş aça-aça ermənilərin üstünə cumdu. Pulemyotun, avtomatın səsi meşədə əks-səda verib dəhşətli bir uğultu, vahimə yaradırdı. İsmayıl nə təşər çığırırdısa döyüş yadımdan çıxmışdı, elə mən ona baxırdım. Fikirləşirdim Ki, bu, nə etmək istəyir?

-- Batalyon irəli!!!-deyə, bizi döyüşə səsləyirdi. Bari o heç olmasa bir nəfəsini dərib, sonra demirdi. Ey irəli! Elə hey qışqırır, güllənı erməni tərəfə yağdırırdı. Heç nədən, hətta ölümdən belə qorxmurdu. Mən ömrümdə belə cəsur adam görməmişdim.

Sonra İsmayıla dedim ki, ayə heç olmasa ağacın dalında durub qışqıraydın da «İrəli!!!» -desəydin, uşaqlar, irəli getməzdi, elə bilərdilər ki, mən qorxuram.

Erməniləri tankı və «BMP»-si gəlib aralıda qrantamiyot çatası məsafədən uzaqda dayandılar. Qəbiristanlıqdakılar nə təhər atəşə tutdalarsa, kişi nə bilim, elə bil nə isə ulayırdı, dünya lərzəyə gəlirdi. Onda gördüm ki, İsmayıl yerə sərildi və onu qan götürdü. Bundan sonra «tarap»Məlahət aşdı.

Mirzə öldü, bağırsaqları tökülmüşdü yerə yığdıq içinə ermənilər imkan vermədilər ki, onları götürək 4 nəfər bizdən-«Tərtər»dən, iki nəfər Mingəçevirdən öldü.

Həmin günü biz demək olar ki, Çardaxlını ala bilmədik. Qaldıq 7-8 nəfər. Mingəçevirdən mamed adlı qoçaq bir oğlan var idi. O, qrantamiyotu alıb, erməniinin gələn texnikasını vurmaq istəyrdi. Vəzir dedi ki, qardaş, gəl bəri əgər o texnikadan birini vursaq, hamımız burada qırılasıyıq. Bizə isə hələ ölmək lazım deyil. Çəkildik geri.

İsmayıl heç bir tərəfə qospitalda yatmadı, bir də gördük, budu gəlib. O kürəyindən və başından yaralanmışdı. «BMP» mərasiminin qəlpəsi tutmuşdu.

… Sərsəng Su Anbarındaydıq səs yayıldı ki, İsmayıl gəlir, İsmayıl gəlir! Uşaq hamısı tökülüşüb, sevinclə İsmayılı qarşıladı. «Türk İsmayıl» da deyirdin ona, «Tunc İsmayıl»da.  Mən ona «Boz Qurd» deyirdim. Onun gözləri də qurd gözlərinə oxşayırdı. Vətənini, torpağını çox sevən insan idi. O, Azərbaycanı öz canından qanından çox sevirdi. Heyrətlənirdim. «Özün Türkiyədən gələsən və Azərbaycana da bu qədər müqəddəs sevgin ola!».

Üç gündən sonra əməliyyat hazırlandı. «Turbaza» deyilən yer var, sərsəng Su Anbarı istiqamətindən  ora 1 km yoldu. Nə isə, səhv etmirəmsə, avqustun ya 14-ü, ya 15-iydi. Günortadan sonraydı. Öyrənirik Ki, yeddi erməni postda dayanıb. Rəhmətlik Vəzir dedi.

-- Biz bu 7 nəfəri nəyin bahasına olur-olsun, diri tutmalıyıq. Bəd ayaqda, öldürmək yox, vurmaq və götürmək lazımdır. 30 nəfər getdik. 10 nəfər ayrıldıq Ki, irləri gedək. İsmayıl da bizlə idi. Vəzir istəmirdi İsmayıl getsin. Çünki fikirləşirdi Ki, ölsəm İsmayıl buradadır, məni əvəz edə bilər.

Əgər ikisi də ölsə, onda uşaqlar başsız qalar.

İsmayıl dedi. Yox mən mütləq gedəcəyəm!

O da nə uşaqları, nə də Vəziri tək buraxmaq istəmirdi. Nə isə, getdik 10 nəfər idik. 7 nəfər ermənininin 100 metr arxasına keçdik. Sonra Vəzir dedi Ki, oturun, gəlirəm. O getdi.5 dəqiqədən sonra qayıdıb gəldi və dedi Ki, o ermənilərə güllü atılmasın, arxada onların texnikası var, 50 metirliyimizdədir. Onlar müdafiədə duran bu 7 nəfərə arxayındılar Ki, bir hadisə olsa, xəbər verəcəklər.  Bu 7 nəfər onlardan təqribən 200 metr irəlidədirlər. Bu 7 nəfər də bilmir Ki, biz də onlarla çiyin-çiyinəyik. Kabab bişirirdilər. Çörək olsaydı,  kababın iyinə biz də yeyərdik. «Misto» deyilən bir komandir Goranboydanıydı. Onun öhdəsində bir-iki texnika var idi. Biz puskuda fürsət gözləyərkən onlar bu texnikaları qəfildən işə saldılar. Ermənilər duyuq düşdü. 7 nəfərdən biri qışqırdı.

-- Ara Kamo, texnika…(daha nə bili mnə?). Bizim döyüş texnikamız atdı, mərmilər gəlib nillərdən də  keçdi o tərəfə. Bu tərəfdən də erməni atmağa başladı. Onlar artıq bilirdi biz hardayıq.

Vəzir goranboylulara demişdi ki, gedirsiniz, gəlin gedək döyüşə, getmirsinizsə biz gedirik, atmayın.

Deməli erməni də atır, bizimkilər də, qalmışıq arada. Nə isə. Planımız təmiz pozulmuşdu. İndii iki ölümün arasında nə edəcəyimizi bilmirdik. Bizim 20 nəfərin üstündə rəhmətlik Ədalət komandir kimi idi. Vəzir əvvəlcədən məqsədi bizə başa salmışdı. Demişdi ki, mən işarə verəndə siz o 7 nəfərin böyrünə-başına atın, onlar qaçıb bizə tərəf gələcəklər, biz də onları diri götürəcəyik.

Ara belə qarışandan sonra Vəzir dedi ki, atmıyın yerimizi bilərlər, bizi qırarlar.

İsmayıl bir az aralıda tək dayanmışdı. Biz isə böyürtkan kolunun yanında durmuşduq, erməniləri gözləyirdik. Ermənilər başladılar «şapşap» böyrümüzdən keçməyə. Yaxından keçsydilər də qundaqla vurub, görürmək olardı. Onların ağlına da gəlməzdi ki, biz arxalarına keçmişik. Cığıra girmədən qaçırdılar. Vəzir 7 nəfər müdafiəçini görəndən sonra silah üçün 2 nəfər göndərmişdi.

Həmişə bu döyüşü xatırlayanda İsmayıl Tuncla bağlı qəribə bir epizod gözlərimin önünə gəlir. Ermənilər bizi görmədən yanımızdan sürətlə ötüb keçirdilər. Biz 10 nəfər planımız pozulandan sonra ermənilərin arxasında olduğumuz yerdən təhlükəsiz bir yerə çəkilmək istəyirdik.

Bir də gördük ki, saqqallı, canlı bir erməni döyüşçüsü «Türk İsmayılın» arxa tərəfindən gedir. Onların heç biri digərini görmürdü. Birdən İsmayıl hiss elədi ki, arxa tərəfində kimsə var. Bu  məqamda erməni də qarşı tərəfdə Adam oldğunu

Duydu və nəsə dedi. Mən bir az kənardan bu mənzərəini müşahidə edirdim. İsmayıl elə başa düşdü Ki, öz uşaqlarımızdandı və arxadan onun kim olduğunu soruşur. Buna görə də dedi.

-- Türk İsmayıl.

Erməni bu sözlərdən heç nə başa düşmədi, karıxdı və,

-- Parol?-deyə, soruşdu.

İsmayıl da özünü itirməyib ondan eynilə

--Parol?-deyə, soruşdu. Yəni sən «Parolu» de.

Bu anda köpək oğlunun ermənisi İsmayıla tərəf atəş açdı. İsmayıl dayandığı yerdən nə təhər yoxa çıxdısa mən görə bilmədim. Elə bildim Ki, bu əclaf erməni onu vurdu. Bir an keçməmiş baxdım Ki, İsmayıl sağ tərəfdən ermənilərə tərəf güllə yağdırır. İndii də təəccübümü gizlədə bilmirəm Ki, İsmayıl o vəziyyətdən necə çıxa bildi, güllənin qabağından nə cür yayındı? Əlbəttə, heç Kim həmin real ölüm məqamından sağ çıxa bilməzdi. Bu, mənə bir möcüzə kimi gəldi. İsmayılı sağ tərəfdən atəş açan görəndə gözlərimə inanmadım. Axı, erməni 5 metrlikdən avtomatın darağını onun üstünə boşaltmışdı. Rəhmətlik Vəzir Orucov da atırdı. Baxdı Ki, heyrətindən donub qalmışam, məni cığıra tərəf itələdi, yəni yolu kəs. Kəsdim, sonra vəzir mənə dedi ki, ondan qabaq bir «Avçarka» İtin bizə tərəf gəldiyini görmüşdüm. Fikirləşdim ki, onun arxasınca ağacların dalında piyadalar gələ bilər. Ona görə səni yola tərəf itələdim. Keçdim kolun dalından baxdım ki, İsmayıl durduğun yerin arxa tərəfində bir Adam uzanıb. Sonra məlum oldu ki, bu, İsmayıldan «Parol» soruşan həmin erməni quldurudur, İsmayıl vurub.

Yaxınlaşıb onun başına iki güllə sıxdım. Ona görə Ki, bilmirdim o ölüb, yoxsa sağdır. Həm də ona görə ki, Talıstan adlı bir yaxşı döyüşçü dostumuzu ölmüş bildiyi bir erməni köpəkoğlu düz alnından atmışdı. Mən də nişan  alıb, o yaralı ermənin başına iki güllə vurdum.

Əvvəldən bilirdim ki, kefindən uzana bilməz, «PK» onun canını almışdı. 1964 təvəllüdü erməni idi. Qaroviçkidən idi, Bakı ermənisiydi.

Rəhmətlik Oruc kişi var idi, Cəmilli kəndindən Ermənının pasportunu o götürdü cibindən. Elə ona pasportstol deyirdim, acığı tuturdu. Yığdığı erməni pasportlarını Sərdar Həmidova verib mükafat alırdı. Biz həmingünü «Purbaza»nın ərazisini g.türdük. Orda ermənilərin texnikasının biri vuruldu, o birisiləri də Kəlbəcər yolu ilə «Rus bulağı»na tərəf qaçdılar. Ordan yol var idi. Biz onları görə bilmədik. Vurulan «BMP»-ni yenə sürdülər, qaçırtdılar. Arxalarınca getsəydik həm Kasabet tərəfdən, həm Kəlbəcər istiqamətindən, həm də «Rus bulağı» istiqamətindən bizi ermənilər sıxa bilərdi. Kasabetdə erməniləriydi. «Goranboy Batalyonu» komandir Rasim idi yüksəklik uğrunda döyüşürdü. Biz «BMP»-nin üstünə yığılıb nömrəyə getdik. «Rus bulağı»na çataçatda Rasim dedi ki, çəkilin geri, mərmimiz qurtardı. Erməni bildi ki, «Turbaza»nı alıb, çıxmışıq «Rus bulağı» yanına. Kasabetdən onlarçıxdı Mehmanlıya yol var. Onlar avtomatlı töküldülər. Mehmanlı kəndinə, biz sərbəstləşdik.

## Suliddinin xatirələri

Avqust ayının 22-si növbəti hücumumuz «Ayı heykəli»nin ətrafında olmalı idi. Kəndin sol tərəfi yüksəklik idi. Məlum oldu ki, ermənilər həmin yüksəklikdə bənd alıblar. Kəşfiyyata getdik. Hardasa 1 kilometr yolu qaça-qaça qət etdik. Ora yaxınlaşmışdıq əvvəlcədən ermənilərə tərəf güllə atmışdıq və görmüşdük ki, bizə cavab atəşi haradan atılır. İndi Azərbaycanın Milli Qəhrəmanları olan rəhmətliklər Vəzir Orucov, Elman Hüseynov, «Türk İsmayıl» bizi kəşfiyyata aparırdılar. «Tərtər Batalyonu»nun komandiri Elman Müəllim Qıçından yaralandı, döyüşdə iştirak edə bilmədi. Rəhmətlik Ədalət Paşayev də orada kürəyindən yaralandı. Vəzir bizi qaldırdı həmin yüksəkliyə «Ayı heykəli»nin ətrafına erməni bizi əsas Sərsəng gölü tərəfdən gözləyirdi. Vəzir dedi ki, onların ağlına gələməz ki, biz bu tərəfdən gəlirik. Ermənininin əsas gözləyidi yer gölün qırağıdır. Bir də eşitdik ki, maşın səsi gəlir «Ayı heykəli» tərəfdən. Biz yola çıxmamışdıq. İsmayıl dedi ki, bu maşın mərmi gətirir, ərzaq maşını olmaz. Deməli, tam keçdik onların arxasına, «KAMAZ» gəlib keçəndə Vəzir göstəriş Verdi ki, onu vurun. Biz maşını vurduq, başladı yanmağa. «KAMAZ»la birlikdə gələn «UAZ» markalı maşın geri qayıtdı, Vəzir «PK» ilə yolu kəsdi. «UAZ»-ı da vurdu. Maşının içində ölən dığanın cibindən sənədləri götürüb baxdıq, podpolkovnik idi, məzuniyyət vemişdilər, Sevana gedib gəlmişdi. Deməli, Sevandan imiş. Uşaqların Adı yadımlan çıxıb. Səhv eləmirəmsə rəhmətlik Sərvər idi, Mayıl idi… Sərvər kolanı kəndindənyidi. İsmayılın ən yaxın dostu idi. Bir də gördü ki, o tərəfdən ermənininin «BMP»-si çıxdı. Sərvər qıranatı tulladı «BMP»nin üstünə, açılmadı. Siz «BMP»nin üstündəkimlərin şansına baxın!

Həmin gün gedib dirəndik dranbon kəndinin gədiyinə. İsmayıl Tunc döyüşlərdə əsl qəhrəmanlıq göstərirdi. Onun nə qədər erməni, nə qədər hərbi texnika məhv etdiyinin dəqiq sayını deyə bilmərəm. Lakin bütün əməliyyatlarda qabağa düşür, bizi həvəsləndirir, ermənini çırpı kimi qırırdı. Tərtərin torpağı onun kimi, Vəzir kimi, Elman müəllim kimi oğulların hesabına qorunub saxlandı.

Nə isə… «UAZ»-ı götürdük. Axşam saat 10-11 radələrində rayona qayıdası olduq. Sübh tezdən yenə döyüşdüyümüz yerə gəldik. Gördük ki, «KAMAZ» vurulan yerdə bizim bir «BMP» dayanıb. Vəzir soruşdu:

-- Ə—nə gəzirsən, niyə burda dayanmısan?

O cavab verdi:

-- Mövqeyi ermənilər aldılar. Mən də neyləməli idim? «BMP»-ni ermənilərə verməliydim? Məni də vurdular.

Vəzir maşina diqqətlə baxdı və dedi:

-- Ə, səni qaçanda vurublar. Onun əlində qaranatamyot vardı. Vəzir aldı baxdı ki, öz qrantamyotudur, nömərsinə görə bildi.

İsmayıl dedi:

-- Əgər erməni o mövqeyi alıbsa, onda onlar başamızın üstündədirlər. Təcili buradan çıxmaq lazımdır.

Vəzir dedi: buradan çıxmaq artıq gec olacaq.

İsmayıl dedi:

--Yox, mütləq çıxmalıyıq!

8 nəfəridik. Deməli, biz altdan yuxarı dağa qalxırıq meşənin içilə. Yüksəklikdə bizim tutduğumuz həmin mövqeyi erməni almışdı. Biz xeyli getmişdik ki, qəfildən ermənininin pulemyotları avtomatları şaqqıldatdı. Elə bildim ki, məndən başqa hamı öldü. Yəqin mənə dəyməyib güllə, qalan hamı qırıldı. Sən demə ermənilər bizi uzaqdan görürmüş. İsmayıl bu tərəfdə o birisi uşaqlar da mağazanın yanında

gizlənib, şaraq-şaraq atırlar. Getdik ki, bir koma silahlar qoyub qaçıblar. Qrantamyotu da Vəzir götürüb. Onların mərmilərinin arxalarınca gedirəm, geri qayıtmaq söhbəti yoxdur. Adamın fikrinə gəlməz ki, bizimkilər tutduğumuz mövqeləri qoyub qaçıblar. Vəzir məni çağırdı:

-- Ayə, ayə…

Mən ona baxmadan mağazanın yanına çöndüm geri mənə hirslə dedi:

-- Ayə, yekəbaş, sənnəm deyiləm! Söz məni möhkəm tutdu. Dedim:

Ayə mənim adım var, Suliddindir!

Güldü, sonra dedi:

-- Hara qaçırsan? Görmürsən ermənilər atırlar?! Fikir ver, bunlar oturub atıllar. Elə getmək olmaz axı vurarlar səni!

Mövqeyi qoyub qaçanlar töküldülər meşəaşağı, yoxa çıxdılar.

Həmin yüksəkliyin üstündən İsmayıl əlini meşəyə tərəf uzadıb mənə dedi:

-- Görürsən onları qaçırlar, bizimkilərdi, onlar erməni ola bilməz!..

Dayandıq, ayaq səsi eşitdik. Gördük ki, «Gəncə Batalyonu»ndan bir oğlandır. Soruşduq:

-- Bizim uşaqlar hanı?

Dedi:

-- Yoldadırlar.

Bir də gördük ki, Oruc kişi gəlir. Ondan da soruşduq ki, tutduğumuz mövqeləri ermənilər aldı, yoxsa?..

Dedi:

-- Hə, ermənilər o mövqeləri tutdu.

Rəhmətlik Vəzir dedi:

Çəkilin meşəyə. Artıq burada dayanmaq olmaz.

Hamı çəkildi meşyə.

Mən isə nə meşədə, nə də yola idim. – Meşənin bir addımlığındaydım.

Bir nəfər dedi ki, mən gelmirəm, bizim batalyon yoxdur. Dedim:

-- Ə, bizim-sizin batalyon nə deməkdir? Biz birik, erməniyə qarşı bir mübarizə aparırıq. Burada cəngavər kimi oğlanlar var. Qorxma dedi:

-- Yox, getmirəm. Bu oğlanın arxası mənə tərəf idi, Vəzirlə üzüzəydi. Vəzir bunun avtomatını aldı. Əmrlə dedi:

-- Gir meşəyə! Bu vaxt avtomatdan güllə açıldı. O yıxıldı. Bizimlə birlikdə iki-üç nəfər ermənistanlı var idi, köməyə gəlmişdilər. Bakıda yaşayırdılar, Tərtər uğrunda döyüşürdülər. Vəzir onlara dedi:

-- Döngədə maşın var, bunu götürün, çatdırın qospitala.

Sonra mənə dedi:

Yazıxdı, kaş ölməyə, tez çatdıralar!..

Nə isə… Yuxarı çıxası olmadıq.

Vəzir Orucov mənə tərəf dönüb dedi:

-- Maşın sürə bilirsən? Dedim ki, hə.

Dedi:

-- Otur o «KAMAZ»-ı aradan çıxart. Sonra məlum oldu ki, Vəzir bizi kəşfiyyata aparır. İsmayıl da bizimləyiydi. Düşdük yolun ağına. Bir az irəlilədik. Birdən İsmayıl dedi ki, «Pozisiya»da Azərbaycan dilində danışırlar. Aramızda 500 metr məsafə varıydı. Onda gördük ki, «PK» işlədi. Dedilər ki bizimkilərdi. Tanıdım ki, Mayılın, zakirin işidir, bir oğlu vardı Allah rəhmət eləsin, şəhid oldu, onun da səsi gəlirdi. Məlum oldu ki, erməni heç bir mövqe-zad almayıb. 12 nəfər Tərtər

uşağı qalıb orda. Tank vurulub, mərmi düşüb. Qaçan uşaqlar yalnadan deyirmişlər ki, mövqeləri ermənilər alıb, maşınlar vurulub, dağılıb. .. deməyəsən həmin nöqtələr bizdədir, uşaqlar da kavab bişirirmişlər.

Biz iki gün həmin strateji mövqedə qaldıq. İsmayıl, Vəzir Oruc kişi, Əyyub, Mayıl, Əli, Saleh, Çingiz, 45-50 nəfər idik.

Sonra yenə döyüşçü gəlmişdi, 80-90 nəfər olmuşduq. Səhərisi «Qarabağ şikəstəsi» oxuya-oxuya Drambona yelləndik. Murov vardı, o da qaçqınıydı səhv eləmirəmsə, «Qarabağ şikəstəsi»ni o oxuyurdu. Rəhmətlik Vəzir onun adını «Xoxol» qoymuşdu. Şəmil var idi, o da şəhid oldu. Cəmilli, Borsunlu kəndlərindən də uşaqlar vardı. Hamı Tərtərli idi. Yalnız İsmayılla Bakıda yaşayan ermənistanlılar uzaq yerlərdən idilər. Amma onlar elə vuruşurdular ki,heç Tərtərlilər o hünərlə, o cəsarətlə döyüşə bilmirdilər.

Dranıbon kəndinin içinə girdik. Mövqeyi tutduq. Erməni silahları ilə bizim aramız 400-500 metr olardı. Onlarla qarşı-qarşıya olan bir yüksəklikdəydik. Biz 3 gün bu mövqe ilə olduq.

Avqustun 25-26-sı idi. Kəndə su gətirmək üçün getmək lazım idi. Gərək əllə daşıyaydıq, maşın gedə bilməzdi ermənilər görərdilər. Uşaqlar susuz idi, üst başları Kirin içində  batırdı. Onlar yuyunmalıydılar. Nə isə, bu arada «Tərtər-2» deyilən rota vardı, onlardan bizə 30 nəfər köməyə gəldi.

Aptek Əlinin oğlu Rafiq Məmmədovda onların içində idi. Yaxşı döyüşən oğlanyıdı, rabitəçiydi. O boyda batalyonda bir dənəydi! Vəzirə deyirdim ki, çalış onu addat bizim dəstəyə. Bizə belə yaxşı oğlanlar hava-su kimi lazımdı…

Nə isə..

Bunlar bir gecə qaldılar. Onları «Tərtər-2» bizi isə «Tərtər-1» çağırırdılar.

Elə bilin ki, dağdı, yanı-yana. Bu Dağla o dağın arası 100 metrdi. Biz bu zirvədəyik, onlar o biri zirvədə. Çağırırdıq, gəlib bizdən siqaret, ərzaq aparırlar. Axşam tərəfi idi. Ratsiya ilə onları çağırdım, mənə cavab vermədilər. Vəzirə dedim:

-- Onlar  cavab vermirlər, bəlkə gediblər?

-- Ola bilməz!

Vəzir özüylə 2 nəfər götürüb keçdi o tərəfə. Bir azdan mənə zəng  elədi ki, 8 nəfər də götür, gəl. Bizdən xəbərsiz çıxıb gediblər.

Biz həmin yüksəkliyə əlavə qüvvə qoyduq. Onlar səhər gələrlər «Turbaza»ya. Burda 703 saylı hərbi hissənin qərargahı yaradılmışdı. Sərdar Həmidov onlarla qarşılaşar. Başlarına nə oyun açarsa, Allah bilir. Onları biabır eləyər. Deyər ki, qayıdın düz Vəzirin yanına. Qoy o özü mənlə əlaqə yaradıb desin ki, onlar buradadırlar. Xoşamtərəfi ratsiyalar çağırdılar bizi, cavab verdik. Hümbət adlı bir oğlan idi, tankçıların komandiriydi. Dedi ki, «Tərtər-2» gəlir, bəs qəbul edir.

Dedim ki, gəlsinlər.

Bir az keçdi ratsiyada bir də çağırdılar vəzir də o tərəfdən bunu eşitdi. Mənə tərəf dedi:

-- «Vostok-52», molcat!

Mən dedim:

«Tərtər-2» gəlir, bələdçi istəyir.

Vəzir əsəbləşdi:

-- «Tərtər-2» bizə lazım deyil! Onlar bələdçiylə gediblər ki, bələdçi ilə də geri qayıdalar?! Həm də ki, özləri yolu qəşəng tanıyırlar. Ümumiyyətlə, onlar bizə lazım deyillər!

Bir az keçdi bir də zəng elədilər. Mən yenə vəzirə dedim:

-- Gəlmək istəyirlərsə qoy gəlsinlər.

Vəzir dedi ki, onlar gəlirlərsə, bu uşaqlar burda bir həftədir ki, yuyunmurlar, «zamen» olacaq.

Onlar razılaşdılar və gəldilər. Biz də həmin uşaqları «nozisiya»da nə təhər lazımdı yerləşdirdik və oradan gecə çıxdıq. 2 kilometr piyada gəldik. Sonra «ZİL» maşınıyla «Turbaza» deyilən qərargaha çatdıq. Orada bizi bir azləngitdilər. «Turbaza»da Hümbətin tanksitlarıydı. Dəhşətli hadisələr olmuşdu. Burada Tankçını vurmuşdular, yaralanmışdı. Köməyə gələn «Təcili yardım» maşınını da vurmuşdular. Tankçılar yanmışdı. Dedilər ki, Vəzirin Xalası oğlu da yanıb. Onlardan xahiş elədim ki, ayə, bunu Vəzirə deməyin.

İndii maşınla gəlirik, Kasabet yüksəkliyində maşının işığında gördük ki, kimsə əl eləyir.

Vəzir dedi:

-- Hümbət nə gəzir burada?

O xalası oğlunu deyirdi.

Soruşdum:

-- Hümbətdir. O dedi ki, hə. Yaxınlaşıb maşını saxladıq. Baxdıq ki, ayrı-ayrı iki patatkaya bükülmüş nəsə var. Mən Hümbəti görəməmihdim, səsini eşitmişdim. Aramız bir metr-zad olardı. Soruşduq ki, onlar nədir elə? Dedilər ki, tankçılardır, yanıblar. Ağdərədə dürüstdük onları, Ağdama aparılası idilər.

İsmayıl bizimləydi. Gəldi Tərtərə gecə saat 2 oardı. Sərdar Həmidov xahiş elədi ki, səhər qayıdın döyüşə. Dedi:

Kimin nə problemi varsa desin həll eləyim.

Heç Kim heç nə demədi. Bir nəfər oğlan Əksipara kəndindən «Usta Mamed»in oğlu Elçin—dedi ki, atam operasiya olunur, xəstə bacım var..

Sərdar Həmidov ona dedi ki, gələrsən, səni yola salaram.

Sonra maşınlara göstəriş Verdi ki, bu əsgərləri evlərinə aparın.

Mən Drambomdan gəldiyimiz «ZİL» maşınla Səhlabad kəndinin yol ayrıcında gəldim. Həddindən çox yorğun və yuxusuz idim. Həyətimizə çatanda evə girməyə belə gücüm qalmamışdı. Elə çöldə, divanın üstündə yıxılıb yatdım.

Səhər-səhər gördüm annam deyir:

-- Ayə, bu gədə görün harda gəlib yatıb?! Anamgil səhər tezdən durub malı açanda məni görüblər. Heç doyuncu yata bilmədim. Divanın üstündən zorla durdum. Elə də çıxdım yola görüm maşın varsa sallaşım gedim. Bizimlə birlikdə vuruşanların hamısı könüllüləridi. İsmayıl da Türkiyədən könüllü gəlmişdi. Kəndin içində bir arvad çıxdı qarşıma. Dedi ki, ay bala, sən allah, güllə atma, uşaq qorxur.

Dedim. Ay xala, kimlər bu kəndin içində güllə atırlarsa, onlar döyüşdə olmayan uşaqlardı. Görürsən, silah da yükdür mənə, zorla aparıram. Gecə gəlmişik, səhər də gedirik. Mən burada güllə-zad atan deyiləm.

Gəldim şəhərə. Burda mənə çatdırdılar ki, Vəzir deyib Nəcmədin Sadıxov kombirq bizə 3 gün istirahət Verdi, dincəlin. Gəldim ki, rəhmətlik Vəzir əlində snayper, dayanıb bizi gözləyir.

Burada İsmayıl dedi ki, mən Mingəçevirə gedirəm, axı, 3 gün istirahət veriblər.

Səhərisi gün bir də çıxdım şəhərə. Gördüm ki, rəhmətlik Vəzir yenə snayper əlində buradadı.

Dedim:

-- Bəs sən niyə gedib dincəlmirsən?

Dilxor halda dedi:

-- Bəs «Tərtər-2» Batalyonu «nozisiya»nı verib, 5 meyid qalıb.

İsgəndər Həmidov o ərəfələrdə gəlmişdi Tərtərə . biz nozisiyanı almalı meyidləri mütləq oradan çıxartmalıydıq. 1992- ci ilin avqust ayında burada yığıldıq maşina, getdik. İlham Əyyub, Hafiz, ondan sonra Mayıl, yox Mayıl yaralanmışdı, Ələddin, saleh, Qayıtdıq ora. İndii biz həmin «pozisiya»nı almalıyıq ki, meyidləri götürə Bilək. Ermənininin ayağının altından meyid götürmək elə-belə iş deyildi. Gərək onları öldürəsən ki, sonra meyidləri götürəsən.

18 nəfər sağdan, 18 nəfər soldan irəliləməyəbaşladıq. İsmayıl da bizimləydi, ismayıl sol tərəfdən, 10 nəfər də ortadan gedirdi. Əli kişi də bizə qoşulmuşdu. Tərtərdə nə qədər elədik, dedi ki, yox ey, mən də gedəcəyəm. Oğlu Rafiqə görə gedirdi. O da şəhid olmuşdu. Bayaq dedim ki, Rafiq çox gözəl oğlan idi.

Getdik həmin yüksəkliyə 1000 metr qalmış gördük ki, səs-küy yoxdur. İsmayıla dedim.

-- Birdən qarşılaşma olar

İsmayıl dedi:

-- Vəziri xəbərdar etmək lazımdır ki, onlar yüksəklikdədir biz aşağıda, itki verə bilərik

Vəziyyəti Vəzirə danışdıq və məsləhət istədik. Dedi ki, nə təhər görürsünüz, elə də hərəkət edin.

İsmayıl uşaqları ağacların arxalarına dağıtdı ki, kom durmayaq. Sonra İsmayılın göstərişiylə Atəş açdıq, gördük ki, erməni köhnə «poezisiyası»ndan bizə çıxıb verir.

Nə isə, Meyidlər qaldıqları açıqlıq yerdən götürüldü. Vəzir bizə dedi ki, orda bir dənə patron, bir dənə iz qoymadan hər şeyi götürüb çəkilirsiniz həmin yola, Barlarda Erməni yoxuydu. Sonra məlum oldu ki, burada qalan uşaqlara üç bir, beş bir hərə bir bəhanə ilə, bəziləri mərmi gətirmək Adı ilə bəziləri çörək Adı ilə çıxıb gediblər. Mövqedə uşaq az qalıb. Ermənilər də qalanlarını gülləborana tutub, 4 nəfər yaralanıb, beş nəfərin isə «Gəncə Batalyonu»ndan yakral qalmışdı.

Biz gedəndə bir səs gəlmişdi. Dedilər ki, qayıdanda axtararıq onu. Meyidləri oradan tam çıxarandan sonra.

Vəzir bizi çağırıb təkrarən dedi ki, bir dənə patron, silah qoymayın, hamısını yığın, çəkilin geri.

Fikirləşdik ki, bu bizi niyə 1 kilometr geri çağırır? Meyidləri götürüb qayıtdıq geri.

Qarabala vardı başqa rayondan idi, hətta 1-2 dəfə açıq yerlə onu siqaret, çörək, yemək gətirməyə göndərmişdilər. Mən Tərtər uşaqlarından soruşdum ki, siz bu uşağı niyə göndərirsiniz? Niyə özünüz gəlmirsiniz? Xasay kişinin oğlu Edbarist dedi ki, vallah, özü könüllü gedir. Nə isə, oturduq, İsmayıl Vəzir, mən, bir də Qaradağlıdan Əhəd vardı, rota komandiriydi, o.

Bizim 12 uşaq hələ Drambomdan çıxmamışdı. Onların hər biri üçün 30 min manat pul gəlmişdi. Həmin uşaqlara, içi İsmayıl qarışıq pul paylandı, onu Sərdar Həmidovla göndərmişdi. İsgəndər Həmidovla da hərdən belə mükafatlar göndərirdi. Bız Vəzir dediyi yerə geri qayıtdıq. Oq dedi ki, sentyabrın 1-i biz keçməliyik ermənininin arxasınca. Erməni elə başa düşməlidi ki, biz ordan çəkilmişik geri, heç Kim yoxdur, sakitçilik olmalıdı. Dəstəmiz bir gün qaldı orda. Həmin gün gəlib mükafat kimi pul payladılar. Dövlət döyüşçülərə heç bir qiymət vermirdi.

Uşaqların əziyyətinə görə bəzən pul paylanırdı. Döyüşçülərin balaları da yaşamalı idilər, axı!

Həmin günü rəhmətlik Vəzir mənə dedi ki, sən bu gündən flan «VZVOD»un komandirisən. Mən cavab verdim ki, bu silahla, başımı zorhərləyirəm, məndən «VZVOD» komandiri olmaz.

Dedi ki, uşağı posta düz, gəl bura!

Uşağı düzdüm postlara, ən axırıncı posta uşaq çatmadı. Bir əmioğlum var, Mətləb, ikimiz qaldıq.

Dedim:

--Mətləb, sən burda ol, mən Vəzirin yanına dəyim, gəlim.

Gəldim, gördüm ki, bir postda uşaq çoxdur, ordakı uşaqların bir neçəsini axırıncı posta göndərdim ki, gedin, gəlirəm.

Ümumiyyətlə, qorxaqlığı hiss olunan uşaqlar ölürdülər. Gülədən qorxmayan oğulun öldüyünü görmədim. Gördüm ey, məsələn, Dağıstan kimi Vəzir, Elman, Əli bəy kimi güllədən qorxmayan oğlanlar vardı, elə güllə də onları apardı. Amma qəlpədən ölənlərin sayı daha çox idi.

1 sentyabr idi. 5 nəfəriydik. Vəzir bizi taxıl zəmisinin içiylə apardı. Koçaqod tərəfdən ermənilərin arxasına keçməli idik. Vəzir yenə on nəfər bizi seçdi, yerdə qalana dedi ki, neyləmək lazımdırsa, mən Sizə ratsiya ilə deyəcəyəm.

Sonra seçdiyi dəstənin üzvlərinə planı izah etdi:

--Biz daha arxaya gedəcəyik, birincisi, tankları tapacağıq (onların texnikası daha yaxşı işləyirdi). Drambondan «pozisiya» tutduğumuz əfələrdə erməni texnikasından atılan mərmilər hədəfə dəqiq tuşlanırdı. Biz on nəfər çox çətinliklə adladıq ermənilərin arxalarına.

Deməli, meşənin içidir, çökəklikdir. Vəzir, İsmayıl, Qocu, mən, Əyyub, Fəqan, sonra Mətləbiydi. Mətləb arxadan dedi ki, biz «sep» gedirik, bir sıraynan. Bu, qorxuludur. Sonra əlavə etdi:

--Vəzir, burada erməni var.

Sağ tərəfimiz 30 metr açıqlıq idi. Bir az dikdirə qalxdıq, buradan ağaclar göründü, meşəydi. Mətləb Vəzirə deyəndə ki, burada erməni var, rəhmətlik Vəzir dedi:

--Ə, burada erməniolmalıdı də, ayrı nə olmalıdır?! Oturun aşağı!

Düzü əvvəl həyəcanlandım ki, ətrafımızda erməni var. Vəzir elə deyəndən sonra fikirləşdim ki, düz deyir də, buralarda o köpəkuşağı olmasaydı biz nə gəzirdik ki? «Türk İsmayıl» gətirib mod salmışdı, mənim də başımda onunku kimi «bretka» vardı, ayparalı. Biri də İsmayılın başında idi. İsmayıla zarafatla deyirdim ki, bu aypara uzaqdan parıldayır, bizi vurduracaq! Deyirdi: «Tərsinə qoy».

Hə, Vəzir dedi oturun, özü getdi, iki dəqiqəyə qayıtdı.

Dedi:

--Səs eləməyin, tank burdadır.

Bayaq dediyim o 7-8 metr açıqlıqdan, sonrakı meşəlik demə çökəklik imiş. Vəzir qaranatatanı qoydu çiyninə. Uşaqlara bir də dedi ki, oturun, arxada da erməni var.

Biz daha da həyəcanlandıq. Bir kol da yoxdur ki, girəsən dalına. Kürəyimiz açıq idi. Ot hardasa dizdəniydi. Günorta saat 2 olardı. Mən həmin günü 2 qumbara da götürmüşdüm, heç vaxt götürməzdim, patronu çox götürürdüm, qumbara yox. «Veş-meşoğum»çox olurdu. Bir də ki, yerə uzananda qumbara mane olurdu ona görə götürmürdüm. Qorxub eləmirdik, «Vəzir kimi, İsmayıl kimi oğlanlarımız

varıydı, nə vecimizə idi? Erməni bizə neyləyə bilərdi ki?! Belə fikirləşirdim Vəzir qranatatanı çiyninə qaldıranda mən də qumbaranı çıxartdım. Vəzir atdı. Mən də qumbaranı hazırlamışdım ki, atam. Vəzirin qranatatanının dalğası yerimdə məni fırlatdı. Papağı çıxardıb qoymuşdum yerə ki, onun parılydayan ayparasını görərlər. Mən buruldum, qumbaranı atdım, şarıltı səsi gəldi. Başladı tank yanmağa. Bir erməni qışqırdı, sonra söyüş söydü. Mən də qışqırdım:

--Ə, o nə deyir?!

Vəzir dedi ki, at, qadan alım! Dizimi yerə qoymuşdum, avtomat əlimdəydi. Durdum ayağa və başladım atmağa. Vəzir tankı söndürməyə başladı. Meyid-zad yox idi. Demə Mətləb gördüyü erməni bizə baxırmış. Tankı söndürdük. Erməni arxadan fəğan eləyirdi.biz oradan 200 metr aralaşdıq. Qranatatan 600 metraparır. Başladıq patron doldurmağa. Onlarda bir Kamo vardı, o da onların qoçaq oğlanı idi. O Kamo rus dilind yazmışdı ki, «Mən tək canavar sizin hamınızı yeyəcəyəm».

Mən indii ata-ata çağırırdım:

--Kamo!!!

Ermənicə söyüş söyürdüm, deyirdim:

--Kamo, köpəkoğlu, tez gəl, gəl görək hardasan?! Sonra bir qayaya söykəndim, yekə daşıydı. Qaçan «dığa»Lara ara-sıra güllə atırıq, yenə iki qumbaram vardı, qoymuşdum yerə ki, erməni gəlsə atım. Hər şey öz qaydasında idi. Mağazinləri də doldurdum.

Birdən yadıma düşdü ki, papağım qalıb. Mətləbə dedim:

--Ə, mənim papağım qalıb orda.

Təqribən 20 metr gəlmişdim.

Mətləb də dedi ki, papaq vaxtı döyül, otur aşağı. İsmayıl da dedi ki, ədə, durma!

Dedim:

--Ə, kişi papağını qoyub getməz.

O güldü. Fikirləşdim ki, söz ağzımdan çıxdı, onu yerinə yetirməliyəm. Əyilə-əyilə papağın dalınca getdim. Həmin yerə çatıb, onu götürdüm, gətirdim qoydumbaşıma. «Bretka» başda bir az əyri durur axı. Həm onu düzəldirəm, həm də üzü o yana baxıram, avtomat əlimdədi. Birdən hay eyləyib erməni çıxdı. Tətiyi çəkdim, tullandı, qumbaranı atdım ki, heç olmasa qəlpəsi tuta bunu. O bayaq dediyim Kamo idi. Onun öldüsü-qaldısı blinmədi. Vəzir dedi ki, nədi, nəolub? Dedim ki, belə-belə.

Qaradağlı kəndindən Əhəd vardı.

--Əhəd, istiqamətini düz götür, uşaqlara da de, gəlin bura. «Pozisiya»dakı erməniləri bunlar qırmışdılar. Gəlib bizim yanımıza çatanda Vəzir onlara dedi:

--Mən üstdən Sizi qoruyacağam. Siz enin o yolu kəsin. Ordan üzüaşağı götürüldük. 100 metr qaçmışdıq ki, bir mərmi gəldi düşdü bizim arxamıza. Çığırtı eşitdik:

--Kömək, kömək!!! Geri qayıda bilərdik ki?!. Uşaq az idi, çoxu da arxadaydı. Dərəni enənə kimi dedik ki, bizi qıracaqlar. İri kolların üstündən hoppana-hoppana elə qaçırdıq ki, nə bilim çempionlar bəlkə də belə hoppana bilməzdilər. Dərəni endik, döşə yığılanda, dedim ki, uşaqlar ta bizə ölüm yoxdur. Soruşdular ki, niyə? Dedim:

--Erməni kənddə yoxdu, olsaydı, bizi döyüşdə qırardı. Çıxdıq bir Evin böyrünə, balaca bir eviydi, yaxşı bağ-bağatı vardı. İsmayıl da biznəndi. Gavalı ağacları

bardan burnun yerə qoymuşdu. Allaha And olsun, uşaqlar evə girib «sok» çıxartdılar və başladılar içməyə. Ona kimi Vəzir gəldi, olduq 20 nəfər. Vəzir dedi:

-- Yaman pis iş oldu!

İsmayıl həyacanla soruşdu:

-- Nə olub?!

-- Bizim kənddən Hafiz adlı bir oğlan vardı, onu anası mənə tapşırmışdı, bəs o da şəhid oldu. Mərmidən 3 meydimiz qalıb orada. Yaralanan çox olub. Onları apardılar, meyidləri apara bilmədilər. Qayıdaq, meyidləri götürək. Geri qayıdası olduq, qəbiristanlığın içilə kənddə heç kəs yox idi, lakin yaxınlıqda ermənilərin səsi gəlirdi, biri-birinə çağırırdılar, amma cavab vermirdilər ki, atarlar.

Oradan qayıtdıq Qasamerdlər Çıldıran yolunun ayrıcı var, ora çatmışdıq ki, gördük meşədən tüstü qalxır. Vəzir dedi ki, iki nəfər qəbiristanlığa tərəf getsin. Dedim ki, Vəzir, meşədən tüstü qalxır Vəzir bizi iki dəstəyə böldü, 10 nəfər belə, 10 nəfər belə hərəkət elədik. Getdik ki, ermənilər o birinci vurudmuş tankı işə salıblar, səsi gəlir. Bu bəs ermənilərin arxasından gəlirdi.

Vəzir soruşdu:

-- Görəsən bu nəydi? İsmayıl dedi: ola bilərmi bunlar Goranboy uşaqları olsun? Vəzir dedi ki, onlar bu tezlikdə gələ bilməzlər. Erməni tankı olacaq.

Deməli, tank gəlir, yerimizi bərkitmişik. Hara gəlir, nə təhər gəlir, görmürük, ancaq səsindən bilirik ki, az qalıb çatsa yanımıza. Deməyəsən biz birinci tankı əvvəlcədən göməməişik, gedib arxada 2-ci tankı vurmuşuq.

Məktəblə yan-yanayam, tank gəldi, buruldu üstümüzə. Gözləyirəm, təəccüblənirəm ki, Vəzir niyə vurmur? Elə bu anda Vəzir qumbaraatanı işə saldı. Tank yerində yatdı. 2-ci tankı işə saldılar. Vəzir bu tankı da vurdu, tank dayandı. Quldurlar tankın içindən tökülməyə başladılar. Biz də onları dənləməyə başladıq. İndi tüstü gələn istiqamətdə gedirik. Çatıb gördük ermənilər özlərinin «BMP» 2»-sini yandırıblar ki, bizə qalmasın, qaçıblar. Bütün ərzaqların hər şeylərini yandırmışdılar. Gəldim həmin o üç meyidin yanına. Gördük ki, Hafizlə Sarı kişinin oğlu Ərşaddır. (onların ikisi də çox pis parçalanmışdılar) birinin ayağı budar yox idi, elə bil qəsdən kəsilib atılmışdı başının üstünə. Bir meyidin isə başından qan çıxıb, dodaqlarında qurumuşdu. Kişi, bunun ürəyi işləsə, nə təhərsən? O, ölməmişdi. Bunları götürdük. O anda çəkiliş aparılırdı. Bəlkə də həmin lentlər indii durar. İsmayıl meyidlərin vəziyyətini görəndə dözməyib ermənilərin ünvanlarına ağır söyüş söydü. Həlak olanların cəsədlərini gətirdi Drambon kəndinin içində verdik maşınlara, qayıtdıq dala.

Meşə yoludur, dərə, təpə.. Təpəni qalxdıq, baxdıq ki, sakitlikdir. Qayıdanda 3 nəfər idik, gördük ki, 60-70 nəfər meşədə oturub yeyib içir. Soruşduq:

-- Ə, qaraş hansı batalyonsunuz? Dedilər ki, «Goranboy Batalyonu»ndan.

Dedik ki, a kişi, 20-30 nəfər adam qalıb, irəli getmək lazımdır. Onlar da dedilər ki, irəli getmiyin, arxadan sizə güllə atarlar. Yanımdakılar Ələddinlə Seydimlidən bir oğlan vardı, oydu.

Goranboylulara dedim:

Heç olmasa bir tərəfə çəkilin, mövqeyinizi möhkəmləndirin, bura açıqlıqdır, mərmi düşsə, hamınız öləcəksiniz.

Məni eşitmədilər. Onlardan aralandım. Dedilər ki, çörək ye. –sağ olun!

Nə isə, çəkildim sola. Elə bil mənə dedilər ki, keç ağacın arxasına. Mən ağacın arxasına keçdim. Onda gördüm ki, mərmi aldılar. Elə başa düşdüm ki, bunlar atdı.

Allaha And olsun gördüm ki mərmi partlayanda bunlar nə təhər dağıldı! Biri elə yerdə qalmışdı, sol qılçası göydəydi. Bu vəziyyətdə o qışqırdı:

-- Yaşa, Azərbaycan, yaşa!

Yüyürdüm ona tərəf ayaq dizdən aşağı yox idi, sümük çölə çıxmışdı. Rezinlə budunu bağlaya bilmədim, dizindən bağladım, jqut qızıldı, bir-təhər sıxdım. O biri yoldaşları qaçırdılar. Çığırıb-bağırıb, dörd nəfərini geri qaytardım. Onlara dedim:

-- Hara qaçırsınız? Axı, ikini mərmi də düşə bilər! Deməli dörd nəfər onlar, bir nəfər mən beş də yaralı endik aşağı, kəndə çatanda xəbər verdilər ki, Vəzir yaralanıb, amma «Təcili yardım» getmək istəmir. Möhkəm əsəbiləşdim, dedim:

--Ə, nə danışırsınız? Necə getmək istəmir. Hanı o «Təcili yardım?»

Dedilər:

--Evin arxasındadır.

Getdim ki, «Təcili yardım»ın sürücüsü oturub, həkim də böyründə.

Dedim:

--Niyə getmirsiniz?!

Dedilər ki, yol minalıdır. Bunların üstünə yeridim:

--Düşün aşağı, özüm gedəcəyəm!

Gördüm ki, yox, bunlar yerlərindən tərpənmir, silah çəkdim:

--Düşün maşından!—deyə qışqırdım. Mina-zad yoxdur. Varsa da cəhənnəmə olsun!

Oturdum maşina və sürdüm. Gördüm ki, döşlə bir nəfər gəlir, baxdım ki, Mətləbdir. «təcili yardım» üçün gəlir. Allaha and olsun, o gələndə nə vəziyyətdəydimsə, fikirləşirdim ki, erməni məni bu vəziyyətdə görsə, bəlkə də atmazdı. Mən də ermənini mənim halımda görsəydim, atmazdım.

«Təcili yardım»ı necə sürdüyümü hiss etmirdim. Gəldim ki, Pasaqamenlə Çıldıranın ayrıcında Vəziri uzadıblar yerə. O, arxası qatdadır.

Vəzirin ayağı sarıqlı idi, özü sarımışdı. Hafiz də buradaydı, rəngi qaçmışdı. Zahid adlı bir oğlan da buradaydı.ondan soruşdum ki, sən hara gedirsən?

O, Vəzirə nə demişdisə, Vəzir mənə dedi:

--Suliddin, qoy mənnən getsin.

Qalxdıq Çıldıran yüksəkliyinə, budundan yaralanmışdı, güllə bir tərəfdən dəyib o biri tərəfdən çıxmışdı, arteriya damarını qırmışdı, ona görə Qanı axırdı, kəsmək bilmirdi. Səhv eləmirəmsə, İsmayılla getdi Vəzir. İsmayıl dedi ki, Vəziri tək yola salmaq olmaz.

Gecə qaldıq yüksəklikdə.

Sentyabrın 3-ndə İsmayılı «Tərtər Batalyonu»na komandir təyin eləmişdilər. İsmayıl gəldi. Bizim içimizdə də sarsaq adamlar vardı. Onların gözü İsmayılı götürmürdü. Çünki, İsmayıl hər bir əməliyyatda elə qəhrəmanlıqlar göstərirdi ki, bunu hər döyüşçü bacarmırdı. İgidliyi ona qısa zaman kəsiyində yüksək ad-san qazandırmışdı. Hər yerdə Vəzirlə onun qoçaqlığından danışırdılar. Bunu gözügötürməyənlər bizim içərimizdə də vardı (Adlarını özüm qəsdən çəkmirəm ki, onlardan öləni də var, sağ qalanı da. Vaxt gələr, adlarını deyərəm). Onlardan biri hətta mənim yanımda dedi: «Bizim özümüzə nə olub ki, bir türk gəlib başımızın üstündə komandirlik etsin?». İsmayıl da bunu eşitdi. Mən həmin uşağın cavabını versəm də, artıq gec idi, İsmayılın ürəyi sınmışdı. Halbuki onun Tərtər rayonunun erməni quldurlarının qorunmasında çox əziyyətləri olmuşdu. Ermənilərin qanını isirdi. Onun Adı düşmənlərin içində də məşhurlaşmışdı. Tərtər onun üçün çox doğmaydı. O, deyirdi ki, mən Tərtərliyəm, o, Tərtərlə və tərtərlilərlə mən də elə

bilirdim ki, İsmayıl tərtərlidir, mənim qardaşımdır. Həqiqətən də elə ürək yeyəsidi. Onun qəhrəmanlığını bizimkiləri çoxu edə bilməzdi, yəni burdan basıb gedib Türkiyədə müharibəyə atılmazdı. Gör onda nə qədər vətənpərvərlik, nə qədər qeyrət var ki, o İqdırdan gəlib Tərtərdə döyüşürdü. Halbu ki, özümüzünkülərin çoxu qaçıb gizlənirdi ki, döyüşə getməsin.

Deməli, onun gedişi heç birimizə ləzzət eləmədi, dedim ki, kaş Tərtərin müdafiəsinə gələnədə yanında iki nəfər də vardı, onlar 1-2 gündən sonra yoxa çıxdılar. Getdilər, amma İsmayıl Çardaxlı döyüşündə ağır yaralandısa da, getmədi, kürəyini başını qəlpələr deşik-deşik eləmişdi.

İsmayıl axıra kimi bizlə getdi döyüşdü, özü də müharibənin ən qızğın vaxtlarında. Levonarodan Çıldırana kimi 30 eilometrə qədər irəli getdik, erməniləri darmadağın elədik. Vəzir rəhmətə gedəndən sonra İsmayıl yenə qaldı, heç yana getmədi yenə döyüş musiqi məktəbi deyildi ki onu ora  müdür qoyalar. Burda ölüm itim vardı, ermənilərlə müharibə vardır.İsmayıl kəfənini geyib gəlmişdi ki, döyüşsün, lazım gələrsə bu yolda ölsün. O, komandir olanda nə olasıydı ki?  Komandir həmişə irəlidə gedir, İsmayıl da irəlidə  gedirdi. Güllə dəysəydi birinci ona dəyəsiydi. Atsaydılar İsmayılı birinci atacaqdılar. İsmayıl pul qazanmağa gəlməmişdi ha. Ona görə də İsmayıl incimişdi. Fikirləşdi ki, birdən urvatsız ölər—arxadan vurarlar onu.



**Məmmədov Pənah Ağamalı oğlu**

***1961-ci il mart ayının 13-də Tərtər rayonunun Balakəngərli kəndində anadan olub.***
***Cəmilli kənd orta məktəbini bitirib.***
***1977-1982-ci illərdə Azərbaycan Poltexnik İnstitutunda oxuyaraq ali təhsul alıb.***
***1982-ci ildən 1984-cü ilədək Sovet Ordusu  sıralarında Belarusiyanın Bres şəhərində baş leytenant rütbəsində hərbi xidmətdə olub.***
***1991-ci il dekabr ayının 13=dən Azərbaycan Respublikası medafiə nazirininəmrilə "Tərtər" Özünümüdafiə Batalyonuna qərargah rəisi təyin edilib.***
***1994-cü il may ayının 12-nə ("Atəşkəs"ə) kimi müharibədə iştirak edib.***
***3 dəfə yaralanıb.***
***İsmayıl Tuncla döyüş yoldaşı olub.***
***Hazırda Tərtər şəhərində yaşayır.***
***Üç övladı var– Pünhanə, Dilsuz və Pərviz.***

1961-ci il mart ayının 13-də Tərtər rayonunun Balakəngərli kəndində anadan olub.
Cəmilli kənd orta məktəbini bitirib.
1977-1982-ci illərdə Azərbaycan Politexnik İnstitutunda oxuyaraq ali təhsil alıb.
1982-ci ildən 1984-cü ilədək Sovet Ordusu sıralarında Belarusiyanın Brest şəhərində baş leytenant rütbəsində hərbi xidmətdə olub.
1991-ci il dekabr ayının 13-dən Azərbaycan Müdafiə Nazirinin əmrilə «Tərtər» Özünümüdafiə Batalyonuna qərargah rəisi təyin edilib.
1994-cü il may ayının 12-nə («Atəşkəs»ə)kimi müharibədə iştirak edib.
3 dəfə yaralanıb.

İsmayıl Tuncla döyüş yoldaşı olub.
Hazırda Tərtər şəhərində yaşayır.
Üç övladı var—Pünhanə, Dilsuz və Pərviz.
Mən tərtərliyəm.
«Tərtər» Özünümüdafiə Batalyonunun yaranmasında iştirak etmişəm. Boris Zöhrabov hərbi komissar olan dövrdə Milli Qəhrəmanımız Elman Hüseynov batalyonu yaradarkən 1991-ci il dekabrın 13-də qərargah rəisi təyin olunmuşam.
Ağdərə uğrunda gedən döyüşlərdə birbaşa iştirak etmişəm.
Rəhbərlik etdiyimiz «Tərtər» Batalyonunun Ağdərəninin alınmasında xüsusi xidmətləri olub. Bu da rəhmətlik Elman müəllimin, Vəzir Orucovun hər ikisi Milli Qəhraman adına layiq görülüb, və digər igid oğlanların hesabına baş verib.
1994-cü ilin may ayının 12-nə kimi-atəşkəs dövrünə qədər 703 saylı hərbi hissədə xidmət eləmişəm. Və ehtiyat «vzvod»unun komandiri, sonra da hərbi komissar təyin olunmuşam. Xidmət elədiyim dövrdə döyüş əməliyyatlarında üç dəfə yaralanmışam.
İsmayılla 1992-ci il, səhv eləmirəmsə, avqust ayının 3-ü, ya 4-ü Levonarxda tanış olmuşam. Mən yaralı idim. «Cem», bir də İsmayıl Tunc müraciət ediblər ki, bizi İsgəndər Həmidov göndərib., batalyona qəbul olunmaq istəyirik. Mən onların müraciətlərini dinlədim, əvvəl sınaq müddətində yoxladı, sonra qəbul elədik batalyona. Onda mən onlardan soruşdum ki, indiyə kimi hansı döyüşlərdə iştirak eləmisiniz? Gördüm ki, vətənpərvər insanlardır. «Cem» dedi ki, mən terrorizmə qarşı mübarizədə Türkiyə jandarmasının tərkibində iştirak etmişəm, bütün silahlardan da atmağı bacarıram.
İsmayıldan da soruşdum ki, sən hansı döyüşlərdə iştirak etmisən? O dedi ki, bütün döyüşlərdə. Mən konkret müəyyənləşdirmək istəyirdim ki, Qarabağ döyüşlərində iştirak eləyib, yoxsa yox? O dedi ki, mən Bakı şəhərində müstəqilliyimizi, azadlığımız uğrunda gedən döyüşlərin iştirakçısıyam.
1992-ci ilin əvvəllərində dövlətçiliyimizə qarşı törədilən sui-qəsdin qarşısının alınmasında, Ali sovetin azad ounmasında iştirak edib.
Silahlardan istifadə etməyi, döyüş texnikasını bildiyi üçün İsmayılı da batalyona qəbul elədik. O, təxminən sentyabrın 4-5-nə kimi bizim batalyonda döyüşdü. O dövrdə Ağdərə uğrunda çox qızğın döyüş əməliyyatları gedirdi. İsmayıl döyüşə əsas Levonarx Akopkamari istiqamətində başlamışdı. Sonralar da bir neçə döyüşlərdə fəal iştirak edib.
Bizim Milli Qəhrəmanımız Vəzir Orucovun qrupunda kəşfiyyatlara gedib, döyüşlər keçirib. O döyüşlərdə birbaşa düşmənin arxasına keçərək fikri yayındırır, əsas diqqəti özlərinə cəlb edirdilər. Bizim qoşunlar da hücum edib, həmin ərazini alırdılar. Həmin dövrdə Akopkamaridə biz düşmənin 3 texnikasını götürmüşdük. İsmayıl da bu hücumda iştirak etmişdi. Sonrakı dövrlərdə İsmayıl Sərsəng Su Anbarı istiqamətində gedən döyüşlərin də fəal iştirakçısı oldu.
«Cem» batalyondan tez getdi. İsmayıl isə vətənpərvər bir oğlan kimi bizimlə olduğu müddətdə özünü yaxşı döyüşçü tək təsdiq etdi. Bilirsiniz, Türkiyədən gəib Azərbaycanın torpaqları uğrunda lap bir gün də olsa vuruşmağın özü həmin adamın necə bir qeyrətli oğul olduğunu göstərir.
Mən İsmayılı belə bir vətənpərvər və qeyrətli oğlan kimi tanımışam. Bir var belə oğul olsa, bir də var…
Bir dəfə, təxminən 1995-ci ilin, ya da 1996-cı iln may ayında Şakir Şıxəliyev adında Bərdədə bir müstəntiq sual Verdi ki, Hüsənlidən Cəfərov Əliyar Bəhlul oğlu vardı, o fərari idimi?

175 saylı hərbi hissə vardı, Güzdəkdə yerləşirdi. O həmin hərbi hissəni qoyub, Tərtərə müharibəyə gəlmişdi, mən də bizim batalyona qəbul eləmişdim. Sonrakı dövrdə dedilər ki, bu niyə ordan qaçıb? Fəraridir, tutub aparıb salıblar içəri. Halbuki o burda çox ciyərnən döyüşürdü.
Müstəntiq dedi ki, bu Şakir Şıxəliyev niyə qaçıb? Mən də dedim ki, bu uşaq qəhrəman oğlandır, müharibədə iştirak edib. 7 nəfər göndərmişəm kəşfiyyata, onun 6-sı qalıb orda, şəhid olublar, yalnız bu yaralı çıxıb, gəlib, gözlədiyimiz yerdə qarşılamışıq, lazımi məlumatlar gətirib. Əlyar öz vətəninə layiqincə xidmət edib. Bunu tutmaq olmaz, axı! Özü də bu Tərtəri müdafiə eləyən oğlanlardan biri olub.
Müstəntiq mənə sual verdi ki, buna niyə silah verirdin? Fərari idi.
Mən də cavab verdim ki, o dövrdə ermənidən başqa hansı millət Tərtərin müdafiəsilə bağlı mənə müraciət eliəsi idi, ona silah verərdim ki, Vətəni qorusun, bu da Vətəni qoruyanlardaqn biridir. Həmin müstəntiq həyasızcasına dedi:
-- Səkkiz rayon gedibdi, cəhənnəmə ki!
Tərtər getsə nə olasıydı?!
Belə deyən də Bərdədə Qarabağ Qarnizonunun bu müstəntiqinə babat bir qapaz vurdum. Onu az qala öldürürmüşəm, əlimdən zorla alıblar. Elə oradaca göstəriş verdi ki, məni tutsunlar. Orada hərbi prokurorun əvəzi Zümrah Xudiyev vardı, mənim dostum idi.
Dedi:
-- Ə, bu qəhrəman oğlandır, onu hara tutursunuz? Bizi sakitləşdirəndən sonra apardı öz otağına. Deyirəm:
Əşi, bu nə təhər müstəntiqdi, nə təhər adamdı? Özü də Şamaxılıdı, 55-56 yaşı var. Mən öz əsgərimi müdafiə etmək üçün belə deyirəm, bu da deyir ki, 8 rayon gedib, cəhənnəmə ki, Tərtər getsə nə olasıdı?! Bunun müqabilində mən bunu öldürməyim, bəs neyləyim? Sonra o, məni sakitləşdirib birtəhər yola saldı. Sonralar həmin müstəntiq məndən təqdimat yazdı Müdafiə Nazirliyində hərbi komissar Faiq Bağırov idi. Biləndə ki, mən bunu nə üstündə vurmuşam, dedi:
-- Ə, sən kişi adamsan, lap yaxşı eləmişəm! Yaxşı ki, hələ öldürməmişəm, ermənidən başqa Kim olsa ona silah verəsi idim. Bizdə hollandiyalı vardı—Yohan. O «veş-meşaokla», iynəsiylə-sapıyla, formada gəlmişdi ki, Qarabağ uğrunda vuruşacağam. Çeçnlər vardı, ruslar vardı ukraynalı Vitalik vardı. Bunlar hamısı bizim torpağımız uğrunda vuruşurdular. Mən onlara necə silah verməyə bilərdim? Ukraynalı Vitalik qəhrəmanlıq göstərirdi. O, şəhid olanda valideyinləri gəldilər, qəbrini götürdülər dəfnində iştirak etdilər. Dəfni dövlət səviyyəsində təşkil olundu. Belə epizodlar çox olub.belə cəsur oğullar gəlirdilər, qəbul edirdik. O cümlədən də İsmayılı qəbul etmişdik.
İsmayıl hə o vətənpərvər idi, həm də döyüşçülər arasında ruh yüksəkliyi yaradırdı. Hamı bilirdi ki, o Türkiyədən gəlib bizdə döyüşlərdə iştirak edir. 5 nəfər-10 nəfər başa düşməsə də, əksəriyyət başa düşürdü ki, bu Türkiyənin köməyidir. Əslində Tərtər camaatının hamısı qəhrəmandır. Biz 100 metr o tərəfdə səngərdə idik, amma elə burada da mərmi camaatın təpəsinə tökülürdü də, müharibə elə burada da gedirdi. Yəni bu, danılmaz faktdır, bu mövzu elə mövzudur ki, saatlarla, günlərlə danışmaq olar.
Müharibənin ən çətin günü mənim üçün Vəzirin ölüm günü olub. 1993-cü ilin mart ayının 22-si. Bu, mənim ən ağrılı günümdür. Mən onun ölmünü eşidəndə rabitə xəttində də ağladım. Onun meyidini vurulduğu yerdən götürmək bir az çətin idi. Mən Fəqan Qurbanova göstəriş verdim ki, bir başa döyüş yerinə gedib onun meyidinin çıxarılmasını təşkil etsin.

Nizami Heydərov, Himayyət Qubadov, Rafiq Məmmədov kimi əsl döyüşən oğlanlar vardı.
Fəqan mənə rabitədə dedi ki, Vəzir yoxdur. bütün müharibə dövrü ərzində eşitdiyim ən ağır söz idi bu söz. Bəlkə heç indidə özümə gələ bilməmişəm. Çünki, Vəzir, Vəzir idi. Onun döyüş epizodları çox-çox olub. Müharibəni Ağdərə istiqamətində Vəzir aparırdı. «Tərtər» Batalyonunda Elman müəllimlə bir başa xidməti olan adam idi Vəzir.
Tərtərlilərin hamısı döyüşüb. Bir başa döyüşün içərisində olan şəxslərin hamısı təsdiq edər ki, müharibə çox çətin işdir. Döyüşdən salamat çıxmağın özü də qəhrəmanlıqdır. O adamları qiymətləndirmək, sağ qalıbsa komandirlərin, sağ qalmıyıbsa silahdaşlarının mənəvi borcudur. Mən də özümə borc hesab edirəm ki, döyüş yoldaşlarımın xatirəmini həmişə hörmətlə yad edin.
Müharibə dövründə çox şəhidlərimiz olub. Elman müəllim, Talıstan, Tahir, Rafiq,və s. Vəzirin ölümü isə bütün Azərbaycan ordusuna təsir etdi, eləcədə mənə. Ermənilərin bir Əfqanıstan qəhramanı var idi, «Qoralisa» deyirdilər, o, Ermənistanın Müdafiə Nazirinin qardaşı idi. Onu bizimkilər vurmuşdular. Vəzir vurulanda onlar toy-bayram etmişdilər ki, qəhrəmanın intiqamını aldıq, yəni onlar öz milli qəhrəmanlarına uyğun bir adam öldürdüklərinə görə sevinirdilər. Vəzir mənim qardaşıma bərabər olan adam idi. Ona döyüşçülərin o qədər inamı, o qədər istəyi vardı ki, Vəzirin ölümünə heç kim inanmırdı. Yəni Vəzir öz qəhrəmanlığı ilə döyüş yoldaşlarının nəzərində öməzlik qazanmışdı. Ona görə də şəhid olanda uşaqların hamısı heyrətdən donub qalmışdı: «Yox, Vəzir ölə bilməz! O bizi qoyub, gedə bilməz!»
Hər hansı bir şəxs müharibə dövründə deyə ki, mən qorxmamışam, yalan deyir, ya o xəstə adamdır, ya psixi cəhətdən zəifdir, yaxud normal adam deyil.
Döyüşən əsgərlərə əsl komandirlik etməyin özü qəhrəmanlıqdır. Əgər mən şəxsi heyəti düzüb, anna-bacılarımızın qeyrətini qorumaqdan danışıb döyüş tapşırığı verəndən sonra hücuma keçərkən dala qaçıramsa, məndən komandir çıxmaz. Komandir həmişə öndə getməlidir ki, əsgərlərinin inamını qazansın. Məsələn, niyə mən daim qabaqda gəlmişəm, niyə dəfələrlə yaralanmışam, heç bir əməliyyatdan kənarda qalmamışam? Ona görə ki, sadəcə olaraq mən əsgəlrərimə verdiyim sözü yeyə bilməmişəm. Əgər mən həmin dövrdə geri qalsaydım, başqaları deyərdilər ki, bundan komandir olmaz. Hardasa Nizami Heydərov da belə olub, rəhmətlik İslam müəllim də, Ədalət paşayev də, mehrac Mahmudov da belə olublar. Onlar sözlərini deyəndən sonra üstündə durublar. Deyiblər ki, gedirik bu mövqeyi almağa, gediblər və alıblar. Əgər qorxaqlıq eləsə idilər, onda nə Vəzir Vəzir olardı, nə də Mehrac Mehrac olardı. Bu qorxu hissi kimdə varsa, ondan qəhrəman olmaz. Ona görə də qorxmazlar cəsarətli və qəhrəman olurlar. Məsələn, Pəviz İsmayılov kimi. Onun elədiyi bəlkə də misli görünməyən bir qəhrəmanlıqdır. Özün biləsən ki, sən burada öləcəksən və buna da razı olasan!
Tank mərmi iri bir ağacı qırıb, Pərviz İsmayılovun üstünə salmışdı. Onun bel sümüyü sınmışdı. Mərminin «balvanka»sı isə Hüseynov İlqar Məcid oğlunun sinəsini batırmışdı. Rafiq Məmmədov tapşırıq aldı ki, Pərvizi ordan çıxartsın. Təsəvvür eləyin, Rafiq Pərvizi ağacın altından çıxarmaq istəyəndə ona söyüş də söyüb deyib ki, məni tərpətmə, «PK» pulemyotu doldur qoy qabağıma, mən düşməni saxlayacağam, siz sağ-salamat geri çəkilin. Pərviz vəziyyətdə döyüşə-döyüşə də şəhid oldu, uşaqlar da sağ-salamat geri çəkildilər. İlk vaxtlar ermənilər imkan verməmişdilər ki, onun meyidini götürsünlər, sonra götürmüşdülər
Bu, əsl qəhrəmanlıq epizodudur., «Tərtər» batalyonunun qəhrəmanlıq nümunəsiydi. O, Səhləbaddan idi, özü də babasının, nənəsinin himayəsində yaşamışdı. Eləcə də Şamil.

«Malış» bir uşaqdı, rus ordusundan yarımçıq gəlmişdi, familyası yadımdan çıxıb., şəhid oldu, Düyərlidən idi. Üç dəfə yaralanmışdı, ancaq müharibədən geri çəkilməmişdi. Görün bu uşaqların qəlbi nəymiş!
Seymur Ağayev, bizim o vaxt «vzvod» komandiri olub. İndii pensiyadadır, zabitdir.
Bu yaxınlarda Şamilin anası ilə rastlaşanda məni qucaqlayıb öpdü və dedi:
--Sağ ol, Pənah müəllim, siz vaxtıilə mənim oğluma yaxşılıq eləmisiniz. Toyunda da köməklik göstərmisiniz.
Seymurla Şamil döyüş yoldaşı olublar. Əhd-peyman ediblər ki, oğlumuz olsa, hansımız ölsək, onun adını qoyaq övladımıza.
Seymurun oğlu olur. O gedir Şamilgilə ki, bizim əhdimiz vardı, mən istəyirəm, oğlumun adını Şamil qoyam. Xahiş edirəm etiraz etməyin.
Sonra çıxarıb zorla da olsa Şamilin anasına nə qədərsə pul vermək istəyib. Ana bu maddi yardımı götürmək istəməyib.
Bu hadisə mənə o qədər təsir göstərdi ki, zəng elədim Seymura, ona minnətdarlığımı bildirdim. Dedim:
--Seymur, mən eşitmişdim ki, sənin həmişə onlara köməyin dəyib. Çox sağ ol! Sonuncu hərəkətin isə məni lap riqqətə gətirdi, qardaş!
Belə insanlar da var.
Seymur Tərtərin Əksipara kəndindəndir. Müharibə ilə bağlı çox ağır məqamlar, xatirələr var ki, danışsam, insanları dəhşətə gətirər.
Bu, tarixdir.
Bir jurnalist vardı, Söhbət Səfərli. «Azərbaycan» qəzetinin müxbiri olub, 1993-cü ilin mart ayının 5-də Sərsəng Su Anbarı əməliyyatında mənə müraciət elədi:
--Sən komandirsən, bu geri çəkilməyin səbəbi nədir?
Cavab verdim :
--Dediyim kimi yazacaqsansa deyim yox, əgər aparıb qolun-qılçasını qırassansa, onda mənə lazım döyül.
Çox dirəndi. Axırda dedim:
--Əgər dediklərimi dəyişsən, səni sonra tapıb öldürəcəyəm!
Müharibə başımı qatdı, qəzet elə o vaxtlar çıxar, bilmərəm. 1997-ci il iyunun 24-də həmin material «Azərbaycan» qəzetində çap olunar. Başlıqda belə yazılar: «Baş leytenant Pənah Məmmədovun 1993-cü ilin mart ayında dedikləri».
Həmin qəzet məni türmədən qurtardı.
Sürət Hüseynovun işini aparan müstəntiq məndən soruşdu ki, o vaxt hərbi hissələr niyə geri çəkildilər. Mən də izah etdimi ki, vəzifə üstündə. O mənə inanmadı. Mən bir daha təkrar etdim ki, vəzifə almaqla bağlı olaraq Sürət qoşunu geri çəkdi, ona görə də Ağdərə getdi. Bu yenə inanmadı. Səhər saat 10-dan axşam saat 6-ya kimi oturmuşuq belə qabaq-qabağa, mən deyirəm, bu yazır, amma inanmır. İyunun 25-i günü idi, 24-ü isə qəzet çıxıb.
Dedi:
--Səhər də gəlib izahat verməlisən.
Dedim:
--A qardaş, sən mənə inanmırsansa, mən neyləyə bilərəm? Dediklərim faktdır. Məndə yalan söz yoxdur. Vaxtilə bizi çox siyasi oyunlara qatmaq istəyiblər, ancaq «Tərtər» Batalyonu qatılmayıb. Sən niyə məni bu oyunlara qatmaq istəyirsən? İndi mənə inanmırsan?
Dedi ki, yox. Qəzeti çıxarıb dedim:

--Sənə bir sənəd göstərsəm ki, indi bu dediklərimi 1993-cü ilin martında demişəm və söylədiklərim təsdiqini taparsa, məni buraxarsanmı çıxıb gedim?
Dedi ki, hə.
Qəzeti ona verib dedim:
Bu qəzeti oxu, «Azərbaycan» qəzetidir, dövlət qəzetidir.
Götürdü qəzeti, oxudu, oxudu. Sonra əl verərək məni qucaqlayıb öpdü ki, sən kişi adamsan. Dediklərin tamamilə düz imiş. Gedə bilərsən. Yazılardan gedir söhbət. Düz yazandan sonra, hansı dövr olur-olsun ortaya çıxanda görürlər həqiqəti yazmıham heç kəs incimir, hamının xohu gəlir. İndii Tofiq müəllim döyüş iştirakçılarının şəxsən özləriylə söhbət edib, onların dediklərini olduğu kimi qələm almağınız çox yaxşıdır. Çün ki, belə halda tarixi faktlar necə var elə yazılır. Vəzir Orucovu, Pərviz İsmayılovu, Mehrac Mahmudovu göstərə bilərəm. Bir dəfə Mehrac o qədər «PK»-pulemyotundan güllə atmışdır ki, qıpqırmızı qızarmış lüləsi onun qolunun üstünə düşüb yandırmışdı, amma o bunu hiss etməmişdi.
Nizami Heydərovun qəhramanlığını danışsaq bir kitab yazmaq olar. Suliddin Yusibov yaxşı döyüşürdü. Bu igidlərin çox döyüşləri olub.
Sərsəng istiqamətində Suliddin yaralananda «BMP»-dən onu özüm çıxardıb qucağımda gətirib qoymuşdum «Təcili yardım»a, apardılar.
1992-ci ilin avqust ayında çox ağır döyüşlər oldu. Süliddin də həmin döyüşlərdə cəsarətlə iştirak edib. O, Vəzirlə irbaşa silahdaş idi. Hafiz Quliyevdə Vəzirlə birlikdə vuruşmalarda iştirak edib. O, qoçaq bir oğlandı, neçə əməliyyatda şücaət göstərib. Habil Əliyev də igid oğlandı. O, döyüşlərin birində ağır yaralandı.
Elman müəllim rəhmətə getdi. O vaxt mənim qolum işləmirdi, qıçım işləmirdi, yaralanmışdım. Amma Nəcməddin Sadıqovun göstərişi ilə gecəynən məni yataqdan qaldırıb gətirdilər. Bu olubdu iyunun 8-də, 1992-ci ildə.
O vaxt Ağdərədərəni 2-ci dəfə erməni almışdı, bizim batalyonu da ləğv eləmişdilər. Batalyonu yenidən yığmaq lazım idi. 1992-ci il iyul ayının 28-də gəlib yığışdıq. Elman müəllim, Boris Zöhrabov, Fəqan Qurbanov, Ədalət Paşayev, Vəzir Orucov və başqaları səhərə kimi gözlədik ki, batalyonun uşaqları gəlsinlər, bunu nahaq dağıdıblar. Batalyonu bərpa etdik. Təkrar edirəm ki, iyulun 5-də Ağdərəni aldıq. Alan günün səhərisi «Tərtər» batalyonunu ləğv etmişdilər. İyul ayının 28-də erməni Ağdərəni alanda təzədən göstəriş verdilər ki, batalyon yığılsın.
Nəcməddin Sadıqov mənim arxamca maşın göndərmişdi ki, yaralı vəziyyətdə olsa da, deyin gəlsin. Gəldim icra hakimiyyətinə. Ora-bura zəng eləməklə batalyonu yığdım. Bizi Levonarxa göndərdilər. Batalyonda 220-yə yaxın uşaq var idi. Qanuni, sənədli-zadlı. Mənə komaqndir olmağı təklif etdilər, amma mən çəliklə yeyriyirdim, qıçım işləmirdi.
Müraciət elədim şəxsi heyətə ki, indiyənədək komandir olmuşam. (Elman müəllimi müəyyən səbəblərə görə komandir qoymamışdılar!. Təklif elədim ki, Vəzir Orucov sizin komandir olsun. Mən dözə bilmirəm, qolum, qıçım işləmir.
Siz Vəzirdəki cəsarətə, qağiliyyətə, ürəyə baxın ki, dedi:
-- Yox,
Pənah müəllim, sən bizim komandirimizsən, mənə göstəriş ver, haranı lazımdır, alacağam. Sənə də dörd nəfər ayıracağam ki, xərəklə də olsa hara lazımdır, çiyinlərində ora aparacaqlar. Sən ancaq mənə gëstəriş ver.
Bilirsiniz, döyüşə rəhbərlik, etmək idarəetməni bilmək asa niş deyil. Vəzirin gözəl komandirlik bacarığı vardı. Lakin o mənim təcrübəli hərbçi olduğunu bildiyindən belə deyirdi.

Vəzir rəhmətə gedəndən sonra Nizami Heydərov batalyonu idarə elədi döyüşdü. Bunlar birbaşa məndən tapşırıq alırdılar və döyüşün içində olurdular.
Vəziri bir istiqamətdə göndəriridim. Elman müəllim bir qrupla başqa səmtə gedirdi. Himayət ayrı bir qrupla Ədalət də bir qrupla.
Bir dəfə ağır bir döyüş tapşırığı yerinə yetirilməsi idi. Uşaqları yığıb dedim:
-- Kim ölümə getmək istəyirsə bu əməliyyatda iştirak eləsin. Vəzir uşaqları düzdü. Birinə dedi sən filan yerdə qoyub qaçmısan, mənlə döyüşə gedə bilməzsən.
Mən deyəndə ki, Kim ölümə getmək istəyir? Səhlabaddan Dağıstan Əzizov vardı, qara oğlan idi, birici o çıxdı qabağa. Baxdım-bıxdım, fikirləşdim ki, nə ürəkli oğlanda bu öz ölümünə razıdır.
Vəzir 27 nəfər seçdi.
Əməliyyat bitdi. 35-ə yaxın erməni qırdıq, 3 zirehli texnika götürdük. Kasetdə də var, o döyüşü çəkiblər.
Dağıstan vurulmuş erməniyə tərəf yeriyir ki, onun avtomatını götürə, elə bilir ki, öldürüb. O köpəkoğlu erməni deməyəsən ölməyibmiş. Dağıstanı düz alnından atmışdı. Həmin döyüşdə itkimiz Dağıstan olmuşdu
Vəzir telekameranı yaxına qoymurdu. Jurnalist Abbas (o indii kinoda işləyir) döyüşü çəkirdi ki. Nə qədər dedim ki, Vəzir, döyüşü çəkirlər, onları mən göndərmişəm, bir söz de.
Dedi:
-- Pənah müəllim neynirsən? Gərək deyil.
Bir kəlmə söz demədi. O belə oğlu idi. Mən belə hadisələrdən çox danışa bilərəm. Qəhrəmanlarımız çox olub. Oruc kişi var idi, hardasa sentyabrın 24-də rəhmətə getdi, 1992-ci ildə Ağdərənin bütün kəndlərinin yollarını tanıyırdı, Sərsəngdə işləmişdi. O uşaqları elə aparırdı ki, erməni birdə ayılıb görürdülər təpələrinin üstündəyik. Bir dəfə 150-yə yaxın erməni qırmışdıq, Elman müəllim özü şəxsən saymışdı. Onda 87 ovtomat qənimət götürüb təhvil vermişdik. Bu hadisə Kanalın üstündə olmuşdu. Sərsəng Su Anbarında da 80 nəfər «molodoy» erməni qırmışdıq. İnqilab gilin rotası da bu döyüşdə iştirak etmişdi. Suliddin də ordaydı.
Ermənilərin hələ açılmamış təzə «veş-meşok»larında ağ «suxoy» spirtləri, diş pastaları, ümumiyyətlə, hər şey vardı.
80 erməni meyidləri özüm ayaqlaya-ayaqlaya saymışam.
Mən İsmayılın Türkiyədən bura döyüşməyə gəlməyini çox yüksək qiyğəmləndirirəm. O, gəlməyə də bilərdi, küncdə-bucaqda qala bilərdi. Amma o gəlmişdi, döyüşlərdə iştirak etmişdi, biz bunu qiymətləndiririk.



**Heydərov Nizami Firuddin oğlu**
***1956-cı ilin aprel ayında Bərdə rayonunun Kətəlparaq kəndində anadan olub. Həmin kəndin orta məktəbini bitirib. Təhsilini Gəncə İnşaat Texnikumunda davam etdirərək ixtisas alıb.***
***1974-1976-cı illərdə Sovet Ordusu sıralarında xidmət edib.***
***1992-ci ilin yanvarından ermənuilərə qarşı aparılan mübarizəyə qoşulub. 1995-ci ilə kimi xidmətdə olub. Azərbaycanın Milli qəhrəmanları Vəzir Orucov və Elman Hüseynovla birgə döyüşlərdə iştirak edib. Leytenant rütbəsi alıb.***
***İsmayıl Tuncla silahdaş olub.***

***Döyüşlərdə göstərdiyi igidliyə görə "Azərbaycan Bayrağı" ordeni alıb.***
***İki dəfə yaralanıb.***
***Birinci qrup Qarabağ Müharibəsi əlilidir.***
***Ailəlidir. Beş övladı var– Günel, Nuriyyə, Firudun, Səbinə, Şəbnəm.***
***Hazırda Tərtər şəhərində yaşayır.***

1956-cı ilin aprel ayının Bərdə raylnunun Kətəlparaq kəndində anadan olub. Həmin kəndin orta məktəbini bitirib. Təhsilini Gəncə İnşaat Texnikumunda davam etdirərək ixtisas alıb.
1974-1976-cı illərdə Sovet Ordusu sıralarında xidmət edab.
1992-ci ilin yavarından ermənilərə qarşı aparılan mübarizəyə qoşulub. 1995-ci ilə kimi xidmətdə olub. Aəzrbaycanın Milli Qəhrəmanları Vəzir Orucov və Elman Hüseynovla birgə döyüşlərdə iştirak edib. Leytenant rütbəsi laıb. İsmayıl Tuncla silahdaş olub.
Döyüşlərdə göstərdiyi igidliyə görə «Azərbaycan bayrağı» ordeni alıb.
İki dəfə yaralanıb.
Birinci qrup Qarabağ Müharibəsi əlilidir.
Ailəlidir. Beş övladı var—Günel, Nuriyyə, Firudin, Səbinə, Şəbnəm.
Hazırda Tərtər şəhərində yaşayır.
Mən İsmayılla az vaxt bir yerdə olmuşam. Onu əvvəlcə bu rayona gələrkəq görmüşəm.
Mən 10 il Sovet Ordusunda gizir kimi xidmət eləmişəm. Sonra könüllü olaraq Qarabağ Müharibəsinə qatılmışam. Əvvəlcə Qurtuluş Batalyonunda olmuşam, sonra gəlmişəm «Tərtər» Batalyonuna 1992-ci ilin sentyabr ayının 1-nə kimi «Qurtuluş» batalyonunda olmuşam.
İlk komandirimiz Yevlaxdan Cabir idi. Allah rəhmət eləsin! Sonra Şahin Tağıyev onun yerində qaldı. (Şahin sonralar Milli Qəhrəman adı aldı).
«Tərtər» Batalyonu bir dəfə ləğv olundu, sonra bir də təkrar yarandı. Mən əvvəllər ərzaq xidməti rəisiydim.
İsmayılı bir döyüşçü kimi tanıyırdım. Kənardan gələnlər tez nəzərə çarpır. Onu qorxmaz bir türk əsgəri kimi tanıdım. Danışığından, yerişindən-duruşundan bilinirdi ki, hərbi işdən gəlib.
Döyüşlərdə birbaşa iştirak eləmirdim deyə onu yaxından dostluq edə bilmədim. Ancaq vətənpərvər oğlan idi. Çox gözəl təbliğatlar aparırdı, döyüşlərə gedirdi. Sonralar eşitdim ki, çıxıb gedib. Niyə getdiyini bilmədim.
İsmayılın döyüşləri məhz Vəzirin rəhbərliyi altında olub. O vaxt döyüşən oğlanların hamısında cəsarət var idi, qəhrəmanlıq hünəri var idi. Biz əksər vaxtı döyüşüb qələbə çalmışıq, ermənini qırmışıq, deyilən yeri almışıq.
1993-cü ilin mart ayının 22-də Vəzirlə döyüşə gedəsi idik. Paprəvəndin üstündə Ağdərə tərəfdə «Qlobus» deyilən yüksəkliyə hücum etməli idik. O vaxt iki batalyon vardı – «Babək-44» «(Qazax)». Onlar həmin yüksəkliyi verib düşmüşdülər. Yüksəkliyin ətrafı isə bizd idi. Orda dağın təpəsində böyük bir «Qlobus»a oxşar obyekt var idi, çox böyük idi. Vaxtilə orda hava məlumat bürosu yerləşirmiş. Bax, həmin «Qlobus»u almiaq uğrunda döyüşlər getməliydi. Vəzir bizim komandirimiz idi. Mən də bilavasitə rəhmətlik Elman müəllimlə birgə allah ona rəhmət eləsin , gedirdik döyüşə. Uşaqları düzdük, qorxanları çıxartdıq Vəzir 40-a yaxın . yaxşı uşaq götürdü. Mən də onlarla bərabər. İşıqlaşanda ermənin başının üstünü kəsirdik. Lakin təpəni ala bilmədik. Orda mövqe tutmuşdular, gecə saat 3-də uşaqları götürüb çıxdıq həmin yerə. Vəzir dedi ki, sən uşaqlarla «pozisiya»nı saxla, qalan uşaqlar aşağıda yemək yesinlər. Neçə gün qaldıq

orda.  Vəzir 1993-cü il mart ayının 22-də gəldi, uşaqlarla çıxdı yuxarı. Gözünün biri qıpqırmızı idi.
-- Bu gecə avtobusda gecələmişəm.
Gözləri şişmişdi.
Dedim:
-- İndi mən də gedib dincələ bilərəmmi?
Dedi:
-- «Qlobus»u
Alaq, sonra gedib dincələrsən. Qabaqda piyada qüvvələr var, getdik onların yanına. Gəldik vahidin yanına, gördük «Qlobus»a çıxan yolda bir erməni maşını gəlir.
Dedim:
-- Vəzir, gəl hücumu başlayaq.
Dedi:
-- Gərək əvvəlcə yolu kəsək ki, onlara kömək gəlməsin.
Həmin «KAMAZ» maşın xeyli canlı qüvvə gətirirdi. Maşının geri qaçmağı mümkün deyil. Vəzir «KAMAZ»-ı vurdu. Bir az keçdi, bir «QAZ-66» markalı maşın da gəldi. Onu da vurduq, yol kəsildi. İndi döyüşə gedə bilərik.
Götürdüyümüz uşaqları böldük, yarısı mənlə sağ tərəfdə hücuma keçdi, yarısı Vəzirlə sol tərəfdən. Hardasa iki saat idi ki, döyüşə girmişdik, qırğın gedirdi. Vəzir tərəfdə nəsə sakitçilik hiss elədim. O vaxt icra hakimiyyətinin başçısı işləyən Sərdar Həmidov rabitə ilə dedi ki, Nizami, Vəzir haqqında mənə tez bir məlumat ver, gör nə olub orda?
Himayətlə Rafiqi göndərdim ki, Vəzirgildən xəbər gətirsinlər.
Himayət Vəzirin meyidilə getmişdi aşağı. Rafiq gəldi ki, Vəzir yoxdur. Mən də məcbur oldum döyüşü yarımçıq qoydum qayıtdım geri.
Sonralar onun indi burda mağazada işləyir, ondan soruşdum ki, necə oldu, Vəzir şəhid oldu?
Dedi:
-- Ayaq üstə durub bir-neçə dəfə «qrantomyot»la ermənilərə tərəf atəş açdı və birdə ayağa qalxmaq istəyəndə alnından güllə dəydi. Ermənilər «Qlobus»da o qədər qəribə səngər qazmışdılar ki, adam məəttəl qalırdı. Təpədən yumru, qazılan səngər də yumrudu həm də çox dərindi. Bu səngərdə adam vurmaq mümkün deyildi. Səngərlə gedib-gəlmək, bir-birindən xəbər tutmaq olurdu.
-- uşaq Vəzirə o qədər inanırdı ki, deyirdilər. «Vəzir olan yerdə qələbə var, başqa söhbət yoxdur».
Vəzirin ölümündən sonra hamı avtomatı tulladı ki, Vəzir yoxdusa biz gedirik, qələbə olmayacaq. Uşaqda belə inam vardı.
Mən döyüüşçüləri sıraya düzüb dedim:
-- Götürün avtomatınızı, mən bir-iki kəlmə söz deyim, sonra yenə öz bildiyinizi edərsiniz.
Bunlar avtomatları götürdülər, düzüldülər sıraya. Dedim:
-- Biz Vəziri itirmişik, indi gəlin belə fikirləşək, Vəzirin qanını almalıyıq, yoxsa qayıdıb getməliyik?
Dedilər:
--Qanını almalıyıq.
Dedim:
-- Onda silahları götürmək lazımdır. Vəzirin ölməyindən qoxmamalıyıq, əksinə, qəzəblənməliyik və torpaqlarımızı düşmənlərdən geri almalıyıq!

İnsanların ki, biz on gün gecə-gündüz hücum elədik. Bu ayın 22-də olan hadisə idi. «Qoçu» yaralandı Çəsgər Əsədov yaralandı. Axırda ala bilmədik.
Briqadanın o vaxtkı qərargah rəisi vardı. Koroğlu adlı oğlan idi. Mən, Himayət, Adil (Davud oğlu) gecə «Pojarnı»nın yanından kəşfiyyata getdik və aprelin 1-indən 2-nə keçən gecə idi. Ağdərənin yolu tərəfdən «Qlobus»a girdik. İlqar Həsənov, Vitalı (şəhid olublar), onları da yanınızda idilər. «Malış» vardı, o da bizimlə idi. Çox uşaqlar vardı. Həmin günü iki dəstəylə döyüşə getdik. Bir dəstəyə komandirlik Himayət elədi, o birinə mən. Rəhmətlik Rafiq Məmmədovda mənim yanımda idi.
Bir oğlan vardı, Mübariz Süleymanov Böyükkişi oğlu, qoçaq oğlan idi. Həmin döyüşdə Pənah müəllim artileriya ilə bizə çox kömək elədi. Komarov da orda idi. Onun köməkçiləri vardı—Azər, Əmiraslan. Onlar çox bacarıqlı artilleriyaçı idilər. Bu dəyqə də nazirlikdə işləyirlər. Biri artileriyanın qərərgah rəisidir, biri də nazirlikdədir. Azərin familiyası Quliyevdir, Əmiraslanınkı İbrahimov.
Deməkı, həmin günü ki, biz «Qlobus»u aldıq, «Babək-44» və «Bərdə» batalyonları da bizə kömək elədilər. Biz oranı alanda xeyli erməni qırdıq. O vaxt Daxili İşlər Naziri İskəndər Həmidov göstəriş vermişdi ki, ermənilərin içində başqa millətlərdən də var. O meyidləri göndərin bakıya.
Biz iki maşın erməni meyidi yığıb göndərdik Bakıya.
O döyüşdən sonra mənə «Azərbaycan Bayrağı» ordeni yazdılar, Pənah müəllimə mayor rütbəsi verdilər.
Marquşevanda bir erməni komandiri öldürmüşdük. Kapitan idi. Cibindən xeyli miqdarda rus pulu həm də erməni pulu çixmışdı, gətirdik təhvil verdik.
Biz o təpəni alan günü Vitalini itirdik, başqa itkimiz olmadı. Vəzir Papavənddə şəhid oldu.
Mən Elman müəllim haqqında da bir neçə söz demək istəyirəm. Mənə kədərdi ki, Vəzri də, o da şəhid oldular. Mənimçün fəxrdi ki onların hər ikisini də döyüşdə əvəz etmişəm, qanlarını almışam. Bir vəziri itirmişdik, 100 nəfərə yaxın erməni qırmışdıq.
1993-cü ilin yanvar ayının 13-cü gecəsi idi, daha doğrusu 14-ü gününə keçən gecə idi, saast 12-i ötmüşdü. Elman müəllim hamısını düzdü sıraya. Dedi ki, sabah «Qanlı təpə»ni almalıyıq. Sonra mənə sarı dönüb dedi:
--Nizami, sən bir dəsiə ilə burada qalarsan lazım olsa sabah bizə köməyə gələrsən.
Tezdən onlar hücuma keçdilər, mən həmin qüvvə ilə qaldım ehtiyyatda. «qanlı tərə»ni alanda Elman müəllim şəhid oldu. Onun meyidini götürdük. Deməyəsən ermənilər o təpni bizim üçün tələ qurmuşdular. Gedib alırdıq, sorna ermənilər mühasirəyə salıb bizi qırırdı. Elman müəllimin ölmüələ bağlı uşaqlardan soruşdum ki, niyə belə oldu? Dedilər ki, Elman müəllim təpəni alandan sonra tez-tez ayağa qalxıb haranı vurmaq lazımdırsa o səmti vurmağı əmr eliyirdi. Elə ayaq üstə snayperlə alnından vurmuşdular. Orda ölməmişdi, sonra öldü.
Rəhmətlik Teyyub (Arifin oğlu) İlham, («Qarabala» deyirdilər), iki sərdar var idi, biri Qaradağlıdan, biri Sarovdan, hamısını tanıyırdım, 13 meyid idi, iki ay 7gün qarın altında qalmışdılar, hamısını mən çıxartdım, bəzisinin üzü torpağa düşmüşdü, amma bütöv hamısı dururdu, qarda donub qalmışdı.
Sərdarların iksinin də ayaqlarını məftillə bağlayıb, başlarını kəsmişdilər.
Vaqauzdakı yüksəkliyə «qanlı təpə» adı vermişdik, orda o qədər qırılmışdıq ki!... Ona görə.
Elman müəllim şəhid olan günü axşam Nəcməddin Sadıqovla Sərdar Həmidov gəldilər ora, düz «pozisiya»ya. Bizi yığıb dedilər ki, səhər təpə alınmalıdı, başqa yol yoxdur,

strateji əhəmiyyətlidir, əmr var. «Gəncə» Batalyonu da orada idi. Onlar da bir gün əvvəl bizimkilərlə döyüşə getmişdilər, amma köməkləri olmamışdı.
İlham mustafayevi,  Himayəti Asimi, Rafiq Məmmədovu çağırdım, bəzi uşaqlar var idi, hansı ki, bizimlə döyüşdə olmuşdular onları çağırdım, soruşdum ki, bu təpəni nə təhər almaq olar hardan girmək olar? Bir sözlə vəziyyəti öyrəndim. Sonra getdim Nəcməddin Sadıqovun yanına. Dedim ki, səhər mən o təpəni gedib alaram. Amma bir şərtlə ki, «Gəncə» Batalyonu mənə tabe olub, mənlə getsin, ümumi rəhbərliyi mən edim.
Bunlar razlaşdılar. Səhər saat 4-5-in yarısı hücuma keçdik. Çox uğurlu döyüşümüz oldu, «Qanlı təpə»ni aldıq. Mən həmin dəqiqə 10 nəfəri yola qoydum və postları möhkəmlətdik. Qabaq tərəf sıldırım yer idi, baş qaldıramq mümkün deyildi, erməni atırdı. Həmin gecə qaldıq orda. Uşaqların bütün qumbaralarını yığdım yanıma, hərdən-bir yola tərəf bir qumbara atırdım, fikirləşirdim ki, bir qumbaranın hesabına 1 saat bu yola erməni gəlməz və burda oturmaq olar.
Səhərə qədər təpəni bu qayda ilə saxlamışdıq. Ermənilər səhər o qədər böyük bir qüvvə ilə hücuma keçdi ki, inanırsınız, başımızın üstündə nə qədər acağ var idisə qırıldı, töküldü. Tanklar «BMP»-lər, «PK»-lar, qumbaraatanlar nə təhər döşəyirsə başımızı çıxara bilmirik. Mən orada bir qumbaraatandan atırdım. Bir az keçdi, o cür döyüşdən sonra bir ölüm sükutu çökdü. Sonra biz oradan qabağa getdik, vəngə tərəf. «Ferma» deyilən yer vardı, oranı götürdük. Ermənilərin xeyli silahını, maşınını ələ keçirdik. O vaxt televiziyadan da gəlmiqşdilər. Bir «ZHL» maşını, bir «BMP»-ni qənimət kimi götürdük.
Fevralın 26-da onlar Xocalını qırmışdılar. Burda bizimkilər onların qanlarını aldı 87 nəfər erməni quldurunu qırdı.
Avtomatlarını götürüb gətirdilər. İkinci dəfə yaralanmağım belə olub. Mən yenə döyüş komandiri idim. Həmin döyüşdə Mehracla Şakir Bağırovla bir yerdə idik. Pənah müəllim bizi axşam yanına çağırıb dedi ki 3 nömrəli sovxozun altında bir dərə var (xəritədə göstərdi), səhər həmin dərə ilə gedirsiniz filan yerdə bir toyuq ferması var, onu keçəndən sonra orda erməni «post»ları var, onları qırmalısınız. Bu, Ağdam alınan günü idi. Mən başa düşdüm ki, bizi göndəriblər ki, orada baş qataq, bu tərəfdən bizimkilər Ağdamı geri alsınlar. İslam müəllim və Soltanın (Ağcəbədili idi) «rota»ları, bir də Mingəçevirdən bir oğlan var idi, onun «rota»sı (Mahir idi onun adı). Gəldik Pənah müəllimin dediyi yerə çıxdıq Şakir Bağırov, Mehrac mənlə birlikdə idilər. Və birdən ayağına məftillər dəydi. Baxdım ki, qarşıda daş hasar var, adam hündürlükdə. Uşaqlara dedim ki, toyuq ferması deyəsən buradı. Fermanı söküb aparmışdılar, bünövrəsi qalmışdı. Mən, Mehrac və Şakir qabağa getdik. Gördük ki, qarşıda təpələr var, ora çatıb oturdaq. Məhiyyədin müəllim, İslam müəllim, «M-1»in komandiri vardı o, («Kürd» deyirdilər), məsləhətlə şirin. Demə, başımızın üstündə, 5 metrlikdə erməni «postu» var, yatıblar, bizdən xəbərləri yoxdur. Səhər açılana yaxın (5-10 metr məsafəni görmək olurdu) bir erməni bizi gördü. O bir erməniyə uşaq nə təhər döşədisə, orda neçə «post»varıydısa, ölən öldü, qaçan qaçdı. Malyar İsmayılın oğlu rəhmətlik Rafiq, Şahin Səfərov, mftun və mən girdik erməninin «ako»puna, gördük ki, burada iki «baçok» suyu qoyub qaçıblar. Uşaqlar suyu içmək istəyirlər, amma qorxurlar ki, suyu zəhərləyərlər.
Dedim:
-- Ay uşaqlar, ermənilər bilirdi ki, biz qəfildən gələcəyik suyu zəhərləyəydilər?
Orda Rafiq idi. Qoyun birinci mən içim. Mən idim, bir də məftun, dördüncü adam yox idi. Biz su içdik, oturduq.

İslam müəllim qulağından yaralanmışdı. Demə hamı qayıdıb gedib, qalmışıq biz üçümüz. Mən də deyirəm ki, oturaq gözləyək.  Nişan alıb ermənilərin «post»u tərəfə atıram, özü də yaxşı atıram.
Ermənilər su qabını vurdular. Rafiq dedi ki, burdan çıxmalıyıq, yoxsa bizi öldürəcəklər.
Nə isə… gecə gəldik Sərdar Həmidovun yanına iclasa. Burada dedilər ki səhər hücuma keçib getdiyiniz yeri almalısınız. Rəhmətlik İnqilab, qaraqoyunlu Qamət var, onlar da burada idilər. Biz səhər tezdən döyüşə getdik.
Pənah müəllim mənə dedi ki, bəlkə heç bu gün sən getməyəsən?
Mən də həmin gecə pis yuxular görmüşdüm. Dedim ki, yox, bu gün də gedim, sonra getmərəm.
Ermənilərin həmin «post»ları bir də tutmuşdular. Bu dəfə mənlə «İkinci Mingəçevir»in əvəzinə Malikin «rota»sını göndərdilər. Onlardan o tərəfə getmədi. Yenə təpəni aldıq, erməniləri qırdıq, o su qablarını götürdük, qabağa getdik, yenə ekrməniləri qırdıq. Akopkamariyə gedən yolu təmizlədik. Bizim tanklar gəldi. Orda dərin «akop»lar vardı, erməni qoyub qaçmışdılar. Girdik «akop»lara. Bizdən ölən də çox oldu, yaralananlar da. Tankın biri gəlib bizdən də qabağa keçdi. Həmin «akop»da 12 nəfər durmuşduq.
Bir də gördüm ki, Qaraqoyunludan Adil vardı. O ağlayır. Soruşdum ki, niyə ağlayırsan? Dedi ki, qonşum ölüb qalıb qabaqda, mən evə nə təhər gedəcəyəm. Qonşumuza nə cavab verəcəyəm.
Onunla həmin iki nəfərin meyidini çıxarıb gətirdik.
Bizim yanımızda keçən  tank erməniləri də ötüb keçdi. Biz ermənilərin səsini eşidirik. Bilmədim, onların qumbaraatanı yox idi, ya nə idisə vurmurdular. Birdən həmin Tank yatdı, sonra ikinci dəfə yenə işə düşdü, dördü yavaş-yavaş, zarıya-zarıya qayıdıb getdi.
Axşam düşmüşdü. Yaralıları da silah-sursatı da aparmışdılar. Qalmışdıq 8-10 nəfər. Qaranlıq düşəndə dedim ki, çıxaq biz də gedək. Təsəvvür edin ki, hər yer minalıdı. Cığır var, uşanqlar gedir, mən də bilirəm o cığırı. Dedim ki, heç kim cığırdan çıxmasın, çıxan adam öləcək. Deməli, 4 nəfər qabaqda gedir, 4-ü məndən arxada, 3-ü də yanımda. Bizim uşaqlar komandirlərini çox istiyirdilər. Uşaqlar tələsib dönmədən cığırı birbaşa keçdilər, düşdülər minaya. Parça-parça oldular. Hər yer minalı idi. Mən də ağır yaralandım. Gözümün biri töküldü, birini qan tutdu, heç nə görmədim. İndi iki nəfər mən tank gələn yolla aparın, kənara çıxmayın. (Tank gələn yolu minadan təmizlətmişik). Rafiq isə ayrı səmtlə apardı və qəfildən dayandı. Dedi:
-- Nizami, ayağını minanın üstünə qoymusan. Dedim ki, tərpənmə, əlini ayağının yerinə qoy, ayağını qaytar geri.
Nə isə… Bir də qayıtmışıq geri, tank yolu ilə gəlmişik. Məni «Təcili yardım» aparıb…
Yaralanandan sonra təzədən xidmət eləmişəm, 1995-ci ilə kimi.
Pənah müəllim xəstələnmişdi. Mənə onu əvəz eləmək qismət oldu. Onda gördüm ki, döyüşmək asandı, nəinki idarə eləmək.
Bir söz var, deyirlər: «Sərkərdə xalqın həyatıdır».
Hər bir əsgər qəhrəman ola bilər, komandir yox. Komandirlik ayrı şeydir.
Döyüş epizodlarından daha çox ona görə danışdım ki, İsmayıl Tunc da belə ağır döyüşlərdə iştirak edib və mənim yaşadığım hisslər ona yaxşı tanışdır.



**VAQİF BORAN OĞLU ABDULLAYEV**

***ulun 25-də Tərtər rayonunun Söylən kəndində anadan olub.***

***Evoğlu kənd orta məktəbini bitirib. 1971-ci ildə isə H.Zərdabi adına abad) Dövlət Pedaqoji İnstitutunun biologiya fakültəsini bitirib.***

***Sovet Ordusu sıralarına çağırılıb, Dinepropetrovskda xidmət edib, 1973-cü ildə leytenant rütbəsi ilə tərxis olunub.***

***Məlum hadisələrlə bağlı 1989-1990-cı illərdə "Tərtər" Özünəmüdafiə batalyonunun təşkilində könüllü olaraq iştirak edib.***

***1991-ci ildə şəxsi heyətlə iş üzrə komandirin müavini vəzifəsini daşıyıb.***

***1996-cı il mart ayının 19-da tərxis olunub.***

***Bir dəfə yaralanıb və "kantuziya" alıb.***

***İsmayıl Tuncla döyüşlərdə iştirak edib.***

***Qarabağ Müharibəsi veteranıdır.***

***Ailəlidir, dörd övladı var– Vüqar, Zaur, Xaliq, Kəmalə.***

***Hazırda Tərtər rayonunun Söylən kənd İƏV- də yaşayır.***

Səhv etmirəmsə, 1992-ci il iyul ayında İsmayıl və Cem adlı iki nəfər Türkiyə vətəndaşı bizim "Tərtər" batalyonuna gəldilər.

Batalyonun komandiri Sərdar Həmidov məni telefona çağırıb dedi ki, iki türk oğlu gəlib, onları gəl apar. Yaxşı həyat yolu keçiblər.

İsmayılla Sərdar Həmidovun yanında tanış olduq. Öyrəndim ki, onlar Türkiyənin İqdır vilayətindən gəlib, döyüşlərdə iştirak etmək istəyirlər.

Cem kapitanıydımı, mayoruydumu bilmirəm. Hər ikisi mülki geyimdəydilər. İsmayıl elə ilk nəzərdən vətəndaş kimi, bir türk oğlu kimi mənə yaxşı təsir bağışladı. Onun ürəyi necə döyündüyünü, sanki hiss edirdim. Fikirləşdim ki, belə oğullar bizə, doğrudan da, çox lazımdır. Türk xalqı çox müharibələr görüb. Ona görə bu xalqın övladları qoçaq və qorxmazdılar.

İsmayılın batalyonumuza gəlişi məni çox sevindirdi. Axşam saat 9-10 arası olardı. O vaxt İsmayılla və Cemlə qayıtdım Marquşevan deyilən kəndə. Bizim batalyon məktəbdə yerləşirdi. Elə həmin gecə də döyüşə getdik.

İsmayıl Həsənqaya istiqamətində başladığımız vuruşmada özünü yaxşı göstərdi. Bu, hardasa üçüncü cəhd idi. Son cəhddə Marağa, Marquşevan alınmışdı. İyunun 5-6 –sı Həsənqayanı və Malakanlar deyilən kəndləri azad etdik. İsmayıl Tunc burada şücaət göstərdi.

Ayın 11-də biz artıq Çardaqlı qəbiristanlığında döyüş aparırdıq.

“Tərtər” batalyonunun özündə çox cəngavər oğlanlar var idi. Vəzir Orucov birinci dəfə batalyona gələndə 7 nəfərlə gəlmişdi. “Vzvod” komandiri təyin edildi. O vaxt batalyonumuzun komandiri rayonumuzun hərbi komissarı Boris Zöhrabov idi. O, rəhmətlik Elman Hüseynov (milli qəhrəmanımız), qərərgah rəisi Pənah Məmmədov və mən qərara gəldik ki, Vəzir Orucovu bizim batalyona götürək. Götürdük.

Vəzir Orucov çox çevik hərəkətlərlə, yaxşı düşünülmüş əməliyyatlarla özünü tez bir zamanda tanıtdı. O, çox ürəkli oğlan idi. Rusiyada yaşamışdır. Azərbaycanın başı üzərini qara buludlar alanda oradan birbaşa döyüşə gəlmişdi. Gələn günü də bizim batalyonun üzvü oldu.

Həsənqaya ilə Marquşevan kəndlərinin arasında Qarabağ kanalı adlanan bir kanal keçir. O kanalboyu gecə saat 12-də ilk kəşfiyyata getdik. Səhərə yaxın saat 4-5-də gəldik. İyul ayının 4-ü idi. Kəşfiyyata 4 nəfər getmişdik. Məlum oldu ki, ermənilər 100 əsgəri bizim arxamıza keçirmək istəyirlər.

“Uqolnik” deyilən yüksəklikdən ermənilər texnikadan istifadə edirdilər. Verdikləri kəndi geri almaq planları var idi. Bu, baş tutmadı. Vəzirin və kəşfiyyatçı yoldaşlarının səyi nəticəsində onların planları alt-üst oldu. Hava işıqlanırdı. Briqadanın kəşfiyyat rəisi polkovnik Qasımov, o da, gecə bizimlə Həsənqaya ilə Marquşevan arasındakı düzənlikdə yatmışdı. Bütün mövqelərimiz orada idi. Səhər duranda, gördük ki, ağçalmalılar (ermənilər) artıq kanalı keçiblər. O vaxtlar əlbəyaxa çox döyüşlər olurdu. Ona görə də seçilmək, tanınmaq üçün, bir gün qabaq onlar da, biz də “paqon”larımıza xüsusi rəngdə nişanələr bağlayırdıq. Orda başqa batalyonlardan da uşaqlar vardı.

Kəsfiyyat rəisi Qasımov dedi ki, “ağçalmalılar” bizim arxamıza keçmək istəyirlər. Əmr verildi, üç tərəfdən hücuma keçdik. Gəncə batalyonu soldan, biz də sağdan onları mühasirəyə alıb qırdıq, bizim isə heç bir itkimiz olmadı, yaralananlarımız oldu. Həmin əməliyyatda 67 nəfər erməni qulduru məhv oldu, meyitləri sonra buldozerlə “dəfn etdik”.

İsmayıl Tunc bu döyüşdə, sözün həqiqi mənasında, igidlik göstərdi.

Həmin gecə tapşırıq aldıq ki, Maralyanı, Malakanları almalıyıq. Çünki ermənilərin əsas texnikası orda cəmləşirdi ( əvvəllər bu kəndin adı Göytəpə idi), yola düşdük. İsmayıl da bizimlə idi. Bu əməliyyatda "Tərtər" və "Mingəçevir" batalyonları iştirak edirdilər. Səhərə yaxın Maralyanı aldıq. Ədalət Paşayevin bölümü növbədə dayandı. "Qapanlı vzvodu" deyirdik, o da Ədalətin rəhbərliyi altında idi. Həmin gecə bir nəfər ermənini girov götürdük. Gecə saat 4-də onu mənə təhvil verdilər. "Mingəçevir" batalyonunda bir Vahid var idi, onunla ermənin əlini-ayağını bağlayaraq, gətirib qərargah rəisi Nəcməddin Sadıqova təhvil verdik. Qərərgah onda Tərtər şəhərində yerləşirdi. Orada öyrəndim ki, bu, Karo Karoyan, ermənilərin Ağdərə üzrə kəşfiyyatının rəisi, general-mayordu. Sonra məlum oldu ki, kanalın üstündə 67 əsgərin qırılma xəbərini ona çatdıranda inanmayaraq dedi:

– Siz yalan danışırsınız, orada türk yoxdur, oranı qoyub qaçmısınız. Bunu mən sizə sübut edərəm!

Elə həmin gecə özünün iki nəfər cangüdənini götürüb bu əraziye gəldi. Özü xeyli irəlidə gedirmiş. Qabağına bizimkilər çixanda ermənicə çığırıb ki, mən tutuldum, siz qaçın!

Həmin gündən bizim uğurlu döyüşlərimiz başladı. Lüləsaz, "Alma bağı", Çardaqlı istiqamətində güclü döyüşlər oldu.

Ağdərə- Sərsəng yolunda ermənilərin bir tankı və iki "BMP" –si vardı. Həmin "BMP"-lər bizim mövqeləri güclü atəşə tuturdu. Çardaqlı kəndi ətrafında gedən bu döyüşdə bizim 11 nəfərimiz o cümlədən İsmayıl da, Məlahət xanım da yaralandılar. Məlahət həm yaralılara yardım edir, həm də əlində avtomat döyüşürdü.

Ermənilərin bir "NİVA"- sı, bir "MAZ" maşını içi dolu silah-sursat qaçmağa hazır vəziyyətdə dayanmışdı.

Rəhmətlik Vəzir və onun kəşfiyyat dəstəsi ermənilərin arxasına keçmişdi. İsmayıl da Vəzirgillə getmişdi. Mən isə digər dəstələrlə  başqa tərəfdən irəliləyirdim. Cem, rəhmətlik Elman müəllim, Zakir Kərimov- biz dördümüz aşağıdan gedirdik.

Vəzir Orucov kəşfiyyatda da çox gözüaçıq, peşəkar döyüşçü idi. Yuxarıdan bizə xəbərdarlıq etdi:

–Üzərinizə "karobka" gəlir, hara gedirsiniz? ("karobka" şərti ad idi, yəni "BMP" gəlir).

Təpəyə çıxıb baxdıq ki, “BMP” düz bizim üstümüzə şığıyır. Cemdə bir qumbaraatan vardı. Bu, bir dəfə atmaq üçün idi. Dedim:

– Cem, ata bilirsən?

– Yox.

Bizimlə Qarağacı Qapanlısından bir oğlan vardı, sürücümüz idi. Özümüzə mövqe seçdik. Beləliklə, Vəzir bizi ölümdən qurtardı.

Bizim artilleriyanın komandiri vardı, Komarov. Elman müəllim də artilleriyada xidmət etmişdi, mən də. Bir tank mövqeləri vururdu. Elman müəllim Komarova koordinatı verdi:

– Burada bir tank var, bizə imkan vermir. Onu vurun.

Birinci mərmi əlli metr fərq elədi, ikinci mərmi isə tankın düz üstünə düşdü. Elman müəllim çox dəqiq koordinat vermişdi, artilleriya komandiri Komarov da çox dəqiq vurmuşdu.

Bundan sonra keçdik.

Umudlunun özünün batalyonu var idi. Bizim şərti adımız “Vosxod- 52”, onlarınkı isə “Vosxod- 23” idi. “Platina” da onlarla birləşdik.

Kəlbəcər yolu açılana qədər İsmayıl bizimlə birlikdə döyüşdü. O, həmişə uşaqların içində vətənə məhəbbət, xalqa məhəbbət mövzusunda söhbətlər aparırdı. Bu söhbətlər elə bil uşaqlara qol-qanad verirdi. Döyüşçülərin çoxu ailəsini-uşağını atıb gəlmişdi. Vətən üçün şəhid olurdu. İsmayıl Atatürkün bir sözünü tez-tez misal gətirirdi: “Hücum zamanı yaralının arxasınca qaçmaq lazım deyil, qoy keç irəliyə”. Avqustun 23-də Drambon istiqamətində hərəkətə başlandı. Bizdə texnika yox idi. “Goranboy” batalyonunun isə altı tankı, iki “BMP” –si vardı. Drambon döyüşündə yeganə sağ qalan, yaralanmayan zabit mən idim. Avqustun 21-də Ədalət yaralanmışdı. İkinci dəfə avqustun 31-də yaralandı və yaralı-yaralı da yenə döyüşə girdi. Ondan bir gün qabaq Elman müəllim yaralanmışdı, budunun arxa tərəfini “qranatomyot” aparmışdı. Vəzir axşam kəşfiyyatda olmuşdu, batalyona tapşırıq almağa getmişdi. O, geri qayıdıb gələndə artıq mən də yaralanmışdım. Yaralandığım yerdən çıxmaq isə mümkün deyildi, çox qan itirmişdim.

Vəzirə məlumat verirlər ki, “minamyot” la bizim yolu “döyürlər”.

Bir neçə xidməti maşınımız var idi, biri də mənimki idi, (“UAZ”), o da yandı. Daha maşın qalmamışdı. Yeganə çıxış yolu o oldu ki, Vəzir 7 nəfərlə sıldırım qayalıqla çıxıb, onların üzərinə “minamyot”la, avtomatla atəş açsın. Həmin “minamyot”u susdurandan sonra mənlə bərabər bir neçə yaralını ordan çıxarmaq mümkün oldu.

Aşağıda “Bərdə” batalyonu yerləşmişdi.Əgər burdan keçə bilsəydik, onlar bizim yerimizə gəlməliydilər.

Elçin Əliyev bizə kömək edəndə, çox agir “kontuziya”aldi.

Orda ermənilərin bir tankı binanın arxasında gizlənmişdi, luləsini qabaq pəncərədən çıxarıb atırdı ki, nə tustu, nə də alov görünməsin. Burada üç gün döyüşdük. Avqustun 23-də mən yaralandım.

Drambon döyuşündə də ermənilər ağır itkilər verdilər.

Onların bir xidməti “UAZ”maşını gəlib tapşırıq alıb qayıdanda,Vəzir yanında dayanan Akifdən (fəal döyuşçü idi, “Qaqaş”deyirdik) soruşdu:

–“Qaqaş”, o “UAZ”-ı sürə bilərsən?

“Qaqaş” zarafatla cavab verdi:

–Xalx öz “UAZ”-ını sürür də.–Sonra dedi,–Amma alıb versən, sürə bilərəm.

Bir də gördük Vəzir yoxa çıxdı. Deməyəsən, gedib düz asfaltın ortasında oturub, “UAZ” gecə geri qayıdanda gülləborana tutub. “UAZ”-ın içində olan dörd nəfərin (üçü zabit, biri sürücü) dördünü də cəhənnəmə vasil edib, meyitlərini maşından düşürüb, oturub sükanın arxasına. Bir də gördük ki, budur, Vəzir “UAZ”-ı gətirir. Yanımıza çatıb maşını saxladı və aşağı düşüb, dedi:

–“ Qaqaş”, ala sür.

Ədalət ayın 1-də Bakıda rəhmətə getdi. Vəzir 29-da yaralandı, sonra sağaldı. Papravənd döyüşündə şəhid oldu. Sonra mən yaralandım, beş gün hospitalda yatdım. Bakıya dəvət etdilər, getmədim. İki qəlpə var idi, birini çıxartdılar, birini isə kürəyimin altında olduğu üçün çıxartmaq mümkün olmadı. Hələ də durur. Sağalandan sonra qayıtdım, istirahətə getmədim. Məni briqadaya siyasi iş üzrə rəhbər götürdülər.

Müharibədən keçən bu müddət ərzində İsmayıl Tuncu həmişə xoş təəssüratla xatırlayıram. Onun kimi oğulların igidliyilə də fəxr edirəm.



**İLHAM ABBAS OĞLU MUSTAFAYEV**

***1970-ci il sentyabrın 6-da Tərtər rayonunun Cəmilli kəndində anadan olub. Həmin kəndin orta məktəbini bitirib Moskva Yol İnstitutunda oxuyub.***

***1988-ci ildə Sovet Ordusu sıralarına çağırılıb. Kalijski Vilaayətində xidmət edib. 1990-cı ildə tərxis olunub.***

***1991-ci ilin sonuna yaxın könüllü olaraq "Tərtər" Özünümüdafiə Batalyonuna yazılıb. 1995-ci ilədək hərbi xidmətdə olub.***

***İsmayıl Tuncla bir yerdə döyüşlərdə vuruşub.***

***Üç dəfə yaralanıb.***

***I qrup Qarabağ Müharibəsi əlilidir.***

***Ailəlidir, iki övladı var- Ayişə və Nərmin.***

***Hazırda Tərtər rayonunun Cəmilli kəndində yaşayır.***

İlk dəfə könüllü özünümüdafiə batalyonuna yazıldım, sonra özümüzün 703-cü briqadanın tərkibində "Tərtər" batalyonu yarandı. 1991-ci ildə onun tərkibinə daxil oldum.

İlk döyüş əməliyyatlarımız Marquşevan və Marağadan başladı. "Torpaq təpə"nin altında idik. Elman müəllimgil gəlib bizdən 11 nəfər seçib gətirdilər bura– "Tərtər"ə. Onda "Qurtuluş" batalyonu da ( komandiri Şahin Tağıyev idi) döyüşürdü. İtki vermişdi, onların çıxarılmasında iştirak etdik. Kamil də onda qolundan yaralanmışdı. Marquşevan, Marağa istiqamətindəki ilk döyüşlərdə ermənilərə qalib gələ bilmədik, çünki onların qüvvələri bizdən çox idi. Polislər də kömək edirdilər, amma elə güclü deyildik. Sonradan ordu gücləndi. Kəşfiyyat bölükləri yarandı və onları kəşfiyyatlara göndərdilər. Bir qrupunu Şakirlə, bir qrupunu Vəzirlə göndərirdilər. Biz kəşfiyyat edib məlumatları öyrənirdik, qərərgah rəisi Pənah Məmmədova, komandirin müavini Elman Hüseynova xəbər verirdik, bundan sonra döyüş əməliyyatları başlanırdı.

O vaxt artilleriyada Komarov, Vasyak, Vitali, Maqamed vardı. Onlara koordinatlar verilir, onlar da lazımi işlərini görürdülər. Bundan sonra biz hücuma keçir və əraziləri kənd-kənd quldurlardan azad edirdik.

Levonarx istiqamətində gedən döyüş əməliyyatında bizim öz qüvvələrimizdən əlavə Şakir Həsənov da qüvvə gətirmişdi, xüsusi dəstə idi, yaxşı döyüşürdülər. Həmin vaxt düşməni mühasirəyə aldıq və 83 nəfər canlı qüvvəsini məhv etdik.

Bu ərəfədə vuruşmaq üçün iki nəfər də türk gəlmişdi– biri Cem adlı mayor, digəri isə İsmayıl idi, o, leytenant idi. Onlar ən ağır və uğurlu döyüş əməliyyatlarında iştirak edirdilər. Məsələn, Levonarx istiqamətində ermənilərin bir nəşə plantasiyası vardı, oranı çox möhkəm müdafiə edirdilər, hətta qızlar da plantasiyanı qoruyurdular.

İsmayılın şəxsən özü bu vuruşmada xüsusi fədakarlıq göstərdi. Orada İsmayıl bir ermənininin qulağını da kəsdi.

Biz tez-tez  kəşfiyyata gedirdik. Vəzir, İsmayıl, Mayıl, Əyyub, Suliddin, “Qoçu”, Sərvər, Vüqar, Mahir, Əliyar... – kəşfiyyatda olan uşaqlar əsas bunlar idi.

Kəşfiyyatın üstünlüyü orasında idi ki, az qüvvə ilə ermənilərin arxasına keşir, güclərini biləndən sonra özümüz onları məhv edirdik, Çardaqlıda da, “Turbaza” da da belə oldu. Düşmən “KAMAZ”-nı , “BMP”-sini, canlı qüvvəsini məhv eliyəndən sonra. Elman müəllim, Rasim, “Mısto”gil və “Goranboy” batalyonunun texnikaları gəlib çıxdılar.

Drambon, Poqosomer, Çıldıran istiqamətlərində gedəndə, “Babək-44”, “Goranboy”, “Xanlar” batalyonunun qüvvələri bizə kömək edirdilər.

“Ayı heykəli”nin yanında Vəzir Orucov, Elman Hüseynov, Ədalət Paşayev durbinlə baxıb, erməni qüvvələrinin yerlərini öyrəndilər. Bu vaxt onlar artilleriyadan atəş açdılar. Ədalət Paşayev yaralandı. Onu Hafizgillə arxaya yola saldıq. Bundan sonra, əgər əvvəl 15-20 nəfərlə gedirdiksə, indi bir rota idik, Elman müəllim də ordaydı, Vəzir, İsmayıl da. “Ayı heykəli”nin yanından meşəyə girdik, oraynan gedib keçdik ermənininin arxasına. Gördük ki, ermənilər “KAMAZ” -dan “BMP”-yə mərmi yığmaq istəyirlər. Buna görə də pulemyotla “KAMAZ”-ı atəşə tutduq. Maşın yanmağa başlayanda, güllələr açılmağa başladı. “BMP”-dəkilər görəndə ki, vəziyyət ağırdı, qaçmaq istədilər.  Elə bu vaxt Elman müəllimin yanından Rafiq adlı bir oğlan, udin idi, “Goranboy” batalyonundan, qumbaraatanla atdı. Mərmi “BMP”-nin  üstündən keçdi, dəymədi. Qumbaraatanın arxa tərəfindən çıxan alov Elman müəllimin ayaqlarını zədələdi. Sərvər, “Qoçu”, Mahir, Vüqar, Vəzir, Türk İsmayıl da bu əməliyyatda iştirak edirdilər.

Biz yalnız həmin vaxt “Goranboy” batalyonuna müraciət etdik ki, texnikayla köməyə gəlsinlər. Lakin onlar gələnə kimi, biz ermənilərin canlı qüvvəsini məhv etdik.

Bu vaxt bir “Villis” gəldi. İki nəfər içindən düşüb qaçmaq istəyəndə, Vəzir birinin, komandirin, gözündən vurdu, sürücünü də mən vurdum.

Burada Mahir ( Xoruzlu kəndindən) qılçından yaralandı, onu da arxaya yola saldıq.

“Qoçu”, Sərvər və mən gedirdik ki, Oruc dayı ilə Türk İsmayıl da gəldilər. Pulemyot atanda qəsdən dedim ki, mən yaralandım. Sərvər ermənilərə tərəf qumbara atdı. Bundan sonra gəldik erməni meyitlərinin yanına. Öldürdüklərimizin arasında “Qozbel Mişa”, Zaven adında döyüşçülər də vardı. Onların pulemyotunu mən götürdüm, o biri silahları da “Qoçu”, Sərvər, pasportlarını isə Oruc dayı götürdü. (Oruc dayı erməni pasportlarını batalyonda təhvil verib, mükafat alırdı).

Əvəz Şükürovun oğlu və “Qozbel Mişa” Zavenonu öldürmüşdülər, biz də onları həmin yerdə öldürdük.

Ermənilər “ratsiya”yla “Goranboy” batalyonuyla (“Misto”yla ) əlaqə saxlamışdılar, onlar da demişdilər ki, sizin “ermənilərinizdən” biri bu hücum planını çəkib verib bizə. Amma əslində belə deyildi, əksinə, Ədalət Paşayevi yaraladıqlarına görə biz ermənilərin arxalarına keçib, onları darmadağın eləmişdik.

Goranboydan Maşallah və “Misto”gilin adamları ermənidən aldığımız “Villis”i aparmaq istədilər. Vəzir:

– Qoyma aparsınlar, –mənə dedi.

Mən də qoymadım, rabitə aparatını da vermədim. Onlar ordan bir pistolet götürdülər. O gözündən vurulan komandirin pistoleti idi.

Qalan heç nəyə qoymadıq ki, əl vursunlar.

Bizə məlumat verdilər ki, Drambon, Poqosomer və Çıldırandan ermənilər qaçır. Bu istiqamətdə beş batalyon cəmləşmişdi. Rabitəylə Kamarova və Vasyaka bu barədə xəbər verildi. Bundan sonra artilleriya ermənilərin mövqelərinə “döşədi”. Biz həmin mövqeləri alıb, güclü mühafizə yaratdıq.

Ermənilər biz dayandığımız mövqeyə hər gün hücum edirdilər. Biz də onları geri oturtduq. Bizə briqadadan hərbi sursatı “Ayı heykəli”nin yanına qədər gətirirdilər, biz də gecə ermənilərin “kalyaska”ları ilə gedib daşıyırdıq. Bir gecə Vəzir iki nəfərlə gedib gətirirdi, bir dəfə mən “qranatomyot”un mərmilərini, pulemyotun patronlarını daşıyırdıq. “Ayı heykəli”ylə bizim aramız 10 kilometrə yaxın yol idi.

Sonradan bizim yerimizə “Tərtər-2” batalyonundan Vidadigili göndərmişdilər. Onlar da dörd nəfər şəhid verib mövqedən çıxmışdı. Həmin şəhidlərin meyitlərini də biz çıxartdıq.

Bundan sonra ermənilər həmin istiqamətdə xeyli qüvvə tökmüşdülər, hətta “neqr”lər də, ruslar da vardı –“nayomnik”lər idilər. Bir tərəfdan də xüsusi qrupları “OMON”ları göndərmişdilər. Xüsusi qrupa Əziz müəllimin oğlu Vüsalgil (indi briqada komandiri, Göy-göl tərəfdə polkovnikdir, “Qırmızı Bayraq” ordenli) bizə yaxşı kömək elədilər. Onlar Levonarxda  da əla döyüşmüşdülər. Rövşən Cavadovun dəstəsi də oradaydı. Bizim uşaqlardan Bayramla Hafizi də “OMON”çularla kəşfiyyata göndərdik. Kəşfiyyatın rəisi yaralandı.

Mən ona görə Türk İsmayılın adını tez-tez çəkmirəm ki, o, apardığımız əməliyyatların çoxunda bizimlə birlikdə döyüşürdü və ağır məqamlarda uşaqların köməyinə çatırdı. İsmayıl çox təcrübəli bir zabit idi və onun qoçaqlığı, qorxmazlığı uşaqlara bir nümunə kimi göstərilirdi.

Erməni artilleriyası atanda, “OMON”çuların çoxu qaçırdı. Pulemyotu götürdüm, bunların başlarının üstündən atəş açdım. Atanda, Hacıqərvənddən Cavad gəlib dedi:

– Ə səni vuracaqlar

Cavabında:

– Niyə? Şəhidlərini, yaralılarını qoyub qaçmasınlar, mən də atmayım, – dedim.

Onlar “qranatomyot”u, pulemyotu götürüb mənimlə bərabər hücuma kecdilər. “OMON”çuların “ratsiya”sıyla xəbər verdik ermənilərin bir tankını “Faqot”la (raket (silah), 500 metrlikdən texnikanın istiliyinə tərəf uçur) vurub yandırdıq.

Sonra Vaqavuz alınan vaxtı, Elçin Əmiraslanov da bizimlə idi (Sonra həbs olundu). O döyüşdə Səməddinin qıçı getdi. 13 meyitimiz Vaqavuzda qalmışdı. Lap əvvəl Oruc dayıyla Teyyubun meyitlərini çıxartdıq.

Mənim “rota”mda 30 nəfər türmədən buraxılanlar vardi. Əvvəl Surətin dəstəsində olmuşdular. Əli bəy, Qubalı idi, şəhid oldu, Ədli yaralındı. Əlyar, Oruc dayının, Kamilin kəndçilərindən vardi, bizimlə onlar da getmişdilər meyitləri çıxartmağa. Meyitlərdən birinin başını kəsmişdilər.  Onu çıxaranda, əmisi gəlib məni öpdü. Ora heç kim “risk” eləmirdi getsin, beş nəfər getdik –Məlahət də bizimlə idi, meyiti tapıb gətirdik. Şərif dayı orada yaralı qalmışdı.

Biz həmin 13 meyiti çıxarmağa gedəndə, anam məni buraxmırdı. “Patrul”lar vardı – Əli Əliyev – Əli müəllimin qardaşı Hacıqərvənddən (bizdə “rayispolkom”un sədri işləyirdi), bir də Bakıdan bir kişi varıydı, onlar patrul gedirdi, mən də getdim Vaqavuzda qalan 13 meyiti çıxarmağa.

Bu ərafələrdə Vəzir yoxuydu, yaralanıb getmişdi. Vaqavuz alınanda o da gəlib çıxdı.

Sonra komandirlər arasinda çəkişmə başlandı. Prezident Əbülfəz Elçibəy demişdi ki, “Xankəndinə hansı birinci girib bayraq sancsa, o hissənin komandiri və generalı olacaq, çoxlu pul mükafatı alacaq”. Ona görə də Surət Hüseynovla Nəcməddin Sadıqovun arası dəydi. Surət öz aviasiyasini qaldırdı və “Platina”da oturan Nəcməddin Sadıqovun tutduğu mövqeləri bombaladı. Surətgil hərbi texnikanı qəsdən Haterkdə ermənilərə qoyub çıxdılar. Surətin Yurası variydi, nə bilim Aslanovu, Həmzəyevi variydı. Aslanov Yura polkovnik idi. O, “ratsia”yla üstümüzə qışqırdı:

–Vaqavuzu verin, düşün.

Onda Turk İsmayıl da, Suliddin, Kamran, Mətləb də yanımda idilər. Vəzirlə Rafiq vəziyyəti görüb aşağı enmişdilər.

– Hələ burda döyüşürük, salamat çıxsam gəlib səninlə özüm haqq-hesab çəkəcəyəm. Polkovnik Həmzəyev – Nəcməddin Sadıqovun müavini (o, erməniyə də, Surətə də, ümumiyyətlə, hər tərəfə işləyirdi) – məni 18 nəfərlə “Babək-44” tərəfdən göndərdi ki, gedim mövqeyə. “Pozıvnoy”un adını da “İlham” qoydu ki, ermənilər mənim adımdan qorxur. Getdik ki, “Babək- 44” “pozisiya”nı qoyub çıxıb. Ermənilər “ratsiya”yla:

– Gəlin qəbiristanlığın yanına, orda atışaq, –dedilər.

Mən də cavabında:

–Yaxşı, gəlirik, –dedim.

Dayımoğlugil buraxmadı. Gələndə “Babək-44”ün uşaqları meyxana deyib, könlümü almaq istədilər. Dedim:

– Alçaqlar, elə meyxana demisiz ki, ermənilər də oranı alıb at oynadırlar.

Sonra briqadadan xəbər verdilər: “Sizə polis qüvvələri köməyə gəlib” – Tərtərin, Bərdənin, Yevlaxın polisləri (Rasim Vəliyev, İsa Bağırov). Onları da Səfərov qoymur ki, yollar minalıdır.

Səfərov mayor idi, mina təmizləyirdi.

Mən bir neçə nəfər götürüb Tərtərə gəldim. Sərdar Həmidovdan soruşdum ki, bu nə məsələdir?

Nə isə... Burda söyüş söydüm. Rotanın komandirliyindən imtina etdim. Qayıtdıq geri. Səhərə qədər həmin mövqedə qaldıq. Sabahısı polis qüvvələri gələndə, ermənilər qaçdı. Bu hadisələr Vaqavuzun ətrafında baş vermişdi.

Biz tezdən getdik Madagizin üstünə, "post"u təhvil götürdük. Sarovdan rəhmətlik Tahir, Sarıcalıdan "Malış" (şəhid oldu), xeyli uşağıydıq. Gecə heç nə baş vermədi. Səhərisi endim ki, yanımıza bir texnika – "Ural", ya "BRDM" çıxaraq. Bizim "rota"nın "ZİL-131"-i vardı, onu Vüqar sürürdü, o da anası xəstə olduğu üçün icazə almışdı. Ermənilərdən qalma bir sarı "Ural"ı və "BRDM"-dən birini götürdük. Birini də Qamətgil, İnqilabgil götürüb çıxıb getdilər (Sonra o texnikanı Qamət kanala salmışdı). Bizim texnikanı Sarıcalıdan Mehman, şəhərdən Doş sürürdü. Yol gedirdik ki, ermənilər bir raket atdılar, o da gəldi maşının qarşı tərəfindən dəydi, yandırdı, mənim də qolumu xış-xış elədi. Arxada oğlan vardı, onun qolunu pis günə qoydu. Mehmanla "Doşu"ya heç nə olmadı. Onlar düşüb getdilər. Gəlib batalyonda demişdilər ki, İlham öldü. Bunu da Pənah, dayım oğlu Adil eşidir, yığılıb gəlirlər mənim yanıma. Düyərli "Malış" onlara istiqaməti göstərir. Mənim üstümü ağac qırıqları ilə örtdüklərinə görə yanımdan ötüb gedirlər, ağır yaralı bir oğlan tapırlar, geri qayıdıb məni də tapırlar və ikimizi də götürüb gətirirlər. İnqilabın "rota"sı da qayıdıb gəlmişdi.

Burada sol qolumu kökündən kəsirlər. Üç gündən sonra özümə gəlmişəm. Ayağım, üzüm, gözüm, hamısı yaralanmışdı. Sağ ayağımın-baş barmağını kəsdilər. Üzümdən qəlpəni Almaniyada çıxartdılar. Qəlpənin birini hələ də gəzdirirəm. Qəlpələr bütün bədənimə dolmuşdu.

Himayət də qolundan yaralanmışdı. Bakıda bir palatada yatırdıq.

Mən sonra yenə döyüşlərə qatıldım. Lakin o vaxtlar Türk İsmayıl bəzi səbəblərə görə ordudan getmişdi. Lakin həm bizimlə, yəni yuxarıda danışdığım əməliyyatların çoxunda, həm də digər döyüşlərdə İsmayıl ad-san çıxarmışdı, silah dostları həmişə onunla fəxr edirdi. Biri qorxanda va yaxud irəli getmək istəməyəndə, Türk İsmayılı onlara misal çəkir, onun necə pələng kimi vuruşmasından danışırdılar.

İsmayılla müharibədə də, sakit vaxtı da bir yerdə olmaq, söhbət etmək bizim üçün çox xoş idi.

**Süleymanov Vİdadi Həbib oğlu**



1948-ci il fevral ayının 1-də Göyçə Mahalının Basarkeçər rayonundakı Qaraiman kəndindəanadan olub. 1950-ci ildə ailələri departasiya edilib və onlar Tərtər rayonunun Seydimli kəndində köçüblər.
1966-cı ildə Tərtər şəhər 1 saylı orta məktəbini bitirib. Həmin il Çingiz İldırım adına Politexnik İnstitutuna daxil olub, 1971-ci ildə oranı bitirərək rabitə mühəndisi ixtisasını alıb.
1971-1973-cü illərdə Çita Vilayətində leytenant rütbəsində tabur komandiri kimi hərbçi xidmətdə olub.
1992-ci il yanvar ayının 6-da öz kəndlərində (seydimli ) 95 nəfərdən ibarət özünümüdafiə batalyonu yaradıb.
1993-cü il mart ayının 10-da «2-ci Seydimli Batalyonu»nu təşkil edib.
Tərtər rayonunun müdafiəsi uğrunda döyüşlərdə iştirak edib.
1995-ci il iyul ayının 30-da ordudan tərxis olunub.
İsmayıl Tuncla eyni vaxtda döyüşüb.
Dörd övladı var—Müşfiq, Kəmalə, Vüsalə və Ələs.
Hazırda Tərtər rayonunun Seydimli kəndində yaşayır.
(«Seydimli» Batalyonunun şəkli)
Türk İsmayılı mən də görmüşdüm. Vətənpərvər oğlan idi. Onun haqqında sonra danışacağam.
Bizim Seydimli kəndi ermənilərin Çaylı kəndilə həmsərhəd olduğu üçün ağsaqqallarla məsləhətləşib, 1992-ci il yanvar ayının 6-da 95 nəfərdən ibarət könüllü batalyon yaratdıq. «Seydimli» Batalyonunu mən Müdafiə Nazirliyində qeydə aldırdım. Çünki bildirdim ki, yaranmış dəstlərin aqibəti müharibədən sonra necə olur. Bu işdə Nizami Heydərov, Elman Hüseynov (Allah rəhmət eləsin!) bizə yaxşı kömək elədilər.
Batalyonumuz silahlandı. Komarov bizə döyüş tapşırıqları verirdi. Birinci döyüşə 1992-ci il aprel ayının 10-da başladıq. Bizə Ağdərə rayonu istiqamətində Tərtər çayın içi ilə hərəkət etmək tapşırılmışdı. İşin öhdəsindən layiqincə gəldik.
Yolda Tərtər-1 batalyonun qərargah rəisi Pənah Məmmədovla görüşdük, qabaqda bizim bir «BMP» atırdı. Ermənilər də atırdılar, baş qaldırmaq mümkün deyildi. Ermənilərin bir «BMP»-si tank əleyhinə özlərinin düzəltdikləri maneələrə ilişib çıxa bilmirdi, amma atırdı.
Pənah müəllim dedi ki, nə təhər edək? Batalyon qaçır. Batalyon qaçırsa, bizimkilər də qaçacaq.
Mən batalyonun qarşısına çıxdım, dedim:
--Nədi, niyə qaçırsınız, hara qaçırsınız? Belə vaxtı adam qaçar?
Sonra soruşdum ki, erməni nə ilə atır?
Dedilər ki, avtomatla.
Dedim:
--Sizin əlinizdəki nədir? Dedilər ki, avtomat.
Dedim:
Bəs niyə qaçırsınız.?
Bizdən başqa da batalyonlar var idi. Bu sözümdən sonra uşaq qayıtdı. Döyüş sakitləşəndə o biri batalyonun komandiri mənə yaxınlaşıb dedi:

--dayı, məni bədnamçılıqdan sən qurtardın, mən belə bədnam olmamışdım. Yaxşı ki, mənim döyüşçülərimi geri qaytardın!
Həmin döyüş gününün axşam tərəfi idi. Nədənsə, bizimkilər topu ön tərəfdə qoyub, geri çəkilmişdilər. Maşının o o qoşulan yeri qırılmışdı. Pənah Məmmədov dedi ki, top qalıb orda, ermənilər aparacaq.
Gecəylə gedək ki, topu gətirək. Bir nəfər şəhid oldu, Knyaz Qurbanov, komandir «vzvod» idi. Biz topu gətirdik hissəyə. Şəhid olan Fəqanın qardaşı idi.
Mən baş leytnant rütbəsində sovetin vaxtında 57min zenit toplarının alayının komandiri olmuşdum. Burda da baş leytnant və komandir komandir batalyon idim.
«Seydimli» Batalyonunun komandiri mən idim, rəsmi qeydiyyatdan keçmişdik. «Torpaq təpə» istiqamətində müdafiə mövqeyi tutmuşduq.
Topu gətirdik, Nazim var idi, familyası yadımdan çıxıb, onu maşina qoşduq, gətirdik.
İkinci döyüşümüz yenə Ağdərə istiqamətində oldu. Onda batalyonumuz çox itki vermədi. Amma ermənilər itki verdilər. Marquşavanda «Qara» deyilən sahənin yanında ikinci əmri gözləyirdim. Bu vaxt qırmızı «NİVA» gəldi, Ələmşah idi. Dedi:
--Nəcməddin Sadıqov əmr edir ki, geri qayıdım.
Soruşdum ki, niyə?
Dedi ki, hələ vaxtı deyil, qırğınlara yol verərik.
Biz o əraziləri tanıyırdıq, o vaxt o sahələr boş örüşlər idi. Əməliyyatlanın gedişində hərbi müşavirələrdə əsas fikirlərin içində mənim də fikrimi qəbul etdilər.
Sonra biz «Torpaq təpə» əməliyyatında iştirak elədik. Burada bir-iki nəfər itki verdik. Bu itkidən sonra əsgərlərimiz onların qanını almağa and içdilər.
«Torpaq təpə» əməliyyatına 13 iyun 1992-ci il tarixdə getdik. İrəlilədik, sonra ayın 16-sı axşam saat 400 radələrində Çaylı istiqamətində erməni ekspedisiyasına qarşı hücuma keçdik. Çaylı alındı. Əməliyyat belə quruldu ki, Həsənqaya, Levonarx istiqamətində hücuma keçilsin. O gecə saat 5-7 radələrində biz Tərtər çayını keçməyə başladıq. Ermənilər Sərsəng Su Anbarından çayın suyunu həddən artıq çoxaltmışdılar. Biri-birimizdən tutub keçdik. Həsənqayanı aldıq. «Qurtuluş», «Gəncə» «Tərtər-1» batalyonları birlikdə hücuma keçmişdilər.
Vaqif Abdullayev (və bir ayrı oğlan) «Qaz-69» da gedirdi—«Tərtər» Batalyonundanıydı. Erməninin «BMP»-si biz tərəfə atırdı. Hiss etdim ki, Vaqifin maşınını vuracaqlar. Qışqırdım ki, maşından düş, səni vuracaqlar! İkisi də düşdülər, qaçdılar. Aradan 2-cə dəqiqə keçməmiş-maşını nə təhər vurdularsa aşdı.
Sonra Vaqif təşəkkür elədi mənə.
Sonra Ağdərə, 3 nömrəli sovxoz, istiqamətində döyüşlərdə iştirak elədik. Mən həmişə Elman Hüseynovlaböyür-böyürə olmuşuq.
Kəşfiyyat qurupları vardı, onların gƏtirdikləri məlumatdan biz yararlanırdıq.
Marquşevandan Həsənqayaya qədər olan məsafəni Seydimli batalyonu qoruyurdu. Maqnit istiqamətində Ağdərə Qüvvələr də Həsənqayada yerləşirdi. Dedilər ki, bəs ermənilər hücum eləyir. Bizdə bir maşın vardı, üstündə Amerika pulemyotu quraşdırılmışdı. O, «Çapayev»dəki qız atır ey, elə bir şeydi. O pulemyotu bizə Səncədən vermiqdilər. Maşina tərəf getdim, gördüm ki, doğrudan da, ermənilər gəlir. Mən təcili maşina mindim, getdim, iki dəqiqəyə çatdım ora. Bir az qalmış gördüm ki, ermnəilər mühasirəyə düşüblər, özləri biri-birini qırırlar. Orda bir erməni polkovniki var idi. Onun papağı da, qılıncı da indi məndədir, hətta qəməsini də götürmüşdüm.
Sonra gecəylə bir tank, bir «BMP» gəldi, həmin polkovnikin meyidini götürüb getdilər. 100-ə yaxın erməni meyidi qaldı, Həsənqaya istiqamətində, kanalın üstündə.orada

«Səncə» Batalyonundan bir komandiri həbs etdilər. Elə bildilər ki, düşmən qabağından qaçıb.
Sonra 3 nömrəli sovxoz istiqamətində hərəkət edərək oranı aldıq.
Ağdərə istiqamətində gedərkənbatalyoumuzdan iki şəhid verdik. Ümumiyyətlə, 15 nəfər şəhidimiz oldu batalyonumuzdan. Kəndimizdən isə 22 nəfər şəhidimiz var.
1992-ci il avqustun 5-dən bizim batalyonun konsenvasiyası haqqında Müdafiə Nazirliyidən əmr gəldi. Batalyonu buraxdıq. Sonar mən sərəncama verildim, 703 saylı hərbi hissədə qaldım, təxminən 1993-cü il mart ayının 12-də yenidən «Seydimli» Batalyonunu bərpa etdik. Artıq Ağdərə alınmışdı, orada yerləşirdik. Ermənilərin Ağdam, Papravənd, Qızılkəngərli istiqamətində hücumlarının qarşısını almaq bizim batalyonlara tapşırıldı. Biz bu tapşıfrığa əməl etdik, erməniləri o əraziləri çıxartdıq. O vaxt komandir batalyon mən idim., başqa kəndlərdən də adamlar var idi, 120 nəfər idik.
1994-cü ildə batalyonun buraxılması haqqında yenidən əmr gəldi, buraxdıq. Cavan uşaqları aparıb «Tərtər-1» batalylnuna təhvil verdik, təzədən bir də 1994-cü il aprel ayının 12-də ulu öndərmiz Heydər Əliyevin müraciətindən sonra könüllü batalyonların bir bir daha bərpa olunması zərurət yarandı. Tərtər camaatına müraciət etdik, 1 ay ərzində gecələr kəndləri gəzdik. Elə olurdu ki, yazırdım: «Kim özünü kişi bilirsə Tərtərə gəlsin». 1200-ə yaxın adam yığıldı. 3 nömərəli məktəb vardı. Ağdərə istiqamətində, orda yerləşmişdik. Mən onların içində 230 nəfər seçdim. Müdafiə Naziri Məmmədrəfi Məmmədov həmin batalyonu silahlandırmaq istəmirdi. Şəxsən onunla özüm söhbət eldəim, dedim ki, silahı başqa adamlara vermə mənə ver, məndən də tələb elə.
Həmin gün yaxşı silahlar verdilər bizə. Silahlandıq, getdik cəbhəyə. Ermənilərin Borsunluya dəhşətli hücumları gözlənidlirdi. Gəncə-Bakı yolunu kəsmək fikirləri vardı. Həmin gecə biz ikinci eşalon düzəltdik. Ehtiyatda olan qurupsəngərlərdə yerləşdirildi. Həsənqaya kəndinin altında olarkən axşam (komandir biriqada onda Lənkəran Əliyev idi,) əmr gəldi ki, kütləvi surətdə qabağa gedib atəş açın. Təxminən yarım kilometr irəliləyib atəş açmağa başladıq. Borsunlu tərəfdə olan ermənilər elə bildilər ki, onların arxasına keçirik, həmin o atəş erməni qüvvələrini geri çəkilməyə məcbur elədi.
Döyüşlərimizin arasında çox yaxşı oğullar vardı. Orucov Fəxrəddin Fətullah oğlu qəhrəman döyüşçü idi. Ağdərəyə hücum vaxtı şəhid oldu. Sonra Aslanov Ziyadxan İslam oğlu, Ağdərə istiqamətində özünü tankın altına atıb onu partlatdı. Əlində tank əleyhinə qumbara vardı. 55 tank bizim əsgərləri əzirdi. Mərmisi yox idi, nəydi? Ziyadxan yüzlərlə adamın canını qurtardı.
Sonra onun haqqında Milli Qəhrəmanlığa təqdimat yazdılar, lakin hələ də xəbər yoxdur?
Sonra Vəliyev Əli Firudin oğlu, Məmmədov Raqub Aslan oğlu, Məmmdov Asif Əmir oğlu, Quliyev Sarvan Daşdəmir oğlu bizim batalyondan şəhid oldular öz canlarını qurban verdilər.
Kənardan gələn adam diqqəti tez cəlb edir. Türk İsmayıl da bizim diqqətimizi cəlb etmişdi. Vətənpərvər oğlan idi, İqdırdan gəlmişdi. Gülə-gülə dedim ki, İqdırda azərbaycanlılardır, qara Osmanlı imperiyasında olub. Bilirsiniz hər kim isə Azərbaycanın müstəqilliyi, torpaqları uğrunda güllə atıbsa, çox sağ olsun! İsmayıl Tunc Azərbaycan ordusunun karifeyləri ilə—Vəzir Orucovla, Elman Hüseynovla bir yerdə vuruşub. Bunun özü çox şey deməkdir. Mən həmişə İsmayıl haqqında xoş sözlər eşidirdim, onun cəsur bir döyüşçü olduğu barədə danışırdılar.
Bir dəfə mən, Pənah müəllim, Şikar Şükürov (iriqadanın qərargahı raisi idi, Şamaxıdanıydı). Söhbət elədim. Mən dedim ki, qalxıram yuxarı—döyüş yerinə. Bunlar isə maşında durublar. 500 metr aralanmışdım ki, həmin yerə Şikar Şükürov rəhmətə

getdi, Pənah ağır yaralandı. o vaxt Vəliyev Əli Firudin oğlu da yaralandı, onu özümapardım Bərdə qospitalına. Sonra mən Bakıya getdim, Leytenant Şmit adına zavodda batalyona qumbara atan düzəltdim, gətirdim.
Musayev Əli Firudin oğlunun qardaşı Vəli də bizim batalyonda komandir «Vzvod» idi.
Müharibənin hər saatından, anından nə qədər danışmaq olar. Məsələn, Nizami Heydərov yaralı gətiriblər, mən də gəlib çıxmışam ora. «Tərtər» Batalyonuna onun yaralarına baxmışam, ürəyim çox pis olub. Üzü qapqara idi, gözü görünmürdü, qan tutmuşdu. Başladım onun yaralarını silməyə. Gördüm ki, gözünün biri yerində deyil.
Belə ürəkağrıdan hadisələr çox olub. Ağdərə istiqamətində 150 nəfər 17 erməni qırılandan sonra məndə qorxu hissi olmuşdu. Onlar qorxaq idilər, Beynəlxalq ermənipərəst qüvvələrin köməyilə hərəkət edirdilər, Rus qoşunlarının hesabına vuruşurdular.
Mən prezidentimizdən o qədər razıyam ki! bütün bəşəriyyəti bilir ki, Azərbaycan iqtisadi-siyasi sahədə, ordu quruculuğunda ermənidən 10 dəfə qüvvəlidir. Bunu Amerika da bilir, Rusiya da bilir. İqtisadiyyatın yüksəlişi zəmin yaradır ki, ordu güclənsin. Prezidentmiz cənab İlham Əliyev idarəsini ortaya qoyub ki, işğal altında olan torpaqlarımızı sülh yolu ilə geri qaytarmaq lazımdır. Mən şəxsən bundan razıyam. Onsuz da son anda Azərbaycan Ordusu öz sözünü deyəcək.
Müharibə elə-belə iş deyil, Müharibə onunla-ölümün oyunudur, bilmirsən kim qalib çıxacaq.



## ƏYYUB NƏRİMAN OĞLU ƏHMƏDOV

***1972-ci il sentyabr ayının 1-də Tərtər rayonunun Qaradağlı kəndində anadan olub.***

***1990-cı ildə Tərtər rayon 96 saylı Peşə Texniki Məktəbini bitirib. Həmin il Sovet Ordusu sıralarına çagırılıb. 1992-ci ildə hərbi xidmətini yarımçıq qoyaraq Azərbaycanda gedən vətən müharibəsilə bağlı geri dönüb. Elə həmin ili könüllü olaraq 703 saylı hərbi hissəyə yazılıb.***

***İlk döyüş əmaliyyatları gedəndən Marquşevan kəndindən başlayaraq son əməliyytalara qədər – Vəngə kimi döyüş yollarını keçib.***

***Bir neçə dəfə yaralanıb.***

***İsmayılla birlikdə döyüşlərdə iştirak edib. 1994-cu ildə “Atəşkəs”dən sonra tərxis olunub.***

***Ailəlidir, iki oğlu var – Müşfiq və Mehrac.***

***Hazırda Tərtər rayonunun Qaradağlı kəndində yaşayır.***

Mən İsmayıl Tuncla 1992-ci il avqust ayının ya 1-i, ya da 2-si tanış olanda. Bəri başdan deyim ki, çox gözəl komandir və döyüşçü idi.

“Tərtər-1” batalyonunda döyüşürdük. Komandirimiz Pənah Məmmədov idi. Rəhmətlik Vəzir Orucov da bu batalyonda idi.

Biz Türkiyədən gəlib Azərbaycan torpaqları uğrunda vuruşduğuna görə İsmayıla böyük məhəbbət bəsləyirdik. Mən onunla birlikdə çox döyüşdə olmuşam. Həmişə özündən çox döyüşçü yoldaşlarının həyatını qorumağa çalışırdı. Bizə həm praktiki təlimlər keçər, həm də nəzəri cəhətdən öyrədirdi ki, döyüşlər zamanı hansı vəziyyətdə nə cür hərəkət etmək lazımdır.

Vəzirlə birlikdə onun bizə çox koməyi dəymişdi.

Madağiz uğrunda gedən döyüşlərdə İsmayılın cəsarəti və döyüş bacarığı bizim çox karımıza gəldi.

Vəzirlə İsmayıl həm də möhkəm dost idilər. Bir dəfə də olsun onların arasındakı mehriban münasibətdə soyuqluq yarandığını görmədim.

“Ayı heykəli”nin yanında uşaqlar qarşı tərəfdən ermənilərin başını qatdılar, biz arxa tərəfə keçdik. İsmayıl da bizimlə idi. Gördük ki, bir “UAZ” gəlir.

– Yoldan çəkilməyin, – Vəzir dedi.

O bunu ona görə dedi ki, ermənilər bizdən şübhələnməsin, elə bilsinlər ki, öz adamlarıdır. “UAZ” dayanan kimi rəhmətlik Vəzir erməni komandirinin gözündən atdı. İsmayıl “Ayı heykəli”nin yanında gedən gərgin döyüşdə də erməni quldurlarının başlarına oyun açdı, onlardan çoxunu gəbərtdi.

“Qızıl qaya”da da yaddaqalan döyüş olub. Vəzir, İsmayıl, Fəqan, mən və başqa yoldaşlarımızla birlikdə kəşfiyyata gedirdik. Rəhmətlik Vəzir birinci dəfə burada yaralandı. Erməni ağacın üstündən  onu snayperlə atdı. İsmayıl qışqırdı:

– İrəli!!! Hücum!!! Hamı doyüşə!!!

İrəli atıldıq. Yadımdadır, orda xeyli erməni qırdıq. 35-36 erməni meyiti saymışdım. Onların bir neçəsini İsmayıl məhv etmişdi.

Əlimdə “PK” pulemyotla iki qayanın arasında dayanmışdım ki, erməni gələndə atam. Batalyonun komandiri Pənah Məmmədov mənə sarı gəlib dedi:

– Əyyub, gözlə yaxınlaşsınlar, sonra...

Gözlədim. Birdən erməni olan tərəfdən atdılar və mənim yanımda güclü partlayış oldu. Mərminin qəlpəsi “PK” pulemyotunun yarısını kəsib apardı, əlimdə qundağı qaldı. Zərbə məni elə tulladı ki, mən bir tərəfə düşüb qaldım, “PK” bir tərəfə. Başımdan çat aldım. Pənah müəllim yaxınlaşanda dedim:

– Deyəsən, mənə güllə dəydi.

O:

– Güllə nədir? Qəlpə idi, – dedi.

Partlayışın dalğası tullamışdı məni. Allah saxlayanda saxlayır.

Bir dəfə mərmi düşmüşdü düz qabağıma, hücumda idik, qəlpə məni tullamışdı, amma bədənimə keçməmişdi. Mən 4-5 maqazin sinəmə taxmışdım, 4 qumbara üstümdən asmışdım. Uşaqlar məni aradan çıxartdılar.

Qızılqayada hücuma keçəndə Oruc kişini vurdular. Rəhmətlik Vəzir, onun qardaşı Əliyar da həmin döyüşdə idilər. Oruc kişi ilə Allahverdiyev Kərim Novruz oğlunun meyitlərini çox çətinliklə döyüş meydanından çıxarıb gətirdik.

Oruc kişini Qızılqayada vurub, çəkib cığırın ağzına qoymuşdular. Cibindən döyüş yoldaşlarımızın ümumi siyahısını götürmüş, “PK”-nın başı ilə vurub beynini dağıtmışdılar. Qoçaq adam idi, Cəmilli kəndi tərəfdən – Ağkənddən.

Yaxşı döyüş yoldaşlarımdan biri də Mayıl idi, Həsənqayadanıydı. Bir dəfə də ayağından yaralanmışdı, indi o, Rusiyadadır. Ayağını qəlpə aparmışdı, ağac qoyub sarımışdım ki, ayağı düz qalsın, tərpənməsin, sonralar müalicə elədilər, sağaldı.

Suliddinin də çox yaxşı döyüş taktikası vardı. Bir yerdə döyüş əməliyyatlarında çox olmuşuq. Rəhmətlik Vəzir, Türk İsmayıl, Suliddin, Elman müəllim, Mayıl, mən... Hamısının adını yadımda saxlaya bilməmişəm. İsmayıl həmişə olduğu kimi, bu döyüşdə də hamımızı ruhlandırırdı.

Qəbiristanlıqda bir dəfəyə 35 erməni öldürdük.

Bir yaxşı döyüşçü dostumuz da vardı – Əksiparadan Dağıstan. Allah ona rəhmət eləsin!

İnanın, bir dəfə meyitlərin içindən qalxıb, maqazininin hamısını ermənininin qarnına doldurmuşdu.

Orada bir erməni qızı da ölmüşdü.

Ermənilər bir dəfə bizə hücum etdi, çəkildik geriyə, onlar bizə Azərbaycanca söyüş söyürdülər. Nəbi vardı bizimlə, vurdular, qolu getdi.

Vəzir vaxtında gəlib çıxmasaydı, ermənilər bizi mühasirəyə salıb ya qıracaq, ya da əsir götürəcəkdilər.

Bir az sonra ermənilərin texnikası üstümüzə hücuma keçdi. Deməyəsən, aşağıda gizləniblərmiş. Patronumuz qurtarmış, köməyimiz yox idi. Vəzir vaxtında gəldi. Bizə çatan kimi qışqırdı:

– Qorxmayın!

Həyəcanımız bir anda yox oldu. Döyüşdük və qalib gəldik.

Biz İsmayılla kəşfiyyata çox getmişdik. "Ayı heykəli"nin yanında ermənin ona "Parol?" sualına Türk İsmayılın cavabı indi də köhnə dostlarımızın arasında danışılan şirin bir söhbətidir.

İsmayılın kurəyindən yaralanması yadımdadır, bir də başından qəlpə dəymişdi. Dəstəmiz iki yerə bölünüb sağdan və soldan hərəkət ediridi, onda eşitdim İsmayılın yaralanmağını. Hospitala götürdülər. Sonra bir də qayıtdı döyüşə. Çox qoçaqlıqlar göstərib İsmayıl.

Özüm haqqında qəribə bir-iki şey danışım. Ermənilərlə döyüşdə ola-ola evə, mənim adıma əsgərliyə çağırış vərəqəsi göndərmişdilər.

Bir dəfə ailəmizə "Şəhid olub, ölüb" xəbərini veriblər. Atam-anam da arxamca gəlib görmüşdülər ki, sağam. Onda həmin çağırış vərəqəsini mənə göstərib soruşdular:

– A bala, sən nə təhər döyüşçüsən ki, adına çağırış gəlir?!

İndi mən veteran sənədini ala bilmirəm. Getdim. 3 "Şirvan" istədilər, vermədim. Dedim:

– Mən 1994-cü ilə kimi vuruşmuşam. Nə üçün pul verib sənəd almalıyam?!

Onlara nifrət elədim. Mən müharibədə iki dəfə yaralanmışam, amma yenə döyümüşəm əsgərlərimizə yardım aparmışam. General Nəcməddin Sadıqov şahiddi. Döyüşçülərə "QAZ-53"-lə bir maşın heyvan aparmışam. Bizim kalxozumuzun Qapanlı kəndindən sədri vardı. O məni çağırıb dedi:

– Əyyub, yolları tanıyırsan, bunları sən apar.

Geyim əşyaları, siqaret, müxtəlif ərzaq malları... Ayrı-ayrı adamlar heyvan göndərmişdilər ki, aparın Vəzirin dəstəsinə verin.

Necə ola bilər ki, başqaları döyüşməyə-döyüşməyə müharibə veteranı ola bilir, amma mən qalmışam havada. Halbuki 1992-ci ilin avqust ayında könüllü müharibəyə gedib vuruşmuşam. Marquşevandan düz Vəngə kimi döyüşə-döyüşə getmişik. İsmayıl da bunu təsdiqləyər. 6-7 kilometr qalmışdı Xankəndinə, ermənilər qaçırdı. Ora qədər getmişəm, amma bu gün sənəd ala bilmirəm. Bütün sənədlərimi, hətta döyüşdə olan şəkillərimi götürüb getdim, amma vermədilər. Halbuki hamı bilir mən necə döyüşçü olmuşam.

Bir dəfə bir jurnalist gəlib, çəkiliş apardı. Türk İsmayıl məni yanına çağırıb Emin Əlibəyliyə dedi:

– Bu yaxşı döyüşçüdür onu çək.

Biz kor-koranə idik. Nə bilirdik ki, döyüş nədi? İsmayıl bizə öyrətdi ki, daşların arası ilə belə keçin, onu edin, bunu edin. Hər şeyi bilirdi o. Bu adam təcrübəli zabit idi. İsmayıl dost kimi də çox sədaqətli və gozəl insandı!...



**DİLQƏM ƏLƏKBƏR OĞLU SƏYYADİ**

***1971-ci il yanvarın 27-də Tərtər şəhərində anadan olub.***

***Tərtər şəhər 1 saylı orta məktəbi bitirib.***

***1989-cu ildən 1991-ci ilədək Moskvo ətrafında hərbi xidmətdə olub.***

***1991-ci ildə könüllü olaraq “Tərtər” Özünəmüdafiə Batalyonuna yazılıb.***

***1993-cü ilin oktyabr ayınadək ermənilərə qarşı vuruşmalarda iştirak edib.***

***Türk İsmayılın döyüş yoldaşı olub.***

***İki dəfə yaralanıb.***

***Ailəlidir, iki övladı var – Ələkbər və Aytəkin.***

***Hazırda Tərtər şəhərində yaşayır.***

1991-ci ildən ordu sıralarında olmuşam. O vaxt biz hissələrə ayrılıb, qruplarla “post”larda dururduq.

Bir gün postdan qayıdanda batalyonun həyətində 5-6 nəfər mülki geyimli cavan gördük. Batalyonumuz Tərtər rayon 96 saylı Texniki Peşə Məktəbində yerləşirdi. Cavanlar könüllü olaraq orduya gəldiklərini bildirdilər. Onların içində İsmayıl adında bir Türk qardaşımız da var idi. Onlar bizim batalyona qəbul olmaq üçün gəlmişdilər.

Salyanlı Elşən, bakılı Sabir, bir də Türk İsmayıl idi. Üçü də rota komandirini gözləyirdi, çünki hələ tam razılıq almamışdılar, yəni orduya qəbul olunmamışdılar. Onları götürüb bizə – evə apardım. Qonağım olduqları üçün mən onlarla daha yaxından tanış ola bildim.

Türk İsmayılla oturub söhbət etdik. Mən ondan soruşanda ki, nə yaxşı bura gəlmisən? Dedi:

– Bura da mənim öz doğma vətənimdir.

Bakıda İsgəndər Həmidovla görüşdüm və ona bildirdim ki, mən istəyirəm cəbhə bölgəsində döyüşə gedəm. O da, mənə “Tərtər” batalyonuna getməyi tövsiyə etdi. Sonra öyrəndim ki, Tərtər Rayon İcra Hakimiyyətinin başçısı İsgəndər Həmidovun qardaşı Sərdar Həmidovdur.

İsmayıl batalyona qəbul olundu. Həmin gün onları yenə özümlə evə apardım. Səhərisi gün istirahət günü idi. Bizdə qaldıq, ətraflı söhbət etdik. Elşən bakılı idi, Sabir salyanlı, o biri də Türk İsmayıl idi. İsmayılın məqsədini öyrənmək istədim. O dedi:

– Mənim bir arzum, bir niyyətim var. Azərbaycan Türkiyənin qardaşıdı. Mən də bura təmiz ürəklə gəlmişəm ki, öz torpaqlarımız uğrunda döyüşəm. Arzum odur ki, vətənimizi azad edək.

İsmayıl peşəkar döyüşçü idi. Sonralar onun silahla davranışını, hərəkətlərini rotamızın komandiri bizə həmişə nümunə göstərirdi.

Mən bir dəfə İsmayıldan soruşdum:

– Siz silahla məşğul olmusunuz?

O, dinmədi. Axı sovet dövründə biz azərbaycanlı uşaqları çox vaxt inşaat batalyonuna göndərirdilər. Ona görə də silahla davranış qaydalarını mükəmməl bilmirdik.

“Tərtər” batalyonuna elə silahlar gəlib çıxırdı ki, birinci dəfə idi görürdük. Məsələn “RPK-4” deyirdilər, pulemyotuydu, biz onun bircə şunurundan istifadə edə bilirdik, ata bilmirdik.

Türk İsmayıl bizə həmin əl pulemyotunu atmağı öyrətdi, onun yandırıcı, dağıdıcı, güclü bir silah olduğu haqqında məlumat verdi.

Üstündən bir xeyli keçəndən sonra bizə dedi, mən ali təhsilli hərbiçiyəm, rütbəm var, səhv eləmirəmsə, ya leytenant, ya da baş leytenant idi. Burada ona rütbə təklif olunanda, Türk İsmayıl demişdi: "Mən bura rütbə üçün gəlməmişəm, bura torpaqlarımızı almağa gəlmişəm".

O, bizimlə son məqama kimi döyüşlərdə olub, həmişə də öndə gedib. Bizlə dəfələrlə kəşfiyyatda olub, qayıdanda da erməni qulaqlarını kəsib cibində ki, dəsmalın arasında gətirib, yoldaşlara göstərirdi. Həmişə deyirdi ki, biz ürəkli olmalıyıq, torpaqlarımızı azad etməliyik.

Çox uşaq ona baxıb özünə nümunə götürürdü. Fikirləşirdik ki, Türkiyədən gəlib bizim torpağımız uğrunda döyüşürsə, gərək biz ondan da artıq döyüşək.

İsmayıl dostluqda da  çox sadiq idi. O, Madagiz döyüşündə xüsusi məharət göstərdi. Biz Dəstəgül istiqamətində "post"da durmuşduq. Talış istiqamətindən, arxadan, "Platina" tərəfdən ermənilər bizə hücum etmişdilər. Xəbər alandan sonra biz çəkilib çıxdıq. Orda qalan yoldaşlarımız da oldu. Qamət və "KAMAZ" sürən oğlan var idi. İdris, o və iki yoldaşımız orda qalmışdı. Rəhmətlik Milli qəhrəmanımız Vəzir Orucovun və İsmayılın iştirakı ilə onları mühasirədən çıxartdıq. Türk İsmayıl həmişə özü ilə "qranatomyot", bir də "PK" pulemyotu gəzdirirdi. Vuruşdan sonra rota komandirimiz xəbər verdi ki, yenə uşaqlardan ikisi yoxdur. Biz həmin gecə "post" yaratdıq.

Avqustun 6-da Akopkamaridə bizimkilərdən çoxlu yaralanan oldu. Biz qaldıq Akopkamarinin üstündəki yüksəklikdə. Bura "1001 yüksəklik" deyirdilər. Qabaq gecəyə gedirdi. Biz cəbhəni keçmişdik. Ordunun vuruşan hissəsi qayıtmışdı. Orda "BMP"-lərimiz vardı, "Lənkəran" batalyonu da orada idi. Bizə çörək və su gətirdilər ("Mingəçevir" batalyonu da bizlə qalmışdı). Vəkil adlı oğlan vardı, bizi yüksəkliyə o çatdırmışdı.

Səhər üzüaşağı biz Lüləsaz tərəfə (ermənilər ora Akopkamari deyirlər) irəliləməyə başladıq. Dəstəni böldük. Bir hissə kəndin aşağısından, meşə tərəfdən, bir hissə isə üst tərəfdən getdik. Aşağı tərəfdən enənlər kənddə heç kəs olmasa ot tayasını yandırmalı idilər. Yandırdılar, girdik kəndə. Kənd bir kahanın üstündə, yüksəklikdə idi. Möhkəm susamışdıq, "veş- meşok" bir tərəfdən, qorxu digər tərəfdən. Həmişə qorxu susuzluq

gətirir insana, tez susayırsan. Rəhmətlik Elman müəllim bizimlə, İsmayıl isə Vəzirgillə idi. Gördüm uşaqlar kaskada su içir. Bulaq vardı. Bulağa yaxınlaşmağa 30-40 metr qalmış "İstrebitel"lərimiz gəldi. Onlar kəndin sol tərəf yüksəkliyini vurdular. Biz tez girdiy vurulmuş maşının altına. Hər yana qəlpələr töküldü. Həmin gecə bizə kömək də gəldi (öz uşaqlarımız), bir də "Mingəçevir" batalyonu. Qaldıq "Alma bağı"nda. Meşənin solu alma bağı, bağın solu açıqlıqdır. Göy almadan ay "döşədik" ha... Eşiddik ki, "Qara İslam" gəlirmiş, düşüb minaya. Gecə qaldıq burada. Səhər açıldı. Yanımıza Rus Nikolay gəlib çıxdı. Kəşfiyyata getmişdilər. İlham Mustafayev, Umudlu Şakir, Şamil, dörd nəfər getmişdi, amma "ratsiya"ları yox idi. Umudlu Şakir dedi:

– Buralarda erməni var, oraynan getməyin.

– Erməniylə döyüşə gəlmişik də, Şakir, sən getmirsənsə, getmə.

Yolla Çardaqlı kəndi istiqamətinə getdik. Açıqlığa çıxmaq mümkün olmadı, yolun sağ tərəfindəki dağa qalxası olduq. Erməni deyəsən, duyuq düşmüşdü, atmağa başlamışdı. Biz də döşənmişdik dərənin boğazına. Mərmilər gəlib keçirdi. Elə bil dəqiq yerimizi bilirdilər. Üzüyuxarı irəlilədik. Vəzir kəşfiyyata getmək üçün 10 nəfər seçdi – İsmayıl, Əyyub, Mətləb, bir 3 nəfər də "Mingəçevir"dən idi. Getdik. Vəzir bizə:

– Siz burada dayanın, mən indi gəlirəm, – dedi.

İsmayıl Vəziri tək buraxmaq istəmədi, onun arxasınca düşdü. Lakin Vəzir İsmayılı qaytarıb irəli getdi. Ermənilərin "Niva"sını gördük, yemək daşıyırdı.

Vəzir bir azdan qayıdıb gəldi, bizə dedi:

– "MAZ" maşın da var, dörd dənə də "dığa". İki nəfər arxaya gedib qüvvəni gətirsin.

Bir Suliddin idi, bir də yadımda qalmayıb, uşaqlardan hansına getdilər qüvvəni gətirməyə. Rəhmətlik Elman müəllim uşaqlarla meşənin içində oturub, xəbər gözləyirdilər. Bizə 15-20 nəfər lazım idi. Suliddin sonra danışırdı: "Gördüm ki, iki nəfər titrəyir, biri Fikrət idi, əlində avtomat əsirdi, biri də "Mingəçevir" batalyonundan "Kürd" deyirdik, o idi. Baxdım ki, bu "Kürd"ün də əlində avtomat titrəyib şaqqıldayır. Dedim ki, siz qalın. Qayıdıb gəldik. Vəzir 10 nəfər götürüb "Niva"nın böyründən keçdi ki, "MAZ"-ın arxasından fırlanıb dörd "dığa"nı diri tutsun. Çardaqlı qəbiristanlığının hasarının arxa tərəfindəyik. Solumuz qəbiristanlıqdır. Orda Mirzənin əlində güllə açıldı. Ayağı nəyəsə ilişdi, demə əli tətikdə imiş, güllə açıldı, ermənilər duyuq düşdü. Atışma

başlandı. Vəzir əmr verdi ki, üstlə gedib qəbiristanlığın arxasına keçək. Orda İsmayıl çığırdı:

– “İrəliii!!! Batalyon, irəliii!!!”

Bir də gördüm İsmayıl aşdı. Suliddin elə bildi ki, o qədər çağırdı, nəfəsi kəsildi, yıxıldı, arıq idi axı!

Suliddin onun yıxılmağına güldü də. Sən demə, İsmayıl başından, qolundan, ayağından qəlpə alıb yıxılıbmış. Erməni texnika ilə başladı, nə başladı. “BMP” nə təhər şaqqıldıyırdısa, qəbiristanlıq dağılırdı. Ələs idi, “Balta Ələs” deyirdilər, Ələsgər idi yanımda, ağlayırdılar. Birdən Ələsi elə bil qəfil götürdülər, baxdıq ki, dərə aşağı yumalanır. Elə bildik öldü. Bir azdan baxdıq ki, bizə tərəf qalxır, bildik sağdı.

Məlahət adlı qeyrətli bir qız da vardı. Ona dedik ki, sən döyüşə getmə, dur Elman müəllimin yanında, yaralı olsa sarıyarsan.

Dedi:

– Qorxmayın sizə yük olmaram.

Həmin döyüşdə o da kürəyindən yaralandı. Bir də eşiddik ki, Saleh yaralanıb, səhv eləmirəmsə, qəlpə sağ əlini deşmişdi. Mirzə elə yerində qalmışdı. Uşaqlar onu palatkanın arasına qoydular, bağırsaqları tökülmüşdü.

Baxdıq ki, tank gəlir üstümüzə. Orda bir su çən vardı. Çənin böyrünə sıxıldıq. Çoxuyduq, bir 60 nəfər olardıq. “Mingəçevir” batalyonunun komandiri istədi tankı vura, mümkün olmadı. Ordan çəkilib gəldik “Alma bağı”na. Gördük ki, Ələs Vaqifin maşınında üzüqoylu uzanıb. Soruşdum:

– Ələs ölüb?

Dedilər:

– Yox, infarkt keçirib.

Kənd qəbiristanlığın girəcəyindən sağ tərəfdə idi. Burada yoğun bir ağac vardı. Mən ağacın arxasına uzandım. “Mingəçevir” batalyonundan da bir uşaq gəlib mənim yanımda uzandı. Erməni tankı qaçan vaxtı bu mingəçevirliyə qayıtdım ki:

– Allahın altında bir “qranatomyot” olaydı!

Gördüm tank xeyli aralanıb, bu da cavan uşaqdı, təzə gəlib. Dedim:

– Ə, ola bilməz ki, tank bizi görməsin. Dur, yerimizi dəyişək.

Biz yerimizi dəyişdik. Hardansa Saleh gəlib keçdi ağacın arxasına. Bu vaxt həmin tankın atdığı mərmi gəlib düz ora düşdü, Saleh qışqırdı, qolu yaralandı, ağac da aşdı. Biz vuruşmağa başladıq ki, uşaqlar ağacın altından çıxsınlar. Qismətdi hamısı, yerimizi dəyişməsəydik, Allah bilir, o vaxt necə olmuşduq.

Qəbiristanlığa girdik, ermənilərlə möhkəm atışırdıq. Texnika imkan vermirdi ki, başımızı qaldıraq. Tank geri çəkiləndən sonra, ermənilərin " BMP-2"-ləri gəldi. Başladı ağacları vurmağa. Ağaclara dəyən mərmilərin qəlpələri isə ətrafa dağılıb bizi yaraladı. Xeyli uşaq yaralandı. İsmayıl da, Məlahət, Mətləb, mən, Tərtərin Qaynaq Qapanlısından Azad, Saleh də hamımız yaralandıq. Geri qayıdıb, "Alma bağı"-na çatanda gördük ki, Ələs yerə uzanıb, elə bildik ölüb. Maşını saxladıq, köməkli maşına qoyduq. Gözünü açdı, gördü bizim yanımızdadır, gah güldü, gah ağladı...

İsmayılın da yaraları ağır idi, kürəyindən, qolundan yaralanmışdı, ayağında dərin qəlpələr var idi, sümüyə dəymişdi. Məlahət kürəyindən, Elşən çiynindən yaralanmışdılar.

Gəldik Tərtər hospitalına. Ordan göndərdilər Sarova, səhər isə vertalyotla Bakıya apardılar. Respublika xəstəxanasında İsmayılla bir yerdə yatdıq. 4 gündən sonra bizi ayrı-ayrı xəstəxanalara böldülər. Mən "Semaşko xəstəxanası"na düşdüm, İsmayıl, Məlahət, Azad isə qaldılar orda.

İndi də qəlpə onurğa sümüyünün altındadır, təhlükəli olduğu üçün həkimlər çıxartmadılar. 1 ay 10 gün mən qaldım xəstəxanada. Xahiş elədim ki, məni buraxsınlar. Yaralarımı yoxlayıb, razılıq verdilər. Gəldim İsmayılgilin yanına, xəstəxanaya, onlarla görüşdüm. Həmin vaxt döyüş yoldaşlarımızdan da onlardan xəbər bilməyə gələnlər var idi – İslam, Aydın Köçərli, Ədalət.

Sentyabrın 13-də Nikolayla mən bir qayıtdıq (Nikolay xaxol idi, Qzaxıstandan gəlmişdi). Həmin döyüşlərdə mənlə Sakit, Evoğludan rəhmətlik Zabit, Hüsənlidən Qəhrəman, Tərtərdən Zabil, Axundov küçəsindən Babək, Elman müəllim, Pənah müəllim, Suliddin, Zöhrab Borisov, rəhmətlik Oruc kişi, Mahmud, Feruz da iştirak ediblər.

İsmayılın məzəli söhbətləri də olurdu. Həmişə deyirdi ki, o vaxt Andranikin qulağını Atatürk kəsib. İndi də Andranikin nəvələrinin qulağını mən kəsməliyəm. Qoy sonra desinlər ki, ermənin ikinci qulağını da türk azərisi kəsib.

İsmayıl kəsdiyi erməni qulaqlarını  gətirib rayondakı adamlara göstərərk ürək-dirək verirdi ki, qorxmayın, daşnakların hamısını qovacağıq. Evoğludan Cabbar var idi, İsmayılla çox yaxın idi, onunla zarafat edib deyirdi:

– İsmayıl, nə qədər ki, mən sənin yanındayam, erməni qulağı kəsə bilməyəcəksən, gördüm ki, erməniyə yaxınlaşırsan, “qranatomyot”la onu elə vuracağam ki, nə ermənininin özü, nə qulağı ələ gəlsin. Həqiqətən də elə olurdu. Cabbar qaçan erməniləri elə nişan alıb atırdı ki, tikəsi tapılmırdı.

Talışın altında olan vaxtımız idi. Allah rəhmət eləsin, Vüqar var idi, səhv eləmirəmsə, atası Sahib kişi qaynaqçı idi, şəhərdə yaşayırdı, “Narlıq” da olurdular. Biz “post” da olanda, ermənilər texnikadan atəş açırdılar. “BMP”- mizi vurdular.

Vüqar evə getmək istəyirdi. İsmayıl ona:

– Getmə evə, –  dedi.

Ancaq Vüqar getdi. Evdən qayıdıb gələndə yaynan bir güllə gəlib onun ürəyinə dəymişdi. Vüqar Temirin oğlu Mobillə getmişdi.

İsmayıl istəməzdi ki, yoldaşlarından ayrılsın, kiməsə nəsə olsun. Siftə vaxtlar komandir “Vzvod”umuz Zabit idi, onun köməkçisi də İsmayıl idi. Biz ilk gündən İsmayılla bir döyüşmüşük.

İsmayıl o qədər gözəl insan idi ki, onun yaxşılığından, qoçaqlığından danışmaqla qurtarmaz. Biz İsmayılla “post”da da, kəşfiyyatda da, döyüş mövqeylərində də birlikdə olmuşuq. Vuruşa-vuruşa düz Çardaqlıya qədər gedib çıxmışıq. Döyüşdə başımıza bomba da yağıb, güllə də.

İsmayıl batalyona qayıdandan sonra yenə onunla təz-tez görüşürdüm.

Sonra o meyitləri çıxardanda, deyəsən, ikinci dəfə yaralanmışdı. Mən o vaxt orduda deyildim, pambıq zavodunda işləyirdim. Ağdam istiqamətində güclü döyüş gedirdi. Mehrac rəhmətə gedəndən sonra şaiyələr gəzirdi ki, Vəzir ölüb, Elşən və İsmayıl isə ağır yaralanıblar.

İsmayıl müharibədən sonra 1993-cü ildə Bakıda dəmir yol vağzalında işləyirdi, onda onunla görüşdük. Bir dəfə də görüşmək üçün vağzala gedəndə dedilər ki, ta burada işləmir, ayrı yerə dəyişilib. Bundan sonra ondan xəbərim olmayıb.



**KAMİL MƏHƏMMƏD OĞLU PAŞAYEV**

***1970-ci ildə Tərtər rayonunun Ağkənd kəndində anadan olub.***

***Həmin kənddə orta təhsil alıb.***

***1988-ci ildə Sovet Ordusu sıralarına çağırılıb, Maqadanda xidmət edib. 1992-ci ildə tərxis olunub.***

***1991-ci ilin sonunda könüllü olaraq Qarabağ savaşına qatılıb. “Tərtər” Özünümüdafiə Batalyonunun tərkibində vuruşub.***

***1993-cü ilin ortalarında ağır yaralandığına görə ordudan ayrılıb.***

***İki dəfə yaralanıb.***

***İsmayıl Tuncla döyüş yoldaşı olub.***

***Birinci qrup Qarabağ Müharibəsi əlilidir.***

***Ailəlidir, bir oğlu var – Məhəmməd.***

***Hazırda Tərtər rayonunun Ağkənd kəndində yaşayır***

1992-ci ilin əvvəllərində müharibəyə könüllü getdim. “Tərtər” batalyonuna yazıldım. Sovet hökümətinin vaxtında daxili qoşunlarda qulluq etmişdim. Əfqanıstanda qulluq etmiş yoldaş vardı – Vüqar Qasımov. Axşam onunla oturub söhbət edirdik. Dedi:

– Avtomatdan anlayışı olanları “Tərtər” batalyonuna yığırlar.

1991-ci il dekabr ayının 4-ü, ya 5-i idi. İkimiz də getdik. Bizə avtomat verdilər, sökdük, yığdıq, təmizlədik. Üstəlik bilməyənləri də başa saldıq.

Yanvarın 2-si bizi “Tərtər” batalyonuna yazdılar.

Birinci Marquşevan əməliyyatında iştirak etdik. O vaxt Elman müəllim komandirimiz idi. Pənah, Həsən və İslam müəllim bizimlə idilər. 1992-ci ilin may ayının 11-də Marquşevanda çaxır zavodunun arxa tərəfində uşaqlar minaya düşmüşdülər. Gəlib bizi apardılar ki, kömək etmək lazımdır. Bir yaralını çıxartdıq, qabaqda biri də vardı, vəziyyəti yaxşı deyildi. Getdim onu da gətirməyə. Bir güllə də mənim qoluma dəydi. Yaramı sarıdım. Məni apardılar Bərdəyə. Xəstəxanadan doqquz gündən sonra çıxıb gəldim.

Rəhmətlik Ədalətlə Vəzir peşə məktəbinin qarşısındaydılar. Dedilər ki, “Tərtər” batalyonu dağılıb, onu yenidən təşkil etməliyik. Kimin qeyrəti varsa, batalyonumuza yazılmalıdır.

Beləliklə, “Tərtər” batalyonu yenidən yaradıldı.

Levonarxda “post”da yoldaşlarımızla oturub söhbət edirdik. Dedilər: “Bir türk gəlib şəkil çəkir”. Əvvəl elə bildik foto müxbirdir. Sonra öyrəndik ki Türkiyədən bura döyüşmək üçün gəlib. Ürəyimdə türk qardaşımıza “əhsən!” dedim.

Onun geyindiyi formaya, duruşuna, şəxsiyyətinə baxanda elə bildim ki, generaldır. Qəşəng “beretka”sı vardı. Bir neçə şəkil çəkdirdik, söhbət elədik, bir az ona qulaq asdıq.

Həmin ərəfələrdə Lüləsaz istiqamətində əməliyyatlar başladı. Bu əməliyyatda İsmayılla bir yerdə iştirak etdik. Rəhmətlik Vəzir, Türk İsmayıl, Tağı Tağıyev, Suliddin Yusibov... Akopkamari tərəfdən çardaqlı istiqamətinə “Tərtər” batalyonu ilə Mingəçevir uşaqları irəliləyirdilər.Tanklar qabaqda gedirdi, arxasınca da biz. Atışma başlandı.

Naşılıqdan oldu, ya nədən oldu bilmirəm, texnikalar qatışdı bir-birinə, nizam-intizam pozuldu. Ermənilər bu qarışıqlıqdan istifadə edib, daha şiddətlə atmağa başladılar. Orada bir neçə döyüşçümüz yaralandı, şəhid olanlar oldu. Lakin həmin axşamı erməniləri qovub, Lüləsazı aldıq. İsmayıl bu döyüşdə elə hərəkətlər elədi ki, hamının ona hörməti artdı. O vaxt belə oğullara bizim ehtiyacımız çox idi. Biz onun döyüş təcrübəsindən çox şey öyrəndik.

Həmin günü dağın başında qaldıq.

Mən cəbhəyə gedəndə “buşlat”ım-zadım yox idi, yaman üşüyürdüm. Amma neyləmək olardı ki? Gördük aşağıdan bir maşın gəlir. Acıydıq. Bildik ki, bizə ərzaq gətirirlər. Bir neçə uşaq getdik, çörək, yemək gətirdik. Sonra Vəzir, Elxan müəllim, bir də İsmayıl məsləhətləşib qərara gəldilər ki, kəşfiyyata getmək lazımdır. Əvvəlcə gedib araşdırarıq.

8 nəfər seçildik, mən də onların arasında getdik kəşfiyyata. Ermənilərin yerini, qüvvəsini müəyyənləşdirdik. Sonra hücuma keçdik. Burada 30-dan yuxarı erməni qırdıq.

Çardaqlının üstündə də çox düşmən qüvvəsini məhv elədik. Onda Türk İsmayılı lap yaxından gördüm.

Uşaqlara deyirdi:

– Erməni nə köpək oğludu ki, ondan çəkinəsiniz? Qorxmağa dəyməz.

Həmin günü bizi dəyişdirdilər.

1992-ci ildə yaralandım, geri qayıtdım. Sonra İsmayılı bir daha görmədim.



## ELXAN İMRAN OĞLU ARXANOV

***1972-ci ildə Özbəkistan Respublikasının Karşı şəhərində anadan olub.***

***1989-cu ildə Tərtər şəhər 6 saylı orta məktəbini bitirib.***

***1990-cı ildə hərbi xidmətə çağırılıb.***

***1991-ci ildə Qarabağ müharibəsinin başlandığını eşidib, vətənə qayıdıb.***

***1991-ci ildən 1994-cü ilin fevralına qədər Qarabağ müharibəsində iştirak edib.***

***Müharibə veteranıdır.***

***Üç dəfə yaralanıb.***

***Ailəlidir. Bir qızı, bir oğlu var.***

***Tərtər şəhərində yaşayır.***

Sovet Ordusundakı hərbi xidmətimi yarımçıq qoyub gələndən sonra komıssarlığa müraciət etdim. Bildirdim ki, Qarabağ müharibəsinə görə xidmətimi başa vurmamış gəlmişəm. Məni qəbul elədilər. Altı ay top atdım. Sonra fikrimi dəyişdim, ön cəbhəyə – piyada qoşun hissələrinə keçdim. Ondan sonra Ağdərə, Çaylı, Həsənqaya döyüşlərində iştirak etdim.

Bir gün dedilər ki, Türkiyədən bura bir oğlan gəlib döyüşməyə. Hamımız onunla maraqlandıq. Sonra tanış olduq, bir yerdə döyüşlərdə iştirak etdik. Biz orda köhnə döyüşçü idik. İlk görüşümüzdən sonra İsmayılla ünsiyyətimiz köhnə döyüşçülər kimi möhkəmləndi.

Levonarx, Çardaqlı, "Turbaza" döyüşlərində iştirak etdik.

Mən 1992-ci il sentyabrın 2-də Çıldıranda yaralandım. Bakıda 2-3 ay yatdım. Boğazıma, başıma "minamyot"un qəlpələri dəymişdi. Bu dəqiqə başımda hələ qəlpə var. Sağalandan sonra birdə qayıtdım.

Birinci görüşdən İsmayıl bizə xoş təsurat bağışlamışdı. Onun Türkiyədən gəlib bizdən ötrü Azərbaycan uğrunda döyüşməyini çox yüksək qiymətləndirdik. Buna görə də ona böyük rəğbətimiz vardı.

İsmayıl “beretka” qoyurdu. Hərbi təlim görmüş, döyüşlərdə çox ürəkli hərəkət edir, öndə gedən oğlanlardan idi.

Bir dəfə İsmayıl ermənіylə üz-üzə qabaqlaşmışdı. Erməni ondan kimliyini soruşanda bir başa ona: Türk İsmayıl cavabını vermişdi.

Döyüşlərin birində rəhmətlik Vəzirin dəstəsi Sərsəngin sağ tərəfindən, Umudlu istiqamətindən getməliydi, baş qatmalı idi, biz isə arxaya keçməliydik. İsmayıl Tunc da onlarla idi. Biz 12 nəfər “köhnə” uşaqlar və hardasa 15-20 nəfər də bizə qoşulan “cavan”lar idik. Nə isə, getdiyimiz yerdə top atıldı. Bundan sonra bizim İsmayılgillə rabitə əlaqəmiz kəsildi. Suliddin idi, mən, rəhmətlik İnqilab, İlqardır... Ermənіnin “post”unu gördük, meşə ilə irəliləməyə başladıq. Demə, ermənіnin bir “postu” da ayrı yerdə var imiş. Baxdıq ki, oturub yeyib-içirlər. Mən o vaxt çox sağlam idim. Həmişə avtomatımın qoruyucusunu bağlı saxlayırdım. Döyüş başlamayınca açmırdım, qorxurdum ki, qəfildən ayağım-zadım suruşər, əlimdə açılar, kiməsə dəyər.

Suliddin qışqırdı ki:

– Elxan, at!

İnqilab qışqırdı:

– Yox, atma, bizimkilərdir.

Sonra ermənіnin ikisi səs eşidib ayağa qalxdı. Biri məni görən kimi bizim dildə yalvardı:

– Qadan alım, yazığıq, atmayın!

Ləhcəsindən başa düşdüm ki, ermənilərdir, atdım. Onları burada qırdıq.

Bu vaxt alt tərəfdə tank işə düşdü. Vidadi adında oğlan vardı, “qranatomyot”la atdı, vura bilmədi tankı. Suliddin gəlib silahı onun əlindən

aldı və atdı. Ermənilər qaçmağa başladılar. Burada çox güclü vuruşma oldu. Döyüş bizim qələbəmizlə bitdi. 30-dan yuxarı erməni məhv etdik. Qənimət olaraq bizə bir “BMP”, bir “Niva” və bir avtobus qaldı. Sonra xəbər gəldi ki, həmin o “post”u keçmişdik. Qayıtdıq geriyə. Mən yaralıyam. Hardasa 500-600 metr qayıtmışdıq ki, rəhmətlik Tahir, mən, Köçəri Qabil, aramızda bir “sapyor”da vardı...

Qəfildən ermənilərlə qabaqlaşdıq. Gördük ki, onlarda iki ədəd təyyarə vuran dördlülə “Jilka” var. O vaxt rəhmətlik Tahir ermənilərə tərəf qışqırdı:

- Silahı yerə atın, mühasirədəsiniz!

Onların içərisindən bir zənci dönüb bizə tərəf atdı. Atmağıyla "sapyor"umuzun düz alnından vurdu. O rəhmətə getdi. Atışma düşdü. Suliddin və İsmayılgil bizə koməyə gəldilər. Burada ermənilərdən çox qırıldı, 50-60 nəfər olardı.

Ermənilər "Platina"dan tankları qoymurdular gəlməyə. Suliddin irəli çıxıb atdı. Lakin o burada çox ağır yaralandı. Üç itki verdik, 4-5 nəfərmiz yaralandı. İsmayılgil bizdən sağ tərəfdə idilər. Onlar da çox gərgin döyüş aparırdılar. Sonradan mənə dedilər ki, İsmayıl döyüşlərdə əsl pəhləvan kimi, türk oğlu kimi vuruşurdu. Onda qorxu hissi yox idi. Ölümü də vecinə almırdı. Vuruşda həmişə qabaqda gedir, yoldaşlarını arxasınca aparırdı. Onlara elə ruhlandırıcı sözlər deyirdi ki, hamı hücuma pələng kimi atılırdı.

Bu döyüşdə Nərmaniya kəndindən Xəyyam da yaralandı ( Xəyyam hal-hazırda yaşayır).

Rəhmətlik Ədalət Paşayevə, Elman müəllimə mənim böyük hörmətim olub. Elman müəllim komandirimiz idi, amma həmişə ön cərgədə vuruşurdu. Vətənə ürəkdən yanırdı. Ədalət Paşayev, Vəzir, rəhmətlik İnqilab, İsmayıl... aslan kimi vuruşurdular. Rəhmətlik İlqar deyirdi ki:

– Ə, kişi də ermənidən qorxar?

Qorxmaz oğul idi. Onu snayperlə vurdular. Söylən kəndindən idi. Qardaşı Ağalarla döyüşürdü. Həmişə böyük məhəbbətlə yad edirəm. Soltan vardı, o da yaxşı döyüşən oğlanlardan idi.

Məlahət mənim "vzvod"unda olub. Mən 1-ci "vzvod"un komandiri idim. Ceyran adlı bir qız da vardı. Sonra ... bir qız da vardı, Xaçmazdan gəlmişdilər döyüşə. Üçü də qoçaq qızlarıydı.

Sarıcalıdan Mehman vardı, döyüşən oğlanıydı. Qalib, axırıncı dəfə mən yaralananda o boyda güllənin qabağından tək çıxartdı. Bir-birimizi qoyub qaçmaq nəydi? Biz hamımız qardaş idik. O, məni xilas edəndə ölümündən qorxmadı. Özü də yixildığım yer açıqlıq idi, ovuc içi kimi səhraydı, ermənilər oranı aydın görürdülər.

Birinci dəfə Çıldıranda yaralanmışam, üç dəfə qulağıma qan sızıb, heç əhəmiyyət verməmişəm, çünki vətənə böyük sevgi olub məndə. İkinci dəfə Sərsəngdə yaralandım, birinci mən, sonra Suliddin yaralandı. Üçüncü dəfə isə Ağdərənin altındakı yüksəklikdə yaralandım.

Kəşfiyyata rəhmətlik Vəzirlə 3-4 dəfə getmişəm. O, döyüşə təzə komandirlik edirdi, biz isə köhnə döyüşçülər idik – 33 nəfər.

Mən, rəhmətlik İlqar, İnqilab, Suliddin, Qaradağlı kəndindən Boran bir yerdə kəşfiyyata gedirdik.

İsmayılgil də ən ağır kəşfiyyat əmaliyyatlarına gedirdilər.

Bir dəfə Çardaqlının qabiristanlığına kəşfiyyata gedəndə xəbərimiz olmadan düşmüşük minalanmış sahənin içinə. Hardasa Mart, Aprel ayı olardı, nərgiz və bənövşələr hər tərəfi bəzəmişdi, adamın ayaqlamağa heyifi gəlirdi. Meşəynən gedirdik. Deməyəsən, ayağım minanın telinə ilişib, bir addımda irəli atsam mina partlayıb hamımızı qıracaqmış. Arxamca gələn Pənah Yusifov bunu görür, amma orada qışqırmaq olmazdı, axı. Ona görə də qəfildən məni arxaya çəkib yerə yıxdı.

Ümumiyyətlə, çox döyüşlərimiz olub. Bunların hamısı haqqında danışmaq üçün günlərlə vaxt lazımdır.

Döyüşən oğlanların hamısı dəfələrlə ölüm təhlükəsi ilə qarşılaşıblar, amma qorxmayıblar. Çünki arxamızda Vətən torpağı, ana-bacılarımız vardı.

İsmayıl da, bayaq dediyim kimi, çox qorxmaz, cəsur bir döyüşçü idi. Onun qeyrətli bir oğul olması elə ondan bilinirdi ki, Türkiyədən gəlib Azərbaycan torpağı uğrunda ermənilərlə vuruşurdu.



**ZAHİD CAVAD OĞLU İMANOV**

***1959-cu ildə Tərtər rayonunun Seydimli kəndində anadan olub.***

***Orta təhsillidir.***

***1989-cu ildən 1993-cü ilə qədər Qarabağ müharibəsində iştirak edib.***

***İsmayıl Tuncla ağır döyüşlər keçirib.***

***İkinci qrup müharibə əlilidir.***

***Ailəlidir, iki övladı var – oğlu Vüsal və qızı Vüsalə.***

***Hazırda Tərtər rayonun Seydimli kəndində yaşayır.***

Ermənilər tərəfindən torpaqlarımıza hücum olanda, mən də bir azərbaycanlı oğlu kimi silaha sarılıb cəbhəyə getməyi vətənimin qarşısında özümə borc bildim.

Hamı bilir ki, ermənilər çoxdan bizim torpaqlarımıza göz tikiblər.

Mənim döyüş yoldaşlarım, komandirlərim olub. Allah ölənlərə rəhmət eləsin! Elman müəllim, Vəzir kimi igidlərlə birgə vuruşmuşam. Hazırda yaşayan döyüş yoldaşlarımızdan Suliddin Yusibovdu, bir qardaşımız da var Türk İsmayıl deyirdik ona, Türkiyədən gəlmişdi. O, öz doğmalarını qoyub, bizim torpaqlarımız uğrunda vuruşmağa, bizə komək etməyə gəlmişdi. Onun bizə elədiyi yaxşılığı heç vaxt unuda bilmərik.

Türk İsmayılı mən Çardaqlı uğrunda gedən döyüşlərdə görmüşəm. Marquşevandan döyüş əməliyyatına başlayandan bizimlə bir yerdə olub. O, mənim yadımda qəşəng, şəxsiyyətli bir oğlan kimi qalıb. İsmayılın geyindiyi forma bizimkilərdən fərqlənirdi. Əvvəl sovetin formaları idi, sonra geyimimizi tamam dəyişdirdilər. “Paqon”umuza ağ bağladıq ki, ermənilərin formasından fərqlənsin, bir-birimizi tanıyaq. Ermənilər də o vaxt rusun formasından geyinirdi.

Həyatdı da... Müharibədə, həqiqətən, biz çox əzab çəkdik.

İsmayıl apardığımız ən qızğın döyüşlərdə, yaxşı günlərimizdə də, pis günlərimizdə də bizimlə bir yerdə olub.

İlk komandirim Elman Hüseynov idi. Çox qoçaq adam idi.

Vəzir Orucov cəngavər kimi bir oğlan idi. Allah hər ikisinə rəhmət eləsin! Onlar, həqiqətən də, Milli qəhrəman adına layiq oğlanlar idilər və Azərbaycanın Milli qəhrəmanı adını da aldılar.

Vəzir deyirdi:

– Hücuma keçməzdən əvvəl mütləq kəşfiyyata gedib öyrənmək lazımdır ki, görək irəlidə nə var, nə yox? Sonra hücuma keçmək olar.

Kəşfiyyata getməmişdən əvvəl həmişə kimin getmək istədiyini öyrənirdi.

Bir dəfə məndən soruşdu:

– Zahid, biz döyüşə gedirik. Birdən üzə düşərsən, istəyirsən uşaqlarnan qal.

Dedim:

– Yox, mən könüllü gedirəm. Sənlə hara olsa gedərəm, lap ölümə.

O da dedi:

– Yaxşı, elədirsə getdik.

Drambonda vəziyyəti öyrənmək üçün kəşfiiyyat qrupumuz yola düşdü.

Həmişə Türk İsmayılın özü gedirdi irəli. Deyirdi ki, siz gözləyin, işarə verəndə gələrsiniz.

Biz də etiraz edirdik. Amma o bizimlə razılaşmırdı.

Lap adicə bir epizod deyim. Bizdə “Tərtər-1”, “Tərtər-2” batalyonları var idi. Səhv eləmirəmsə, uşaqlar qalmışdılar Drambonun üst tərəfində. Mən də İsmayılgil ilə getdim uşaqları ordan xilas etməyə. İsmayılla Vəzirin yanında idim. Bir meyiti çıxarmaq lazım idi, ermənilər isə imkan vermirdi.

O vaxt ermənilər Vəzirin başına 30-40 min manat pul ayırmışdılar.

Vəzir dayandı dirəyin dibində. Ordan ermənilərə tərəf qışdırdı:

– Ey, mən Vəzirəm, imkan verin meyitləri çıxaraq.

Ermənilər o saat atəşi kəsdilər. Meyitləri çıxaran zaman yenə atmağa başladılar.

Yoldaşlarım qaçdı.

Dedim:

– Vəzir, tək gücüm çatmır.

Dedi:

– Dişinlə də tut, dart.

Birdən meyitlə bərabər helləndim aşağı.

– Mən səni qoruyacam, sən meyiti çıxart, – Vəzir dedi:

Meyiti çıxartdım. Gedəndə bir minalı sahəylə rastlaşdıq. Yoldaşlarıma dedim:

– Siz burada gözləyin, mən gedim, mina partlasa təkcə mən öləcəyəm. Bir yerdə getsək, hamımız ölə bilərik.

Və belə də etdim. Xoşbəxtlikdən minaya düşmədim və dostlarım mənim izimlə gəlib minalanmış sahədən salamat keçdilər.

Çardaqlı əməliyyatı zamanı ermənilər çayın üstündə yuyunurdular. Bizi görəndə döyüş başladı. Türk İsmayıl dedi:

– Qorxmayın, atəş açın!

Burada ermənilərdən bir adam da mühasirədən çıxa bilmədi.

Bir epizod da yadıma düşdü. Avqustun 6-da Levonarx tərəfdə, çayın qırağında texnika ilə piyada qüvvəmiz birləşəndə İsmayıl bizim şəklimizi çəkdi. O döyüşdə xeyli uşaq yaralandı. Şakir şəhid oldu. Ədalət, Əlövsət, Habil yaralandılar. Bizim uşaqların bir hissəsi geri qayıtdı, bir hissəmiz isə Lüləsazın içinə girdik. Orada ot tayasını yandırdıq.

Bir taxıllıq vardı, Akkopkamariyə gedən yolun sol tərəfində idi. Taxıllıq dirənirdi kəndə. Kənd yüksəklikdəydi. Erməni kəndin üstündəki yüksəklildən avtomat və “BMP” ilə atırdı. Taxıllıq yanmağa başladı. Biz sürünüb meşəyə çıxdıq, alov bizə çata bilmədi.

İsmayıl bizim hamımıza qardaşdan artıq olub. Onunla birlikdə keçirdiyimiz döyüş əməliyyatlarından çox danışmaq olar. Əsası isə budur ki, İsmayıl Türkiyədən gəlib bizim uşaqlarla birlikdə erməni quldurlarına qarşı vuruşurdu.



**ƏTRAF İSA OĞLU ƏLİYEV (“QOÇU”)**

***1965- ci il fevral ayının 7-də Goranboy rayonunun Xoylu kəndində anadan olub.***

***Səkkizinci sinfi həmin kənddə, peşə məktəbini isə Gəncədə bitirib.***

***1991- ci ildə “Goranboy” batalyonunda döyüşüb, 1992- ci ildən isə “Tərtər” batalyonunun tərkibində erməni quldurlarına qarşı mübarizə aparıb.***

***1993- cü ilin may ayına qədər müharibədə iştirak edib.***

***İsmayıl Tuncla silahdaş olub.***

***İki dəfə yaralanıb.***

***Qarabağ müharibəsi veteranıdır.***

***Subaydır.***

***Hazırda Goranboy rayonunun Xoylu kəndində yaşayır.***

Mən Gəncədə Alüminium zavodunda fəhlə işləyirdim.

1988- ci il idi. Zavodun sanatoriyası vardı. Hərdənbir ora gedirdik. O vaxt Ermənistandan qaçqınlar gəlmişdilər. Həmin sanatoriyada sığınacaq tapmağa. Onların acınacaqlı gününü görəndə ağlamaq tutdu məni. Onsuz da əvvəlcədən də nifrətim vardı bu xain, nankor daşnaqlara, indi də lap artdı.

Dözə bilmirdim, ona görə də zavodda işdən çıxdım.

Getdim “Xanlar” batalyonuna ki, orada könüllü yazılam döyüşə. Nə qədər xahiş etdim, məni götürmədilər ki, boyun çox balacadır, avtomat səndən yekədir. Amma mən yenə orada qaldım və bir vətəndaş kimi onlara kömək etməyə başladım. Görəndə ki, burda

məni hərbi hissəyə götürmürlər gəldim “Goranboy” batalyonuna. Maşallah müəllim (sonra Milli qəhrəman oldu) bu batalyonun komandiri idi. Ondan xahiş etdim məni batalyona götürsün. O da dedi:

– Boyun çox balacadır, sən avtomat götürə bilməzsən, çəkin də çox azdır.

Ordan birbaşa gəldim xəstəxanaya. Bir həkim var idi, Azər İbrahimov, onun yanına girib:

– Xahiş edirəm, “sroçnu” mənim boyumu uzat, çəkimi də qaldır, – dedim.

Həkim məəttəl qaldı.

Dedim:

– Mən vətən uğrunda döyüşə getmək istəyirəm, amma qəbul eləmirlər ki, boyun balacadır, çəkin də azdır.

Həkim boyumu da, çəkimi də “düzəltdi”, yazdırdım, gəldim. Maşallah müəllimin yanına, sənədi ona verib dedim:

– Bu da mənim boyum, çəkim, ikisi də əsgərliyə uyğun gəlir, di məni götürün.

Dedi:

– Görürəm, sən vətənpərvər oğlansan.

Qəbul elədilər.

Rota Qazanbulaqda yerləşirdi. Gəldik ora. Bir-iki əməliyyatda iştirak etdim, “Karyer”də. Sonra gördüm ki, burda elə bir irəliləyiş yoxdur, çıxdım ordan. Silahı təhvil verəndə soruşdular ki, bəs nə oldu, niyə girmişdin, niyə də çıxırsan?

Dedim:

– Mən daha qızğın döyüşlər olan yerə getmək istəyirəm.

Gəldim “Tərtər” batalyonuna, onda 703 saylı briqadanın tərkibindəydi. Sərdar Həmidov da məni görəndə dedi:

– Bu balacadır.

O vaxtı bizim rayondan Qiyas adlı bir oğlan burda döyüşürdü, O, oğlanın, Allah Vəzir Orucova rəhmət etsin, bir də onun köməkliyi ilə məni götürdülər. Qiyas dedi ki, qoçaq oğlandır, ona görə də “Qoçu” təxəllüsü qoyublar buna.

Nə isə, qəbul elədilər. Mənə avtomat və iki maqazin verəndə dedim ki, birini də verin.

Dedilər:

– Yox, ikisi bəsdir.

– Ə, biz erməni qabağına gedirik, mən bu iki maqazinlə neyləyə bilərəm?

Gülüşdülər. Vəzir bir maqazin də alıb verdi.

Birinci döyüşüm “Almalıq”da oldu. Vəzir, Oruc kişi, Suliddin, Türk İsmayıl, Sərvər, İlham Paşayev, İlham Mustafayev (Cəmillidən), “Seyid” ... İlqar – çox uşaq idik.

Mövqedə gözləyirdik. Sabahısı hücum olmalıydı. Döyüşümüz uğurlu keçdi. İsmayılı bu vuruşmada yaxından tanıdım. O, çox çevik hərəkətlər edir, peşəkarlar kimi döyüşür, həm özünü, həm də yoldaşlarını düşməndən mühafizə etməyi bacarırdı.

Mən həmin döyüşdə ermənininin bir “qranatomyot”unu götürdüm. Onu özüm işlədirdim. Sonra gətirib batalyona təhvil verdim, buna görə mənə 500 manat mükafat verdilər.

Kəşfiyyata getdiyimiz zaman harda erməniləri görürdüksə, onları it arısının yuvası kimi dağıdırdıq.

Vəzir Orucovun “PK” pulemyotu vardı. Bu silahdan xoşum gəlirdi. Fikirləşirdim ki, bu silahın qabağından erməni qaça bilməz, əsl silah budur. Mən avtomatımı təhvil verib, “PK” pulemyotu almaq istəyəndə, qoymadılar, yenə mənə lağ elədilər ki, bu silah səndən ağırdır. Mən dedim: “Sizin nə işinizə qalıb?” Yenə sağ olsun Vəzir, dedi:

– İstədiyi silahı verin buna, qoçaq oğlandır. Silahı götürdüm və həmin vaxtdan ancaq Vəzirlə hərlənməyə başladım. Çünki o, çox igid oğlan idi. Mən, Suliddin, Türk İsmayıl, demək olar ki, həmişə Vəzirlə birlikdə olurduq. Bilmədiyim şeyləri mən onlardan öyrənmişəm. Biz birlikdə Çardaqlı, “Turbaza”, Drambon döyüşlərində olduq. Bu döyüşlərdə Türk İsmayıl bəzən, pis çıxmasın, cin kimi, qızılquş kimi ordan-ora şığıyırdı. Onunla döyüşdə yoldaş olanlar əminiydilər ki, sağ qalacaqlar və qələbə çalacaqlar. Təcrübəli bir zabit idi, çox bacarıqlı və qoçaq idi. Yenə pis çıxmasın, burdan vurub, ordan çıxırdı, erməni heç bilmirdi nədi, nə deyil. Bir də görürdün qəfildən yoxa çıxdı, gah da hardansa peyda olurdu.

“Turbaza”da ermənilərin arxasına keçdik, iki dəstəyə bölündük, gəlib onların palatkalarının üstünə çıxdıq. Orda onları kalan qırdıq. Ədalət Paşayev də orda idi. Vəzir, Suliddin, İsmayıl o tərəfdən erməniləri nə təhər qısnadılarsa, gəlib düz “burnumuzun qabağı”ndan keçəndə bizim dəstə bu tərəfdən, İsmayılgilin dəstəsi o tərəfdən qırdıq bu gavırları. Mən yaralanandan sonra gəldik “ Qozlu körpü”yə, “SNQ Əhməd” də orada idi. Hardansa bir aşıq tapıb gətirdilər. Bu Əhməd ona dedi:

– “Qoçu”nun haqqında bir şey oxu.

Aşıq soruşanda:

– Nə oxuyum?

Əhməd dedi:

– Bu “Qoçu”nun əsl adı Ətrafdır. Ona yaraşan bir şey düz, qoş, oxu.

Aşıq da yalandan nəsə düzdu, qoşdu, oxudu.

Orda bizə dedilər ki, ermənilər tərəfdə yevlaxlı oğlan qalıb. Oruc kişinin meyitini çıxaran gün idi. Gedib onu çıxarmaq üçün hazırlaşırdıq. Mən “PK”-nı söküb yığır, təmizləyirdim. O vaxtı türmədən buraxılan uşaqlardan Şərif vardı, o da uzanıb “raskladuşka”ya beləcə baxır mənə, gülür. Əlbət fikirləşirmiş ki, “ayə, bu körpə uşağa bax, silahını açıb təmizləyir ki, “atkaz” eləməsin, yaxşı döyüşsün”.

Qalxdıq yuxarı. Uşaqlar orda minaya düşüb qırıldılar. Vəzirin qardaşı Əlyarı sağ tərəfindən vurdular. Habil də minaya düşdü. Mina deyəndə, qumbaraları bir-birinə bağlayıb mina kimi düzmüşdülər ki, ayaq jilaya ilişəndə “şpilka” çıxsın, partlasın. Onda “rota”mızın komandiri Teyyub idi.

Sonra səngərdən keçib yolu alanda gördük ki, burada ermənінin bir “BMP-2”-si var. Vura bilmədik. Qaçdı. Arxa tərəfdən gəldik çıxdıq Drambona. Vəzir, Sərvər, Suliddin, Türk İsmayıl, Asim, Sərdar, “Seyid”, Firdovsi, Şakir, Saleh, Adil, Mahir, İlham, mən... Gördük ki, bir tank durub, arxa tərəfdən də ermənilər gəlir. Orda gecələdik. Tərtərdən də bizə xeyli kömək gəldi. Xəbər gətirdilər ki, Vəzir sağ-salamat çatdırılıb, hospitaldadır. Ürəyim yerinə gəldi.

Əyyubuydu, mən və Sarıcalıdan Mübariz idi. Dedilər ki, Çıldırana hərtərəfli hücum etməliyik, kənd alınmalıdır.

Kəşfiyyata getməli olduq. “Ferma”ya az qalmışdı, birdən hay düşdü:

– Ayə, qoymayın, bizi qırdılar!

“Gəncə” batalyonu da, deməyəsən, o biri tərəfdən “Ferma”ya yaxınlaşırmış. Ermənilər də burda güdükdə imiş. Atışma düşdü, nə düşdü! Mənim yanımda “qranatomyot” da vardı, “PK” pulemyot da. Uşaqlar da hamısı burda idi. Mübariz düz mənim yanımda idi. Gördüm ki, “Ferma”dan ermənінin bir yüklü “KAMAZ”-ı çıxdı, vura bilmədik, qaçıb getdi. Bir az aralıda idi. Sonra bir “Villis” çıxdı, o da getdi. Bir Kənan vardı “Gəncə” batalyonundan, yaralanmışdı, onu ordan mən çıxartdım.

“PK”-ynan atıram, bu Mübariz də atır. O, yaralandı. Tərlədim, yoruldum, uzandım və başladım siqaret çəkməyə.

– Ə, dur yerini dəyiş, səni vuracaqlar, – Mayıl dedi:

Bu vaxt elə bildim məni “tok” vurdu. Durdum ayağa. İndi fikirləşirəm ki, ayə, burda “tok”- zad nə gəzir? Deməyəsən ayağımın altından güllə dəyib, dördüncü barmağımın üstündən çıxıb, mən də yerdə “tok” axtarıram. Elə onu gördüm ki, tankı idi, nə idi, bilmirəm, necə qoydusa, dalğası məni götürüb tulladı. Ayağa qalxmaq istəyəndə gördüm ki, gicəllənirəm, başımın içi də vız-vız vızıldayır. Əlimi başıma apardım ki, bir dəmir var, denən qoy dursun dana, xata oldu ki, onu çəkdim, qan götürmədimi məni? Uşaqlar gəlib sarıdı, amma qanı saxlamaq olmadı. Sentyabrın 2-si idi, 1-də Vəzir yaralanmışdı. Məni ordan götürdülər.

Hospitalda gözümü açanda gördüm ki, kimsə qulağını qoyub düz ağzımın üstünə. Elə pisimə gəldi. Fikirləşdim ki, ölmüşəm, nədi? Dedim:

– Ə, sən nağayırırsan?

Dedi:

– Səhərdən nəfəs almırsan, elə bildim ölmüsən. Yoxlayırdım görüm nəfəsin gəlir-gedir, ya yox?

Dedim:

– Ə, mən ölərəmmi heç? Ermənilərnən haqq-hesabım durur hələ.

Vəzir də yan otaqda idi. Sarovdan Əli bəy gəlib dedi:

– Vəzir burdadır.

Özümə gələndə, keçdim onun yanına, görüşdüm. Dedi:

– Sən niyə özünü bu günə qoydun?

Cavab verdim ki, nəbilim, işdir də olur.

Bizi Bakıya götürdülər. Ağır vəziyyətdə olan doqquz nəfəridik. Vəziri də apardılar.

Üç aya yaxın keçməmiş ağsaya-ağsaya yenə qayıtdım cəbhəyə. Uşaqlar onda “Qozlu körpü”də idilər.

İkinci dəfə Paprabənddə, Canıyataq, Gülyataq deyilən yerdə yaralandım. Rəhmətlik Vəzirin üçü idi. Uşaqlar deyirdilər:

– “Qoçu”, indi növbə sənindir, Vəzirdən sonra səni vuracaqlar. Mən də cavabında:

– Məni vura bilməzlər. O da elə oldu ki, vurdular, – deyirdim.

Ağdamın Papravəndində yaxşı yer seçmişdik. Köhnə uşaqlardan, deyəsən, Mətləb idi, Yusif idi... Vəzirin rəhmətə getməyindən danışıram. Kəndin ortasında məktəb vardı, ora tanklar gəlmişdi. Digər tərəfdə də qaya vardı, topları orda yerləşdirmişdilər. Vəzir rabitəylə vurmaq gərəkən nöqtələri bildirdi. Bizim də yanımızda təzə gələn uşaqlar vardı. Vəzir onlara dedi:

– Qorxmayın, bu "Qoçu"ynan ermənilərin anasını çox ağlatmışıq.

Sonra mənə dedi:

– "PK"-nın qur. O "qranatomyot"u ver görüm maa! Mən haranı vursam, sən də pulemyotnan oranı vurarsan.

Rəhmətlik "qranatomyot"u aldı, azca dikəlib dizi üstündə baxırdı ki, hara atacaq. Elə orda, o anda vurdular Vəziri. Xoruzludan bir kəndçisi də bizim yanımızda idi. Adı yadımdan çıxıb. Vuran kimi Vəzir başını yerə qoydu. Axırıncı sözünü soruşdu, danışa bilmədi. Güllə düz alnının ortasından dəymişdi. Sonra baxa bilmədim.

Üç gün sonra bizə bir "BMP-2" verdilər, o da düznən gedəndə vurdular. Dedilər ki, uşaqların meyitləri orda qalıb, gedək çıxardaq. Mənim böyrümdə Ağdamdan bir OMON-çu vardı. Elə "BMP-2"-yə bir az qalmış məni vurdular. Güllə sol döşümün üstündən dəyib böyrümdən çıxdı. Avtomat gülləsiydi – 5x45. Əlimdən silah düşdü, öz-özümə təəccübləndim ki, bu niyə düşdü? Silahı götürmək istəyəndə papaq da uçdu. Əlimi sinəmə vurub baxdım ki, qandı. O oğlan məni götürüb ordan çıxartdı. Ağdamın Qaradağlısında iynə vurdular, sonra huşumu itirdim.

Sonra daha döyüşə qayıda bilmədim.



**ZAMAN ƏNVƏR OĞLU QULİYEV**

**(Birinci qrup Qarabağ Müharibəsi əlili)**

**"QOÇU" HAQQINDA**

"Qoçu" Goranboyun Xoylu kəndində anadan olub.

Əvvəlcədən Xoylu kəndində ermənilər çox idi. "Qoçu" ermənilərlə yola getmirdi. Biz də erməni Levik vardı, Knarikin oğlu onu döyürdü, Mişovun oğlu Raciki döyürdü. Yəni "Qoçu" əvvəldən ermənilərin qənimi olmuşdu. Sovet

hökumətinin vaxtında “Qoçu”nun boyu balaca olduğu üçün əsgərliyə aparmayıblar. Gedib hərbi komissarlıqda komissara deyib:

- Gəl güləşək, səni yıxsam, məni apar əsgərliyə.

Komissar deyib:

- Bunu çıxarın çölə, bu dəlidir.

Erməni təcavüzkarlarımı deyim, faşistlərimi deyim, müharibəni başlayandan sonra “Qoçu” 1991- ci ildə gedib Goranboy rayonunda könüllü orduya yazılıb. Sonra ordan çıxıb gəlib “Tərtər” batalyonuna yazılıb. Onun haqqında hey eşidirdik ki, “Qoçu” burdan vurdu, ordan çıxdı, ermənilərin başına belə od ələdi”.

Mən də onunla bir kəndli olduğum üçün bilirdim ki, “Qoçu”nun boyu balacadır, İsa kişinin oğludur. Amma bilmirdim ki, onda bu qədər hünər var. Biz onunla fəxr edirik. Onun boyu balaca, çəkisi az olsa da, “Qoçu” ləqəbini qazanmışdı. “Qoçu” adı hər adama qismət olmur. “Qoçu”ya o adı verdirən öz ürəyi və əməli olub. Allah rəhmət eləsin Vəzirə, “Qoçu” onun, Suliddinin, Türk İsmayıl haqqında çox danışıb. O deyir ki, Türk İsmayıl kimi oğlanların qeyrətinə, vətənpərvərliyinə vurulmuşam. Belə oğlanlar qanı ilə torpağı yuyurlar, onların qeyrətinin qadasını alım! Söhbət boyun balacalığında, ya çəkinin azlığında deyil, kişilikdədir, namuslu olmaqdadır.

Mən özüm birinci qrup Qarabağ müharibəsi əliliyəm. Arzulayıram ki, müharibə olmasın, sülh yolu ilə torpaqlarımız azad olsun. Əgər müharibə başlasa, mən də, “Qoçu” da, Türk İsmayıl, Suliddin, neçə-neçə qeyrətli oğullar da vətən yolunda döyüşməyə, hətta şəhid olmağa hazırıq. Yəni o vaxt ölməmişiksə və bu gün yaşayırıqsa, biz öz ömrümüzü, bütün həyatımızı vətənə borcluyuq. Mən “Goranboy” batalyonunda döyüşmüşəm. Yaşım çatmırdı. 17 yaşımdan getmişəm müharibəyə və bilirəm müharibə nə deməkdir. “Qoçu”nun bir avtomatı, bir “PK” pulemyotu vardı. “PK” “Qoçu”dan 5-6 sm hündür idi. Döyüşdə “Qoçu” ilə Bakı uşaqlarıda olublar. Ermənin qışqırığı bərk gələndə, həmin uşaqlar qoyub, qaçıb. “Qoçu” qışqırıb ki, hara qaçırsınız? Lakin onları saxlaya bilməyib. O, bir yanına avtomatı qoyur, bir yanına pulemyotu, o biri tərəfdə də “qranatomyot” u . Başlayır bu silahlardan dalbadal atəş açmağa, ermənilər də elə bilirlər ki, burda bir rota var. Onlar “Qoçu”nun başına çoxlu miqdarda pul təyin edirlər, amma deyirlər ki, o bizə diri lazımdır, ölü yox. Qoçu deyir:

– Avtomatımın “qluşiteli”ni çıxartmışdım, ona görə də ermənilər məni avtomatımın səsindən tanıyırdılar. O, döyüşlərdə çox yüksək ad-san qazanıb. “Qoçu”, həqiqətən də, qoç kimi oğlan olub.

“Qoçu”nun döyüşdəki epizodları çəkilmiş, bütün kasetlər “7gün” qəzetində işləyən Emindədir.



**VÜQAR İSLAM OĞLU MƏMMƏDOV**

***1973-cü il fevral ayının 7-də Tərtər rayonunun Hacıqərvənd kəndində anadan olub.***

***1974-cü ildə həmin kəndin orta məktəbini bitirib .***

***1991-ci ilin əvvəlində Sovet Ordusu sıralarına çağırılıb. Leninqradda hərbi xidmətdə olarkən Azərbaycanda Vətən müharibəsinin başlandılğını eşidərək geri qayıdıb.***

***1992-ci ilin əvvəlində könüllü olaraq “Tərtər” Özünümüdafiə Batalyonuna yazılıb.***

***1993-cü ilin sonuna kimi müharibədə iştirak edib.***

***İsmayıl Tuncla birlikdə ağır döyüşlərdə olub. İki dəfə “kantuziya”alıb, iki övladı var – Vüsal və Elgiz.***

***Hazırda Tərtər rayonunun Hacıqərvənd kəndində yaşayır.***

İsmayılla mən döyüşdə tanış oldum.

Həsənqayanın üstündə ermənilərin meyitləri qalmışdı, körpünün yanında “Ferma” deyilən bir yer vardı, orda basdırıldı. “Pozisya” onlarda idi, sonra biz aldıq. Getdik Çardaqlı qəbiristanlığına. “Platina” uğrunda döyüşümüz oldu. Çardaqlının alınması üçün biz bir həftə döyüşdük.

İyul ayının 11-də Çardaqlı qəbiristanlığında aparılan əməliyyatda İsmayıl Tunc çox mərdliklə iştirak edib. Dağıstan idi, Sərvər və Cəlal idi. Rəhmətlik Vəzirin kəşfiyyat qrupu var idi. Çardaqlı qəbiristanlığında “botinkam” cırılmışdı. İsmayıl mənə “botinka” verib, dedi:

– Götür, sənin ayağın yalındı, döyüşçünün ayağı yalın olmaz.

İsmayılla bərabər “Cem” ləqəbli bir türk oğlan da gəlmişdi. Oqtay Mehtiyevlə birlikdə idilər. Onlar dostuydu. Kəndə toya gəlmişdilər, ordan da gəlib bizim yanımızda çəkiliş aparırdılar. O kaset indi də Oktayda durur. O lentdə rəhmətlik Mehracın da epizodları var. Onda “Tərtər-2” batalyonunda idi. Erməni hücum edəndə İsmayılgili gəlib çəkmişdilər. Rəhmətlik Ağalar, Elman... çox uşaq var idi. İsmayıl döyüş gedə-gedə çəkiliş aparıb, qayıdıb getdi.

Mən əvvəlcə “Tərtər-1” batalyonunda olmuşam. Sonra keçdim “Tərtər-2” batalyonuna. Mayıl idi, Əyyub idi...

“Platina”da gedən döyüşlərdə də iştirak etdim. Çardaqlı döyüşündə İsmayıl yaralandı. Bir müddət Bakıda xəstəxanada yatdı. Ağır döyüşlər idi.

Mənim üçün ağır döyüş Qızılqayada və rəhmətlik Teyyubgilnən bərabər Drambonda oldu. Bu döyüşdə “kantuziya” aldım.

“BMP” vardı, “Goranboy” uşqalarının idi. Onların “BMP” sürənlərini mərmi yaralamaşdı, ayrı adam yox idi sürsün. Mən bacarırdım, Sovet ordusunda olanda ondan bizə dərs keçmişdilər.

“Goranboy” uşaqları dedilər ki, erməni hücum eləsə, “BMP” qalacaq, çünki sürən yoxdur. Biz hücuma keçən vaxt “BMP”-ni özüm sürdüm. “BMP”-dən təzə çıxıb durmuşdum yanında ki, mərmi düşdü və “kantuziya” aldım. Rəhmətlik Oruc kişi ilə bir yerdə Ağdərə hospitalında 10 gün yatdım, sonra 10-15 gün istirahət verdilər. Bir də qayıtdım. İkinci dəfə 1993-cü ildə yaralandım, Qızıqayada qəlpə əlimdən dəymişdi, həm də yenə “kantuziya” almışdım. İkinci dəfə 20 gün qaranlıq otaqda yatdım, adi bir şıqqıltı da mənə təsir edirdi. Sonra döyüşə gedə bilmədim.

Çardaqlıya ikinci hücum mənim birinci döyüşüm idi. Mən bilmirdim müharibə nədir? Rəhmətlik Sərdar mənim xilaskarım oldu. Bir dəfə döyüşə gedəndə karıxdığımdan donub ayaq üstə qalmışdım. Rəhmətlik Sərdar mənə yaxınlaşıb həyəcanla dedi:

– Burada ayaq üstə durmaq olmaz! Özünü itirmə, mövqe seç, döyüşmək lazımdır!

Mən İsmayılla bir çox döyüşlərdə iştirak etsəm də, onları sadalamaq fikrim yoxdur. İsmayıl Tunc Türkiyənin İqdır şəhərindən gəlib burada ölüm-dirim savaşında iştirak edib. Bu hərəkətin özü onun necə bir qeyrətli oğul olduğunu göstərir və ayrı sözə yer qalmır.



## ZABİT ƏLİ OĞLU ƏLİYEV

***1962-ci il fevral ayının 11-də Tərtər rayonunun Evoğlu kəndində anadan olub.***

***Evoğlu kənd orta məktəbini 1979-cu ildə bitirib.***

***1980-ci ildə Sovet Ordususuna xidmətə çağırılıb. Qazaxıstanda xidmət edib. 1982-ci ildə tərxis olunub.***

***1990-cı ildə Azərbaycan torpaqlarının müdafiəsi üçün könüllü olaraq hərbi hissəyə yazılıb.***

***1994-cü il yanvar ayının 7-də ikinci dəfə yaralanandan sonra döyüşləri tərk edib.***

***İki dəfə yaralanıb.***

***Taqım komandiri olub.***

***II qrup Qarabağ müharibəsi əlilidir.***

***Ailəlidir, iki övladı var – Elməddin və Gülnar***

***Hazırda Tərtər şəhərində yaşayır.***

“Tərtər” Özünəmüdafiə Batalyonu hələ Tərtərdə yerləşirdi. Rəhbər isə Pənah Məmmədovuydu. Mən də gəlib həmin batalyona yazıldım. Məni “vzvod” komandiri təyin etdilər.

Şəhərin kənarındakı kanalın üstündə “34-cü post” vardı, Marquşevan tərəfdə yerləşirdi. Mənim “vzvod”um orada idi. Əmr gəldi ki, Marquşevana hücuma keçməliyik. Erməni qüvvələri onda Marquşevanda,  Qırmızı kənddə, o biri kəndlərin hamısında yerləşmişdilər. O vaxt onlar Tərtər şəhərinin özünü də atəşə tuturdu. Biz Elman Hüseynovun, Pənah Məmmədovun göstərişlərilə Marquşevana girdik. Bir neçə saatdan sonra əmr gəldi ki, “post” qurun. Mən “vzvod”umla bərabər Marquşevanla Marağa arasında post qurduq. Bir sutkadan sonra əmr aldıq ki, oranı tərk edib, geri qayıdaq.

Biz geri dönəndə gördük ki, bir erməni qulduru qaça-qaça kəndin klubuna girdi. Mən onun arxasınca yüyürdüm. Deməyəsən, erməni quldurları klubun altından özlərinə zirzəmi açıblarmış. Mən özümü çatdırdım. Arxadan onu tutub çölə çıxartdım. Orada “Donuz kəsilən yer” deyirdilər, gətirdim ora və öldürdüm. Bu vaxt indi Bərdə rayonunda Polis çöbəsinin rəisi işləyən Məmmədov Azər Vahid oğlu “BTR”-lə gəlib ora çıxdı. Gördü ki, bir erməni quldurunu öldürmüşəm, düşüb məni qucaqladı, öpdü.

– Sağ ol! – dedi.

Həmin vaxt Azər müəllim baş leytenant idi, o da döyüşürdü. Yadımdadır ki, Azər müəllim də səngərdə bir ermənini öldürdü.

Qayıtdıq Tərtərə. Sonra bizi gondərdilər "Torpaq təpə" istiqamətinə. Bir neçə gün burada qalandan sonra "Aşağı Çaylı" istiqamətində hücuma keçdik. Orada qəbiristanlıqda ermənilərlə güclü atışma oldu, xeyli itki verdik. Mənim əsgərlərimdən də bir neçəsi şəhid oldu. Onların əksəriyyəti Bakı şəhərindən idi, "Şəhidlər xiyabanı"nda dəfn olunublar.

Oradan Həsənqayaya tərəf getdik və orada özümüzə "post" yaratdıq.

Mən burada İsmayıl Tuncla görüşdüm. Örəndim ki, Türkiyədən gəlib, zabitdir. Gəlib ki, Azərbaycan torpaqlarını erməni işğalçılarından qorunmasında bizə öz biliyi ilə, bacarığıyla yardım etsin, döyüşsün.

Türk İsmayıl ilk nəzərdən mənə çox yaxşı təsir bağışladı. Gülər sifəti, nüfuzedici baxışları vardı. Şirin bir türk ləhcəsiylə danışırdı. Ürəyimdə onun qeyrətinə "əhsən" dedim. Cəsur oğlan olduğuna görə hamımız ona hörmətlə yanaşmağa başladıq. Həsənqayada (Levonarxda) nişan qoyub snayperlə atırdım. İsmayıl da snayperlə atmaq istədiyini bildirdi. Adama on bir güllə atdıq, hər ikimiz eyni sayda nişanə vurduq.

İsmayıl Tunc çox bacarıqlı idi. O, döyüşlə bağlı bizə bilmədiklərimizi öyrədir, təlim keçir, müharibə ilə əlaqədar elə şeylər öyrədirdi ki, indyə qədər onları eşitməmişdik. Mən onunla bir yerdə çörək də yemişəm.

Sonra İsmayıl Tuncu rəhbərlikdən çağırdılar. O, getdi. Həmin gündən sonra mən İsmayılı görmədim, yəni bizim döyüş yollarımız ayrıldı. Lakin mən onun döyüşləri haqqında tez-tez eşidirdim. Deyirdilər ki, çox mahir kəşfiyyatçı, ürəkli döyüşçüdür. İştirak etdiyi əməliyyatlarda həmişə uğur qazanıb. Çoxlu erməni faşisti öldürüb, neçə yaralı xilas edib, neçə silahdaşını ölümdən qurtarıb, neçə döyüş meydanında qalan şəhidlərimizin meyitlərini atışma altından çıxarıb, yiyələrinə çatdırıb.

Mən, o cümlədən döyüş yoldaşlarım, İsmayıl Tuncu görən gündən indiyə kimi unutmamışıq, ona həmişə böyük hörmətimiz olub və indi də var. Allah onun canını sağ eləsin!



**SAKİT ŞƏKƏRALI OĞLU ORUCOV**

***1965-ci il yanvarın 10-da İmişli rayonunun Qaralar kəndində anadan olub.***

***1966-cı ildə Tərtər şəhərinə köçübdür.***

***Tərtər şəhər 5 saylı məktəbinin 8-ci sinfini və 96 saylı Texniki Peşə Məktəbini bitirib.***

***1983-cü ildə Sovet Ordusu sıralarına çağırılıb. Krasnoarmeysk vilayətində xidmət edib.***

***1985- ci ildə tərxis olunub.***

***1991-ci ildən könüllü olaraq Qarabağ müharibəsinə qatılıb. "Tərtər" Özünümüdafiə Batalyonunun tərkibində bir çox ağır döyüşlərdə iştirak edib.***

***Ailəlidir, 3 övladı var – Günel, Seymur və Gülnar.***

***Hazırda Tərtər şəhərində yaşayır.***

İsmayılla mənim tanışlığım Levonarx döyüşündə olub. Onunla könüllülərin bütün döyüşlərində, demək olar ki, axıra kimi iştirak etmişəm.

Onlar bizim yanımıza gələndə iki nəfər idilər. Biri İsmayıl, digəri isə "Cem" idi.

Bizə xəbər verdilər ki, Türkiyədən iki türk qardaşımız köməyimizə gəlib. Ürəkdən sevindik. Onlarla birinci görüşümüz Marquşevanın üstündə oldu. Batalyonumuz həmin kənddə yerləşirdi. Pənah Məmmədov batalyonda qərargah rəisi idi. Vəzir Orucov "vzvod" komandiri idi, Elman Hüseynov siyasi işlər üzrə müavin.

Vəzir, İsmayıl, Suliddin, mən və daha 7-8 nəfər həmişə birlikdə kəşfiyyata gedirdik. Lüləsaz, "Turbaza", Sərsəng ("Platina"), Çardaqlı, Drambon döyüşlərində həmişə bir yerdə vuruşmuşuq.

Ən ağır döyüşümüz Çardaqlının qəbiristanlığında oldu. 40-42 nəfərə kimi erməni qırdıq. Onlardan qənimət kimi xeyli silah-sursat ələ keçirdik və gətirib batalyona təhvil verdik. Biz orda erməniləri yeyib-içdikləri vaxt yaxaladıq. Bütün bu ağır döyüşlərdə İsmayıl Tunc bizimlə bərabər olub. O, necə lazımıydı, elə də döyüşürdü. Qorxmurdu. İsmayıl olan yerdə heç vaxt dilxorçuluq, qorxu-filan olmazdı.

Biz “Turbaza”da xeyli daşnaq öldürdük. Ordan Drambona tərəf gedib yolu aldıq. Bu döyüşdə rəhmətlik Ədalət Paşayev yaralandı və rəhmətə getdi. Elman müəllim də yaralandı, dizləri yanmışdı. Hadisə “Ayı heykəli”nin yanında olmuşdu. Ermənilərin bir “BMP”-si gəlib yolun ortasında yatdı. Mingəçevirdən bir oğlan vardı, qumbaraatanı ata bilmədi. Sonra ayrı bir oğlan qumbaraatanı götürdü. Elman müəllim onun arxasında durmuşdu. Həmin oğlan atanda, alov Elman müəllimin dizlərini yandırdı.

Həmin döyüşdə ermənilərin sursat dolu bir “KAMAZ”-ını vurduq, bir “UAZ” ələ keçirtdik. “UAZ”- ın içindəki “ratsiya”nı Vəzir götürdü, avtomat, “minamyot” mərmisini götürdük, bıçaq var idi. O, götürüldü, balaca “ratsiya” aparatı vardı, cip telefonu boyda, onu mən götürdüm.

Həmin yeri itkimiz olmadan aldıq. Sonra Elman müəllimlə qılçasını güllə qıran oğlanı “Təcili yardım”la yola saldıq. Drambonun yüksəkliyini yüz əzab-əziyyətlə alıb mövqe tutmuşduq. Gecə 16-17 uşaqla həmin yüksəklikdə qaldıq. Bizə heç bir kömək gəlmədi. Rəhmətlik Vəzir nədənsə icazə vermədi ki, arxadan kömək istəyək. Rayonda həmin vaxt şayiə yayıblar ki, bizim hamımızı ermənilər qırıb, girov götürüblər. Sərdar Həmidov Vəzir Orucova zəng elədi. Vəzir cavab verən kimi, o, soruşdu:

– Vəzir, sağ-salamatsınızmı?

Vəzir vəziyyəti ona çatdırdı. Sərdar Həmidov dedi:

– Sizə köməyə adam göndərirəm, darıxmayın.

Sabah açıldı. Biz yüksəkliyi əldən verməmişdik. Bir də gördük ermənilərin texnikası gəlir – iki tank, iki “BRDM”, bir hərbi “QAZ-66”.

Vəzirlə İsmayıl dedilər ki, gedib ermənin texnikasını vurmaq lazımdır. Vəzir “ratsiya” ilə 88-ə, yəni “Qrad” qurğlarının üstündə durana zəng edib düşmənin texnikasını koordinatlarını bildirmək istədi.

– “Vostok”, mən 52-yəm, cavab ver, koordinatları deyirəm, oranı vurun!

Hacıqərvənd kəndindən bir Sərvər vardı, Allah ona rəhmət eləsin, o da xəbər verdi.

Onu da deyim ki, biz yüksəkliyi ələ keçirən vaxt arxamızdan “Goranboy” və “Babək-44” (Xanlar rayonu) batalyonları geri çəkilmişdi, ermənilər gəlib həmin mövqeləri tutmuşdular. Biz mühasirədə qalmışdıq. Uşaqlardan yaralananları vardı, onları bir az ordan uzaqlaşdırıb gətirmişdik.

Bayramın oğlu Mahir də bizimlə olmuşdu. Vəzir və o istəmirdilər ki, köməyə gəlsinlər. Amma Sərdar Həmidov dedi ki, sizə köməyə tankları göndərirəm, saat 9-a, 10-a yanınızda olacaqlar. Tanklar gəldilər. Tankçının biri elə Vəzirin xalası oğlu idi. Ermənilər bizim tankları gördülər və onlardan dördünü vurdular – ikisini Drambona gedən yolun dönəcəyində, ikisini də ayrı yerdə. Vəzirlə İsmayıl məsləhətləşdilər ki, belə olmaz, tanklar burda qalsın, biz piyada kəndin içi ilə gizlin yolla gedib arxadan ermənilərin tanklarını vuraq ki, onların başları qatışsın və bizim texnika döyüş mövqeyinə çıxa bilsin. Elə belə də oldu. Biz keçdik yüksəkliyə. İsmayılın məsləhətləri həmişə bizim karımıza gəlirdi. Elə bil ki, hər şeyi əvvəcədən görürdü – nə deyirdisə, o da olurdu. O, əvvəlcədən bizə xəbərdarlıq etmişdi ki, ehtiyyatlı olaq, burada güclü döyüş ola bilər.

Vəzir qumbaraatanla ermənilərin iki tankını və  bir "BMP"sini vurdu. Atışma başlandı. Düşmən qüvvəsi burada ağır itki verdi.

Bu döyüşdən sonra hər birimizə, həmçinin İsmayıl Tunca 3 min (üç 10-luq paçkası) manat pul mükafatı və üç günlük istirahət verildi, tutduğumuz mövqeyə isə ayrı döyüşçülər qoydular.

Rayona gəldik. İki gün keçməmiş xəbər gəldi ki, bəs sizin yerinizdə qalan uşaqları ermənilər qırıblar, imkan vermirlər ki, meyitlər çıxarılsın.

Vəzir məni çağırıb vəziyyəti danışdı və dedi ki, uşaqları tap, getməliyik.

Getdik. Mövqeyə yaxınlaşanda heç kim irəli getmək istəmədi. 4 meyit yiyəsi də bizimlə idi. Ölənlər "aptek Əli"nin oğlu Rafiq idi, Teymurun oğlu Rizvanıydı, Tofiqin oğlu Elçin idi (Quliyev), İsmayıl bu prosesdə çox böyük igidlik göstərdi. Meyitləri götürüb çıxaranda o da bizimlə idi.

Bayandur kəndindən Pənahın qardaşı, deməyəsən, həmin döyüşdə yaralanıb və özünü bir evin içinə sala bilib.

İsmayıl sonra danışırdı:

– Gördüm ki, bir nəfər evin içinə girdi. Elə bildim erməniди. Onun arxasınca getdim ki, atım. Məni görəndə, dedi:

– Atma, yaralıyam, azərbaycanlıyam.

İsmayıl iki yoldaşıyla birgə o yaralını döyüşə-döyüşə xilas edib, gətirib öz mövqeyimizə sağ-salamat çıxara bilmişdi. Həmin oğlan öz həyatını İsmayıla borcludur.

Yoxsa, ermənilər orda onu öldürəcəkdilər. İsmayıl deyirdi ki, burada biz ölsək də, bu meyidlərin ki, sahibləri gəlib çıxıb bura, biz onları çıxarmalıyıq.

Meyitlər açıqlıq yerdə olduğundan, ermənilər imkan vermirdilər ki, onlara yaxınlaşaq, güllə yağdırırdılar.

Biz çox ağır şəraitdə, iki itki versək də, meyidləri oradan çıxara bildik. Burda yaralananlarımız da oldu – biri şəhərdən, biri kənddən idi. Mahmud vardı. Ona güllə dəyməmişdi. Yıxılanda daş böyrünü əzdi, deyəsən qabırğası sınmışdı. Birinin ayağına güllə dəymişdi, səhv etmirəmsə, adı Taleh idi, Sarovdandı. Onları rayona mən gətirdim.

Ermənilər orada çox itkilər verdilər.

Yadımdadı, Əli kişi özü oğlunun meyitini götürmək istəyirdi, mən qoymadım, dedim:

– Bir evdən biri şəhid olub, barı ikincisi olmasın. Meyitləri dalda yolnan endirib "Təcili yardım" maşınının yanına götürüb gəldik. Bundan sonra bizi bir həftə istirahətə buraxdılar. Döyüşlərdə Suliddin, İlham (indi bir qolu yoxdur), Dağıstan (sonra onu bir yaralı erməni düz alnının ortasından vurmuşdu, rəhmətlik Dağıstan elə bilmişdi ki, ermənini öldürüb yaxınlaşanda köpək oğlu erməni vurmuşdu onu), Umudludan Şəmkir vardı (oda rəhmətə getdi), İlham Paşayev ürəknən döyüşürdülər.

Yadımdadı, erməniləri nə təhər qırmışdıqsa, Sərsəngnən Çardaqlı arasında, Umudlu yolunun üstündən karıxıb tanklarını da aşırmışdılar, düşüb dərənin dibində qalmışdı, qaça bilməmişdi.

Biz çox vaxtı döyüşlərdə hərbi texnikadan istifadə etmirdik. Texnika döyüşü bəzən adamı aldadır. Necə ki, Malakanlardan yuxarı Levonarxda texnika döyüşünə aldanıb, itki çox verdik. "Lənkəran" və "Gəncə" batalyonundan çox adam qırıldı.

Biz əsasən ermənilərin arxasına keçib onları qırırdıq, həmişə piyada gedirdik. Bu döyüşlər, yəqin ki, İsmayılın da yaxşı yadındadır.

Axırda Qızıl Qayada olanda bizə xəbər çatdı ki, könüllüləri geri çağırırlar, onları daha döyüşlərə buraxmırlar. Beləliklə, bizi "sildilər", dağıtdılar.



**ÜLFƏT İSMAYIL OĞLU YUSİBOV**

***1974-cü il oktyabr ayının 28-də Tərtər rayonunun Səhləbad kəndində anadan olub. Orta təhsilini həmin kənddə alıb.***

***1992-ci ilin əvvəlində könüllü olaraq "Tərtər" Özünümüdafiə Batalyonuna yazılıb.***

***1992-ci il noyabr ayında Azərbaycan ordusu sıralarına həqiqi hərbi xiidmətə çağırılıb.***

***1993-cü ildə Laçının müdafiəsi uğrunda gedən döyüşlərdə yaralanıb.***

***1994-cü ildə ordudan tərxis olunub.***

***Ailəlidir.***

**Qeyd: Bu kitab çap olunan ərəfədə Ülfət Yusibovun faciəli sürətdə həlak olması xəbəri alınmışdır. Allah ona rəhmət eləsin!**

Hələ 18 yaşım tamam olmamışdı. Amma ermənilərin nankorluğu mənə yaman pis təsir edirdi. Onlar bizim mərhəmətimizdən istifadə edərək artıq, üzr istəyirəm, qudurmağa başlamışdılar, bizlə torpaq davası döyürdülər. Buna görə də hamının etirazına baxmayaraq, könüllü olaraq evdən gizlin gedib "Tərtər" batalyonuna üzv yazıldım.

Marquşevanda başlayan ilk döyüşlərdən müharibədə iştirak eləmişəm. Çox cəsur döyüşçülər yadımda qalıb. Onlardan biri də Türk İsmayıldı. Açığını deyim ki, vuruşan oğulların hamısı qoçaq idi, ama rəhmətlik Vəzir, Türk İsmayıl və mənim əmim oğlu Suliddindən yox idi. Bunların hər biri, inanın, 10-20 nəfərə əvəz idi. İsmayılla iştirak etdiyimiz döyüş əməliyyatlarından çoxu elə indi də gözümün qabağındadır. Amma mən onların bəzilərindən danışacağam, hamısını söyləməklə qurtarmaz. Bilirdim ki, İsmayıl türk hərbiçisidir. Gözləri yanırdı. Bizə çox xoş idi ki, o, atasının vəsiyyətinə görə öz qeyrətiylə ordan vurub gəlib burda – Tərtərdə, döyüşürdü. Görəsən bizim hansımız gedib Türkiyədə döyüşərik?... Çoxu burada öz vətənini qorumurdu.

İsmayılla Levonarx uğrunda gedən döyüş ərəfəsində tanış oldum. Mən hiss etdim ki, onu bura vətən qeyrəti, vətən eşqi gətirib. Sonralar öyrəndim ki, onun ata-babası Qərbi Azərbaycandan Türkiyəyə – İqdır şəhərinə gediblər. O vaxt ermənilər ordakı

azərbaycanlılara xüsusi amansızlıqla divan tutduqlarına görə, daha dözə bilməyib, Arazın o tayına keçiblər.

İsmayıl döyüş zamanı çox cəld hərəkətlər edirdi. O, müharibənin qayda-qanunlarını, silahla davranma üsullarını uşaqlara öyrədirdi.

Bütün silahların dilini bilirdi. Gah avtomatdan, gah pulemyotdan, gah da "qranatomyot"dan istifadə edirdi. Levonarx, Akopkamari (Lüləsaz), Çardaqlı, Metşen, Sərsəng Su Anbarı ("Platina"), "Turbaza", "Ayı heykəli"və Drambon uğrunda gedən ən ağır döyüşlərdə igidliklə vuruşub.

O, tez-tez Vəzirlə, Suliddin, "Qoçu", İham Mustafayev, İlham Paşayev və digər ciyərli uşaqlarla kəşfiyyata gedirdi. Həmişə də öndə olurdu. Döyüş zamanı birdə görürdüm ki, Türk İsmayılın nərəsi gəlir.

– "İrəliii!!! Uşaqlar, irəliii!!! Arxamca irəliii!!!"

Bütün döyüşçülər bu səsdən ruhlanıb irəli cumurdular.

İndi dəqiq deyə bilmərəm, deyəsən Levonarx tərəfdə 100-ə yaxın Çardaqlının qəbiristanlığında 40-dan çox, "Turbaza"da nə qədər ermənінin qırılmasında İsmayılın xüsusi rolu oldu. O, bu döyüşlərdə onlarla erməni öldürdü, neçə texnika sıradan çıxartdı.

Bilirsiniz, ötən günlərdi, hər şeyi dəqiqliyiylə yadda saxlamaq olmur. Bircə onu bilirəm ki, harda təhlükəli kəşfiyyat əməliyyatı, harda ağır döyüş vardısa, İsmayıl orada idi. – Vəzir Orucov, Suliddin, Dilqəm, İlham, Sərvər və neçə neçə belə igid oğullarla bir yerdə idi. Elə buna görə də iki dəfə ağır yarlandı.

Amma açığını deyim, onun döyüşləri qoyub qəfil çıxıb getməsi indi də mənim üçün müəmmadır, nə üçün getdi, niyə getdi, bilmirəm.



## FİKRƏT İSMAYIL OĞLU YUSİBOV

***1972-ci ildə Tərtər rayonunun Səhləbad kəndində anadan olub.***

***1989-cu ildə həmin kənddə orta təhsil alıb.***

***1990-cı ildə Sovet Ordusu sıralarına çağırılıb.***

***1991-ci ildə həqiqi hərbi xidməti başa vurub.***

***1992-ci ilin iyun ayında könüllü olaraq Azərbaycanın silahlı qüvvələrinin tərkibinə yazılıb. Ağdərə rayonunun Marağa, Marquşevan,***

***Həsənqaya, Lüləsaz, Çardaqlı, Moxratağ, Ortakənd  və bir sıra digər yaşayış məntəqələri uğrunda döyüşlərdə iştirak edib.***

***Bir dəfə ağır "kantuziya" alıb.***

***İsmayıl Tuncla döyüş yoldaşı olub.***

***1995-ci ildə ordudan tərxis olunub.***

***Ailəlidir, üç övladı var.***

***Hazırda Tərtər rayon Səhləbad kəndində yaşayır.***

1992-ci ilin avqust ayında Malakanlar kəndində döyüşə hazırlaşırdıq. Dedilər ki, bir türk gəlib. Bizə bu xəbər təəccüblü göründü və onun kimliyiylə maraqlandıq. Gördük ki, o şəxsiyyətli oğlandı, türk ləhcəsində danışırdı. Əmim oğlu Suliddin bizi tanış elədi.

Malakanlarda, "Kompleks" deyilən bir yer vardı, ora sübh tezdən hücum etdik.

Buradakı erməni qüvvələrini dağıtmalıydıq. Bizim dəstənin komandiri İsmayıl idi. Oranı dağıtdıq, sonra da çəkildik.

"Triuqolnik" deyilən hündür bir təpə vardı. Bizim texnika ilə piyadalarımız qabaqlaşdı. Erməni qüvvələri bizi çox yüksəklikdən atəşə tutdu. Orada xeyli canlı qüvvə itirdik.

İsmayıl bizi gizli yollarla meşəyə çıxartdı. Gecəni meşədə qaldıq.

– Qorxmayın, hər şey yaxşı olacaq, qələbə bizimdir, – İsmayıl dedi.

Sabahısı gün buradan Çardaqlıya hücuma keçdik. Biz aşağıda erməniləri darmadağın etdikdən sonra onlar Lüləsaza, Çardaqlıya çəkilmişdilər.

1992-ci ilin avqust, sentyabr ayları idi. İrəlidə İsmayıl gedirdi. Nə isə... Burada çox şiddətli və ağır bir döyüş oldu. Nəhayət, Çardaqlını götürə bildik. Xeyli canlı qüvvə məhv etdik. Ermənilər hər şeylərini qoyub qaçmışdılar. Xeyli hərbi texnika, "MAZ", "NİVA" markalı maşınlar qalmışdı. Özlərinin düzəltdikləri bir döyüş maşını vardı, o da qalmışdı.

Həmin döyüşdə hücuma keçən zaman İsmayıl belə qışqırdı:

– İrəli!!! Allahu-Əkbər! Hücuma!    Qorxmayın, qələbə bizimlədir!

Ermənilərə Çardaqlının qəbiristanlığında yaxşı dərs verdik, onlardan çox yaralanan və ölən oldu. Beləliklə, biz tam irəliyə hücum etdik.

Ermənilərin “BMP”-si Çardaqlının ən gizli yolunda – Lüləsazda arxamızı kəsdi. İsmayıl bizi orada ölümdən qurtardı. “BMP”-nin aşağı endiyini hamıdan tez gördü və bizə əmr etdi:

– Mövqe tutun! Döyüşə hazır olun!

Suliddin qumbaraatanla “BMP”-yə tərəf bir atəş açdı. O bunu xəbərdarlıq üçün atdı. “BMP” çəkilib getdi. Biz Lüləsazın “Alma bağı”na endik, orada “post”umuzu qurub, gecələdik. İsmayıl bizi “post” üçün növbəyə düzdü ki, hər dəqiqəmiz təhlükəlidir, bizi tuta bilərlər, ayıq-sayıq olmalıyıq.

İsmayılın qoçaqlığı haqqında çox şey danışmaq olar. Güclü komandir idi, təcrübəsi vardı, döyüş taktikasını çox yaxşı bilirdi. O, Türkiyədən hazır zabit kimi gəlmiş, uşaqlara təlim keçir, müharibənin qayda-qanunlarını bizə mükəmməl öyrədirdi. Onun dediklərinə əməl edib, bəhrəsini görür, uğurla irəli gedirdik.

Bizə deyirdi:

– Allah köməyimizdə duracaq, çünki biz haqq yolundayıq. Vətənimiz uğrunda vuruşuruq.

Elə bil İsmayıl həmişə müharibədə olmuşdu. Hər şeyi bilirdi, çox təcrübəliydi. Onun hesabına əməliyyatlarımız uğurlu keçirdi.

1992-ci ilin avqustundan sentyabra qədər onunla bir yerdə vuruşduq. Mən yaralanandan sonra onlardan ayrıldım. O vaxt yanına “minamyot” mərmisi düşdü və ağır yaralandı. Çox məyus oldu. İnanmırdım ki, İsmayıl yaralana bilər.

İsmayıla hər şey halaldır. Düzgün yol göstərən komandir olub. O, hamının, hər bir əsgərin qədrini bilirdi. Bizi kəşfiyyata aparanda sıraya düzüb deyirdi:

– Kim yuxusunu qarışdırıbsa, kim istəmirsə, getməsin, qalsın burada.

Elə olurdu ki, kimsə sıradan çıxıb qalırdı. İsmayıl Tunc, Vəzir Orucov, Elman Hüseynov, Suliddin Yusibov kimi çoxlu yox, hər batalyonda 5-10 nəfər döyüşən oğlanlarımız olsaydı, indi ermənilər bizim torpaqlarımızda, başımızın üstündə yox, Allah bilir, hansı cəhənnəmdəydilər. Çardaqlı istiqamətində gedən döyüşlərin birində Suliddinlə bir ağacın dibindəydik. Bu vaxt ermənimin “BMP”-si çıxdı. Atışma başladı. Demə düşmənin piyada qüvvəsi “Naves” deyilən yerin o biri tərəfində imiş. Bu döyüşdə İsmayıl, Məlahət, Mirzə öldülər. 12-13 nəfər qaldıq. Vəzir ded ki, yeri dəyişmək lazımdır.

İsmayıl həmin döyüşdə o qədər: “İrəli!!! İrəli!!! Hücum!!! Hücum!!!” – deyə qışqırmışdı ki, bir də gördük, yerə yıxıldı. Mən elə bildim çox qışqırdığına görə nəfəsi kəsilib yerə yıxıldı. Sən demə, yaralanıbmış.

Axırda bir mərmi nə təhər düşdüsə, Ələddin papaq kimi uçdu. İsmayılın gözləri qurd gözlərinə oxşayırdı. Vəzirdən sonra komandir qoydular.

O, əvəzsiz döyüşçü, etibarlı dost, gözəl insandı. Eşitmişəm, Bakıda işləyir. Allah onun canını sağ, yolunu açıq eləsin. Elə oğulların yaşamağa haqqı var.



**ELMAR ƏFQAN OĞLU QULİYEV**

***1969-cu il may ayının 19-da Tərtər şəhərində anadan olub.***

***1986- cı ildə Tərtər şəhər 5 saylı orta məktəbini bitirib.***

***1987- ci ildə hərbi xidmətə çağırılıb. İrkutsk şəhərində xidmət edib. 1989-cu ildə tərxis olunub.***

***1992- ci ildə könüllü olaraq “Tərtər” Özünümüdafiə Batalyonuna yazılıb.***

***1997- ci ilədək orduda olub.***

***İsmayıl Tuncla birlikdə torpaqlarımızın erməni işğalçılarından azad edilməsi uğrunda gedən gərgin döyüşlərdə iştirak edib.***

***Bir dəfə yaralanıb.***

***Ailəlidir, dörd qızı, bir oğlu var.***

***Hazırda Tərtər şəhərində yaşayır.***

1992- ci ilin fevral ayından könüllü orduya getmişəm. 4 ay dərs keçib, çağırışçı kimi yollanmışam cəbhəyə.

İsmayılla ilk tanışlığım Akopkamaridə – “Alma bağı”nda olub. Orda görmüşəm onu. Baxdım belə, geyimi başqa cürdür, danışığı da seçilir, maraqlandım dedilər türkdür.

Rəhmərlik Vəzir, Oruc kişi, rəhmətlik Şakir Bağırov, bir sözlə, Tərtərin ən igid döyüşçüləri yanımdaydılar.

Bunlar deyəndə ki, o gələn oğlan türkdür, fikirləşdim ki, bizdə müharibə gedir, elə yerlərimiz var ki, ordan adamlar torpağı qoyub qaçırlar, amma bu, Türkiyədən gəlib

burda döyüşür, ölümə gedir. Görünür, Azərbaycana bağlı insandır. Əgər bu gün o, burdadırsa, biz hər zaman bir addım ondan irəlidə olmalıyıq.

Döyüşlər zamanı İsmayılı çox müşahidə edirdim və onun xüxusiyyətlərini bəyənirdim. Bunlar heç zaman yadımdan çıxmır.

Əsgərləri döyüşə ruhlandırmağı çox gözəl bacarırdı. Onun səsini eşidən hər kəs istər-istəməz düşmənlə döyüşə atılırdı. Nə olursa-olsun, İsmayılda döyüş zamanı bir addım belə geri çəkilmək söhbəti olmurdu.

Biz dayandığımız “Alma bağı” ilə Lüləsazın arası hardasa 12-13 kilometr olardı. Dağlıqdır. Meşələrlə gedib, yüksəkliyə bir 4 kilometr qalmış dayandıq. 6-7 adam kəşfiyyata getdi – rəhmətlik Vəzir, Mayıl, Şakir, Umudlu Şakir də onların arasında idilər.

Getdilər, hərlənib gəldilər. Şakir dedi ki, ayrı texnikayla bərabər düşməndə “Jika” da var. Qorxduğumuz elə “Jika” idi. O, mərminin bir növüdür, durduğun yerdə bir də görürsən vurur, çox təhlükəlidir. “Jika” dan başqa ermənilərdə tank və “BMP-1” olduğunu da dedilər.

Məsləhətləşmə getdi. Türk İsmayıl dedi:

– Nə olsun ki, “BMP” dayanıb, “Jika” var. Bizim də qumbaraatanımız var.

O, uşaqları böldü. 10 nəfər ayrılıb arxaya keçdi, o özü isə bizimlə bərabər qarşı tərəfdə qaldı. Vəzirlə İsmayıl nə etmək barədə uşaqları təlimatlandırdılar.

Ermənінin biri səngərdən çölə çıxmışdı. Fəqan onu vurdu, ölən mayor idi. Həmin anda İsmayılla Vəzir tankı vurdular. “BMP-1”-i də vurduq, götürdük. Həmin döyüşdə məhv edilən texnikadan başqa düşmənin 35-40 nəfər əsgəri öldürüldü.

Biz tərəfdən Dağıstan öldü, onu tank vurmuşdu, mən yaralandım. Bu döyüşdən fotoşəkillər və videokasetlər çəkilib, rəhmətlik İnqilab çəkmişdi, hətta televiziyada da bizim bu döyüşümüzü göstərmişdilər.

İsmayılla tanışlığımızdan təxminən 1 ay 15 gün keçirdi. Bir dəfə məni daim düşündürən sualı ona verdim:

– İsmayıl, nə yaxşı evini-eşiyini qoyub Türkiyədən bura döyüşməyə gəlmisən?

O, bir qədər sakit dayanıb üzümə baxdı, sonra ciddi tərzdə dedi:

– Biz bir millətik, qanımız da, dinimiz də birdir. Azərbaycanın torpaqlarını yağı düşməndən biz də qorumasaq, bəs kim qoruyacaq? Mən bu döyüşdən şərəf duyuram.

İsmayılla, digər döyüş yoldaşlarımla (Suliddin, Ələddin) Dağlıq Qarabağın gözəl meşələrində çoxlu söhbətlərimiz, zarafatlarımız da olub. Mən bunları unutmamışam. Görünür, İsmayıl da unutmayıb. Çünki aradan bir neçə il keçəndən sonra, bir dəfə hüzr yerində görüşdük. Görən kimi dedi ki, "sən filankəs deyilsənmi?"

İsmayıl heç dəyişməmişdi. Həmin İsmayıl idi, gözləri də həmin mənalı gözlərdi. Xatirimdə qalan bir neçə epizodu da söyləmək istəyirəm. Bir dəfə vacib bir məlumat üçün kəşfiyyata getmək lazım idi. Bu məqsədlə üç nəfər rus desantıçısı gətirilmişdi. Amma sonra fikirləşirdik ki, bunlara etibar etmək düzgün olmaz. Birdən keçərlər düşmən tərəfinə. Qərara alındı ki, mən də onlarla gedim "Turbaza"ya.

İsmayıl məni kənara çəkib xeyli söhbət etdi. Dedi ki, get amma onlara o qədər də etibar eləmə, işini ehtiyatlı tut.

Elə bil məni yuxudan ayıltdı kəşfiyyata getdim, uğurlu oldu, amma İsmayılın sözləri də çox köməyimə çatdı.

İlham var Tərtərdən, dolu oğlandır, yaxşı döyüşçü olub. "Drambon" əməliyyatında o, əlində qumbara çıxdı "BMP"-nin üstünə. Erməni bir də gördü ki, başının üstündə əlində qumbara olan bir türk var. Qışqırdı.

"Qızıl qaya"da, İsmayıl da, rəhmətlik Vəzir də ordaydı, hücum edib çadırları götürəndə erməniləri qanlarına qəltan elədik.

Müharibə heç kəsə xeyir verməyib. O cümlədən, bizim ailəyə də. Biz dörd qardaşıq. Dördümüz də kasıbdıq, dördümüz də hərbçi olmuşuq.

Böyük qardaşım zabitdir, müharibə başlayanda Dağıstandan birbaşa Marquşevana gəldi. O birisi polisdən çıxıb döyüşə getdi. Mən də onun kimi. Amma elələri var ki, döyüşdə olmaya-olmaya veteran vəsiqəsini qoyub cibinə, özü üçün güzəştlər axtarır. Mən belə şeylərə dözə bilmirəm və öz sözümü deyirəm.

Orduya 1992-ci ildə getmişəm. Vətən yolunda iki xalam oğlu şəhid olub.

İsmayılın döyüşləri bu gün də yadımdadır.



**İSLAM CAVANŞİR OĞLU MÜRSƏLOV**

***1952-ci il iyun ayının 18-də Tərtər şəhərində anadan olub.***

***1968-ci ildə Tərtər şəhər 3 saylı 8 illik məktəbini bitirib.***

***1973-cü ildə Sovet Ordusu sıralarına çağırılıb. Astraxanda xidmət edib. 1975-ci ildə tərxis olunub.***

***Müharibənin ilk günlərindən könüllü olaraq "Tərtər" batalyonuna yazılıb və 1994-cü ilin may ayında bağlanmış "Atəşkəs müqaviləsi"nə qədər erməni quldurlarına qarşı döyüşüb.***

***İsmayıl Tuncla döyüş yoldaşı olub.***

***Üç dəfə yaralanıb.***

***Qarabağ müharibəsi veteranıdır.***

***Ailəlidir, üç övladı var – Kifayət, Ruhiyyə, Nicat***

***Hazırda Tərtər şəhərində yaşayır.***

İlk döyüş əməliyyatına Tərtər rayonunun Ağkənd kəndinin üstündəki "Torpaq təpə"dən başladıq. Rayon ərazisi üçün ən qorxulu mövqe "Torpaq təpə" idi. Ermənilər həmin istiqamətdə xeyli qüvvə, silah-sursat cəmləşmişdi. Ordan Tərtər güzgü kimi görünürdü. Strateji cəhətdən çox mühüm yüksəklik idi. Rayon ordan elə bil ayaq altında qalırdı.

"Torpaq təpə" istiqamətindən hələ döyüş başlamamışdan əvvəl bütün Tərtər camaatı çox əzab-əziyyət çəkdi. Gecə-gündüz keşikdə durub oranı qoruyurduq. Allah rəhmət eləsin, Bakıdan Milli qəhrəman Şikar Şikarov bizə döyüş komandiri kimi gəlmişdi. O, Pənah Məmmədovla "Torpaq təpə"də "minamyot"un qəlpəsindən yaralandı, sonra rəhmətə getdi. Pənah da hospitala düşdü. Sonra rəhmətlik Elman müəllim gəldi, başladı onları əvəz etməyə. Ondan sonra rəhmətlik Vəzir gəldi.

Döyüşlər başladı.

İsmayıl bizim yanımıza Levonarxda gəldi. Ordan başlayan ilk döyüş əməliyyatlarından tutmuş, demək olar ki, axıra qədər İsmayıl bütün vuruşmalarda iştirak edib.

Biz Levonarx istiqamətində idik. Dedilər ki, bir nəfər türk oğlan gəlib. Onunla görüşdük. İlk nəzərdən hiss olunurdu ki, alicənab oğlandı. O, bizim hamımızın xoşuna gəldi. Ona görə ki, müharibə vaxtı bizim özümüzdən dalda da gizlənənlər çox idi.

Amma o, Türkiyədən bura bizə köməyə gəlmişdi. Bu, bizim üçün kifayət idi, heç döyüşə getməsə də. Çox yaxşı münasibətdə idik.

Vətən yolunda canından keçməyə hazır olan oğlanlar vardı ki, onlardan da biri İsmayıl idi. Döyüşü aparan əsas şəxslər vardı, Vəzir Orucov, Elman Hüsüynov, İsmayıl Tunc, Suliddin Yusibov, Qəbələdən Vaqif, Ədalət Paşayev, Saleh, Ələddin, “Dambro”, “Qoçu”, Xoruzludan İdris, Mərkəz, Düyərli Kamil, Mayıl, Əli, Vəkil, “Kürd” Çingiz, Əlövsət, Fikrət, Mirzə, Ələs, Nurəddin, Dağıstan, Məlahət, Qarağacıdan Elman, Əhəd, Kənan, Vüqar, Hafiz, Mətləb, Əhəd, Sərvər, Əyyub, Ərşad, Şakir, Şöhrət, Dilqəm, Babək, “Kazyol İlham”, “Qara İslam”.

Biz Ağdərəyə gecə qalxanda Ədalət Paşayev qolu gipsdə gəlmişdi, o yaralanmışdı. Qolunu gipsə salmışdılar, yarası hələ sağalmamış bizə köməyə gəlmişdi, bizlə bərabər getdi Ağdərəyə çıxdı.

Çardaqlıda, qəbiristanlıqda gedən vuruşmada mingəçevirli Mirzə, evin tək oğlu (müəllim oğlu) Nurəddin rəhmətə getdi, mollanın oğlu Saleh və Türk İsmayıl yaralandılar. Məlahət adlı bir qeyrətli qız vardı, o yaralandı, Dağıstanı alnından atdılar, Ələs yaralandı.

Madagizdə mən də yaralandım, hospitala düşdüm, qayıtdım gəldim ki, uşaqlar Levonarxdadırlar. Hospitaldan sonra hələ iki-üç gün vaxtım var idi ki, dincələm. Lakin qalmadım. Üçüncü gün tamam olmamış bir də yaralandım.

Levonarxdaydıq, rəhmətlik Elman müəllimi çağırdılar briqadaya. Qayıdıb gələndə gördüm rəngi çox qaralıb. Soruşdum:

– Nə olub, xeyirdirmi?

Dedi:

– Bizə çox ağır tapşırıq veriblər.

Soruşdum:

– Nə tapşırıqdı elə?

Dedi:

– Bu gecə biz Ağdərənin başında olmalıyıq.

Dedim:

– Burda nə problem var ki? Deyirlərsə Ağdərənin başında olun, biz də olarıq da.

Sən narahat olma.

Gecə kəşfiyyata getdilər. Vəziyyət haqqında məlumat gətirdikdən sonra gecə Malakanlardan 12 maşın işıqsız getdik çıxdıq Ağdərənin yüksəkliyinə. Bizi də yalandan aldatmışdılar ki, Ağdərədə ermənilər yoxdur, özümüzünkülərdir. Baxıb gördük ki, Ağdərədə ermənilər su gətirir, mal-qara aparır, nobata gedirlər. Elə bil onlara heç dəxli yox idi ki, müharibə gedir. Bizimkilərin qarşısını ermənilər "post"da kəsmişdilər və orada atışma başlanmışdı.

Yadımdadır, Suliddin, İsmayıl, Məlahət, Anar, biz bir yerdə idik. Atışdıq, ermənilər canlarını götürüb qaçdılar.

Çardaqlı qəbiristanlığının içində döyüşdə İsmayıl, Azad və mən yaralandıq, bizi apardılar Bakıya.

İsmayıl heç bir döyüşdə geridə qalmayıb. O, bizimkilərdən sadə idi, yoldaşlarına qarşı münasibəti çox yaxşı idi. Ən ağır döyüşlərdə iştirak edirdi.



**İLHAM SABİR OĞLU PAŞAYEV**

***1959- cu ildə Tərtər rayonunun Bala Kəngərli kəndində anadan olub.***

***1976- cı ildə orta məktəbi bitirib.***

***1978- ci ildə həqiqi hərbi xidmətə çağırılıb. 1980- cı ildə xidmətini başa vurub.***

***1990- cı ilə qədər Rusiyanın Krasnoyarsk şəhərində işləyib.***

***Azərbaycanda vətən müharibəsi başlandığını eşidəndə geri dönüb.***

***1992- ci ildən müharibənin sonuna qədər Qarabağ uğrunda gedən döyüşlərdə iştirak edib.***

***İki dəfə ağır yaralanıb.***

***Ailəlidir, üç oğlu var – Cavid, Fərid və Amid.***

***Hal-hazırda Tərtərdə yaşayır.***

1992- ci ilin avqust ayı idi. Türk İsmayılla ilk görüşüm Malakanlar kəndində oldu. Hələ döyüş başlamamışdı. Bir həftəyə yaxın bu kənddə qaldıq. Komandirimiz rəhmətlik Elman Hüseynov idi (sonradan ona Azərbaycanın Milli Qəhrəmanı adı verildi).

Təxminən bir həftə sonra hücuma keçdik, Akop Komari kəndinə tərəf ilk hücumumuz başladı. İsmayıl elə birinci döyüşdən çoxlu igidliklər göstərdi. Həmin döyüşdə ermənilərin atdığı mərmi gəlib düşdü qardaşım Ədalət Paşayevin olduğu dəstənin yanına. Ədalət, Habil Əliyev və mən orada yaralandıq, lakin yaralarımız yüngül olduğu üçün, xəstəxanada onları sarıyıb, göndərdilər geri. Çardaqlı istiqamətində güclü hücumlar başladı. İsmayıl hamımıza nümunə idi. O, heç bir qorxu bilmədən qışqıra-qışqıra döyüşə atılırdı. Orda 40- a yaxın düşmən öldürdük.

Rəhmətlik Vəzir gəldi, hər uşağa o vaxtın 10 min manatını payladı.

Ermənilər qırdığımız meyitlərini daşıdılar, çünki hələ Çardaqlını almamışdıq. Onlar cəsədləri basdırmaq istəyəndə hücuma keçdik. 40-a yaxın "boyevik" erməni də orada qaldı.

İki gün sonra komandirimiz Elman müəllimin əmriylə Sərsəng su hövzəsinə tərəf hücuma keçdik. Çardaqlını aldıq. Bütün bu döyüşlərdə İsmayılın cəsarəti, ağıllı fikirləri, döyüş əzmi, şən ruhu bizə çox kömək edirdi.

"Qurtuluş" batalyonu vardı, komandiri Şahin Tağıyev idi. Bakıdan gəlmişdilər. Onlar da döyüşürdülər.

Kəndin çıxacağında orta yol var, qırağıynan tank gedirdi, tankın arxasınca rəhmətlik Aslan Kərimovun maşını gedirdi. Aslan Kərimov da çox cəsur və comərd bir oğlan idi, ölümdən qorxmurdu. O da, müharibə başlanandan çox işlər görmüşdü. Heyif ki, həmin döyüşdə Aslan rəhmətə getdi!

Sərsəngdə ağır döyüş oldu. İrəlidə gedən "T-70" erməni tankı minaya düşdü.

Ona tərəf özüm yüyürdüm. Gəldim ki, üç nəfər ekipajdan ikisi ölüb, biri isə sağdır. O, rus idi. Başını lükdən çıxarmaq istəyəndə, əlindən tapancasını alıb, öldürdüm, sonra yola çıxdım.

Türk İsmayılla bərabər Sərsəng tərəfdə iki gün qaldıq. Rəhmətlik Vəzir, Oruc kişi, Tağı müəllim, Ədalət...

Sonra "Turbaza"ya hücum üçün plan hazırlandı. Həmin məntəqəyə dörd istiqamətdə hücuma keçmək lazım idi. Əvvəlcə rəhmətlik Vəzirin komandirliyi ilə 12-13 nəfər "Turbaza"ya kəşfiyyat qrupu getdi.

Yarım saat keçmiş xəbər gəldi ki, orada nə qədər erməni varıymışsa, Vəzirin kəşfiyyat dəstəsi qırıb. İsmayıl da o dəstədə olmuşdu.

Səhərə yaxın biz hücuma keçdik, "Turbaza"nı aldıq. Oradan Kəlbəcər yoluna çıxdıq. İsmayıl orada igidlik göstərirdi. Şəxsən mənim gözümün qabağında ermənininin qulağını kəsdi. Bu, cəbhə yoldaşımız Ələddinin yanında baş vermişdi.

Biz təxminən 6-7 nəfər, Türk İsmayılla birlikdə komandirimizin tağşırığı ilə yeni döyüşə getdik. Bir taxıllıqdan keçmək istəyəndə kolluğun arxasından bizə tərəf güllə açıldı. İsmayıl işarə ilə bizi başa saldı ki, əyilin aşağı, özü isə əyilə-əyilə güllə atılan səmtə getdi. Bir azdan qayıdıb, gələndə gördük ki, onun əlində kəsilmiş bir baş var. Sakitcə dedi:

– Ermənininin başçısının başıydı, kəsdim. Erməni bunu biləndən sonra başladı qaçmağa. Biz də düşdük bunların dalınca. Üç nəfər ermənini diri-diri tutduq, biri qaçdı.

İsmayılın birinci igidliyini orda gördüm. Bizim ən gizli kəşfiyyat əməliyyatlarımız rəhmətlik Vəzir Orucov və Türk İsmayılla bağlı idi. Döyüşün yollarını bilirdi.

Mən sovetin vaxtında tikinti batalyonunda xidmət etmişəm. Silah nə idi bilmirdim. Müharibənin qayda-qanunlarını İsmayıl bizə öyrədirdi. O, hamımızda yüksək əhval-ruhiyyə yarada bilirdi. Bundan sonra gülədən belə qorxmurduq, ölümün üstünə gedirdik. Elə buna görə də ermənininin neçə kəndini aldıq. Kim aldı? Əlbəttə, "Tərtər" batalyonu.

Şəxsən mən Vəzirlə, İsmayılla, Suliddinlə olanda qorxu hissi nə idi, bilməmişəm. Birinci döyüşə gedəndə, bir az həyəcanlanmışam, sonra isə belə bir hiss mənə yad oldu. Fikirləşmişəm ki, ölərəm, ölərəm, qalaram – qalaram. Təki vətən sağ olsun.

İsmayıl həmişə bizə deyirdi:

– Qardaşlar, mən nə təhər gedirəmsə, siz də düşmənin üstünə elə gedin, qorxmayın, ciyərli olun!

Vəzir Orucovdan hamı ilham alırdı. Onunla fəxr edirdik, qürur duyurduq. O, qeyri-adi bir insan idi. Bizə elə gəlirdi ki, ona güllə də kar etməz. Vəzirlə çiyin-çiyinə olduğumuz

vaxtlarda heç kəs deyə bilməz ki, kimsə kəşfiyyatda yaralanıb, ya şəhid olub. O, elə taktika seçirdi ki, onunla əməliyyata gedənlərdən heç biri ziyan çəkmirdi.

Vəzirlə Türk İsmayıl hər vaxt bir yerdə idilər. Biz də onlarla birlikdə idik.

İsmayılın igidliyi, qorxmazlığı bizə böyük dərs və örnək idi.

Deyirdi:

– Çalışın, düşmənin istiqamətini düz seçin, özünüzü qorumağı bacarın.

Bizə həmişə məsləhət verir, hansı şəraitdə nə cür hərəkət etməyi, pusquda necə durmağı, kəşfiyyat zamanı nələri bilməyi öyrədirdi bizə. Hücuma keçəndə birinci özü gedirdi.

Qışqırırdı:

- İrəli! Hücum!

Biz də irəli cumurduq. Nəticəsi isə göz qabağındadır. Rəhmətlik Vəzir Orucov, Türk İsmayıl, Elman Hüseynov, Tağı Tağıyev, Ədalət Paşayev kimi döyüşçülərin sözləriylə oturub dururdu, ona görə də itkilərimiz az, qələbələrimiz isə çox olurdu. Çünki onlar ağıllı adamlar idilər. Düz Vəngə qədər gedib çıxdı. Bu adamların hesabına bizim batalyonda o qədər də itki olmadı.

İndiki kimi yadımdadır. Ermənilər bir vaxt yalvarırdılar:

“Türklər, türklər, nə olar, Laçın dəhlizini açın, qoyun çıxaq gedək!”

Sonradan isə bizim bəzi “başbilənlərin” səhvləri ucundan ermənilər üstümüzə ayaq açdı, bizim batalyondan 1993-1994-cü illərdə çox uşaq şəhid oldu.

Ən qanlı döyüşlərimizdən biri Drambon uğrunda döyüş olub. Rəhmətlik Vəzir, Türk İsmayıl, Elman müəllim... Elman müəllim qılçasından yaralanmışdı. Bu hadisə yanımda olmuşdu. Saleh və mən “Təcili yardım”a qoyub, yola saldıq. Hələ Drambona girməmişdik.

Bir yüksəklik vardı, Elman müəllim, orada yaralanmışdı. Biz həmin mövqeyə keçmək üçün, yalan olmasın, 10-15 kilometr yol fırlandıq. Gedərkən yolun qırağında 4-5 erməni cəsədi gördük, güllələnib qalmışdılar. Elman müəllimi 1 kilometr yarım əlimizdə gətirəndən sonra “Təcili yardıma” qoyduq və mövqeyə qayıtdıq.

İsmayıla Tunc İsmayıl da deyirdik. Çox mehriban, özgəyə yanmağı bacaran bir insan idi. Şəxsən onu mən türkiyəli hesab etmirdim, özümüzdən seçmirdik, qardaş kimi idik.

Drambon Xankəndinin (Stepanakertin) açarı idi. O yüksəkliyi götürəndən sonra ən yaxşı bir strateji nöqtə əldə edirdik. O yüksəklikdən sonra Aşağı Poqosomer və yuxarı Poqosomer kəndləri qalırdı. Biz çox ağır döyüşdən sonra Drambonu aldıq. Aşağı və Yuxarı Poqosomer kəndlərinə, ermənilər qorxub qaçdıqlarına görə, döyüşsüz girdik. Sonra Çıldıran yüksəkliyinə hücum elədik, oranı da aldıq. Qarşımızda Sırxavənd, Dovşanlı sonra isə Xankəndi idi. Yəni o boyda döyüş zonası keçib getmişdik. Ermənilər Xankəndindən qaçmağa başlamışdılar. Sırxavəndə girmişdik ki, əmr gəldi: “geri qayıdın!”...

Bu bir siyasi, hiyləgər oyun idi ki, bu haqda heç nə deyə bilmərəm.

Drambona girməmişdən batalyonlar cəmlənmişdilər – “Mingəçevir”, “Bərdə”, “Goranboy”, “Gəncə” batalyonları da orada idi.

Ermənilər bizim yerimizi hardansa öyrənib atırdılar. Rəhmətlik Faiq şübhələnmişdi ki, kimsə içimizdən ermənilərə koordinatlarımızı verir. Yaxınlaşıb görür ki, biri ratsiya ilə ermənilərlə danışır. Onlara yerimizi bildirir. Hüseyn adlı həmin adam, səhv etmirəmsə, “Bərdə” batalyonundan idi. Faiqin xəbər tutduğunu bilib onu güllələyərək qaçmışdı. Buna görə də həmin gün 7 batalyon Drambonu ala bilmədi. Nəcməddin Sadıqov “Turbaza”da olarkən, maşını saxlatdırıb, tutmuşdular Hüseyni.

Gördük ki, qarşıdan həmin yüksəkliyi ala bilməyəcəyik, bu, mümkün olan şey deyil, buna görə də plan cızıldı ki, düşmənin arxa tərəfinə keçib, oradan hücum etmək lazımdır. “Tərtər” batalyonundan 42 nəfər qalmışdı. Vəzir və Tunc İsmayıl başda olmaqla, çayın içiylə fırlanıb 15-20 kilometr gedəndən sonra, ermənilərin arxa tərəfinə keçə bildik. Onlar inana bilməzdilər ki, biz onların arxasına keçmişdik. Deməyəsən, onlar burada 2 mövqe tutublarmış. Yüksəkliyə çıxanda gördük ki, burada erməni yoxdur. Baxdıq ki, bizdən bi az aşağıdakı yüksəklikdə onların qumbaraatanları, pulemyotları qurulub, ətrafa əllə idarə olunan raket, tank nəzarət edir. Ermənilərin qüvvəsi həddindən çox idi.

Atışma başladı. Özüm şahid oldum. Rəhmətlik Vəzir, İsmayıl, Suliddin erməniləri nə təhər biçirdilərsə... 18 erməni yaraqlısının vurulduğunu saydım. Onlar pərən-pərən düşdülər, kim hara gəldi qaçmağa başladı. Nə tankı apara bildilər, nə digər silah-sursatı. Hamısı qaldı.

Həmin döyüşdə rəhmətlik Vəzirin, İsmayıl və Suliddinin göstərdikləri şücaətə hamımız heyran qaldıq.

Birdən iki tankla üz-üzə gəldik. Vəzir birini vurdu, o aşdı. İkincisini vurmaq istəyəndə, tətiyi üç dəfə çəkdi, silah açılmadı. Biz də bir torpaq təpəsinin arxasında mövqe tutmuşduq. Tank qaçdı, biz də düşdük onun arxasınca. Vəzir, İsmayıl və mən tankın qarşı tərəfinə keçib vurduq.

Vəzirin, İsmayılın, Suliddinin olduğu döyüşlərdən çox danışmaq olar. Onlar həmişə qabaqda gedir, döyüşə birinci atılırdılar.

Bir dəfə Bakıda idim, pul lazım oldu. Yanımda qardaşım yox, bacım yox, kimdən pul istəməliydim. Mənə demişdilər ki, dəmiryol vağzalında bir Türk İsmayıl var, hamıya əl tutur. Vağzala gedib onun iş yerini soruşdum. Göstərdilər, qapını döydüm. Məni görəndə nə təhər sevindisə!.. Qucaqlaşıb öpüşdük. Sevinclə dedi:

– Qardaş, qardaş, xoş gəlmisən! Nə yaxşı gəlmisən! Allaha şükür, sağ-salamat görüşdük!.. Nə isə, çay içəndən, hal-əhval tutandan sonra dedim:

– Ehtiyacım var, pul lazımdı.

– Nə qədər lazımdır verim.

Dedim:

– Çox yox – 5 “Şirvan” lazımdır.

Cibindən dolları çıxarıb uzatdı mənə:

– Götür, qoy cibinə, gərəyin olar. İsmayıl belə oğlandı. Tərtər uşaqlarından kim yanına gedirsə, hamının diləyini yerinə yetirir, qayğısına qalır, işini düzəldir, lazım gələndə, ciblərinə pul qoyur, böyük hörmət-izzət, mehribanlıq göstərir. O çox halal adamdır.



**ELÇİN TAPDIQ OĞLU ABDULLAYEV**

***1973-cü ildə Tərtər şəhərində anadan olub burada orta təhsilini alıb.***

***1991-ci ildə Sovet Ordusu sıralarına çağırılıb. Kiyevdə xidmət edən vaxt Azərbaycanda müharibə başlandığını eşidərək qayıdıb gəlib, könüllü olaraq “Tərtər” Özünümüdafiə Batalyonuna yazılıb.***

***1994-cü ildən “Atəşkəs”ə qədər müharibədə olub.***

***Torpaqlarımızın müdafiəsi uğrunda ağır döyüşlərdə iştirak edib.***

***Üç dəfə yaralanıb.***

***İsmayıl Tuncla cəbhə yoldaşı olub.***

***İkinci qrup Qarabağ müharibəsi əlilidir.***

***Ailəlidir iki övladı var – qızı Cəmilə və oğlu Səbuhi.***

***Hazırda Tərtər şəhərində yaşayır.***

Rəhmətlik Vəzirlə Çardaxlıda olanda ded ki, kim qorxmursa, gedək kəşfiyyata.

Kim qorxursa, çəkilsin geri.

Mən rəhmətlik Vəzirlə çiyin-çiyinə bir yerdə olmuşuq. Sonra Türk İsmayıl bizlə sirdaş oldu, o da bizimlə çiyin-çiyinə vuruşdu.

Bir dəfə Türk İsmayıl, Vəzir, Suliddin və mən – cəmi 25 nəfər kəşfiyyata getdik.

İsmayılın "furaşka"sında türkün bayrağı, ay-ulduz vardı. Ermənilərin yerləşdiyi yer Çardaxlının qəbiristanlığında idi. Biz onları mühasirəyə aldıq.

Dəstənin rabitəçisi mən idim. Dedilər ki, geriyə xəbər ver, kömək gəlsin.

Üstümüzə ermənilərin tankı gəldi. Rəhmətlik Vəzir "qranatomyot"la onu vurdu.

Bizə dedi ki, meşədən çıxmayın, vurularsınız.

Biz erməniləri açıq-aşkar görürdük.

Bir rus vardı ermənilər tərəfdə. Tunc İsmayıl onunla vuruşdu. Mən orada Tunc İsmayılı tanıdım, onun igidliyini gördüm. O, Türkiyədən gəlib Azərbaycanda döyüşürdü. Buna görə də onunla şəxsən mən fəxr edirdim. Sonra İsmayılla rəhmətlik Vəzir birinci dəfə yaralananda, rəhbərlikdən Türk İsmayılı komandir təyin etmişdilər. Biz çox sevindik ki, ayrı adamı yox, İsmayılı müvəqqəti də olsa Vəzirin yerinə qoyublar. Çünki, necə deyərlər, müharibə dünyanın axırıdır, burdan geriyə yolumuz yoxdur. Hamımız məsləhətləşdik ki, Türk İsmayılı özümüzə komandir kimi qəbul edək. O da Vəzirlə birgə döyüşübdür.

İsmayılı istəyən də var idi, istəməyən də. O, görüb-götürmüş oğlan idi. Şəxsən mən də razı oldum. Amma atalar məsəli var: "Meşə çaqqalsız olmur". İsmayıl gördü narazı olanlar var, dedi:

– Məndən ötrü narahat olmayın, ya komandir oldum, ya döyüşçü, fərqi nədir ki? Təki vətən yolunda döyüşüb, düşmənlərə qalib gələk. Bu torpaq mənim də torpağımdır. Türkiyədən gəlmişəm ki, lazım olsa canımı da bu yolda qurban verəm!

İçimizdə bir nəfər narazılıq edirdi. Adını qəsdən özüm çəkmirəm. Hamı tanıyır. İsmayılın özü də onu yaxşı tanıyır.

Ona dedik:

- A bala, hamımız torpaq uğrunda vuruşuruq, komandir isə həmişə qabaqda gedir, ölüm olsa, birinci o öləcək, bu da mülki vəzifə deyil ki, qazancı ola.

Çardaxlı döyüşündə bizimkilər köməyə gəldilər, qoymadıq ermənilər tərpənsin, mühasirədən kənarda qalanlar qaça bildilər, qalanlarını qırdıq.

Rəhmətlik Vəzir də, Türk İsmayıl da orada elə hərəkət edirdilər ki, düşmən tərəfinin bir imdad yeri qalmadı. Üstümüzə gələn tankın birini Vəzir vurdu.  Sən demə, biri də çökəkdə gizlənibmiş. Vəzir onu da vurdu. Ermənilər üç maşını qoyub qaçdılar.

Ermənilər hiss etdilər ki, biz onların arxasına keçmişik, həmin tankı qoyub qaçdılar.

Rəhmətlik Vəzir, Türk İsmayıl, Suliddin yanımızdaydılar. Əvvəlcə kəşfiyyata getdik. Gördüm ki, ermənilər həm “Turbaza”da, həm də “Lager”də yerləşiblər.

Ratsiya ilə batalyona xəbər verdik ki, gəlin.

Sabahısı günü “Turbaza”nın üstündə idik. 20 nəfərlə “Ayı heykəli”nə tərəf getdik. Ora Ağdərənin üstüdür.

Biz burada başladıq erməniləri qırmağa, qabağa da xəbər elədik ki, irəli gəlib atın.

Biz arxaya keçmişdik. O döyüşdə “Lager”i aldıq.

Mən uzanmışdım, ermənilər gördülər hardayıq, fikirləşdim ki, əgər çarəm qalmasa, özüm ölərəm, “ratsiya”nı vermərəm, uzağı onu partladaram, özümü də öldürərəm.

Rusiyada əsgərlikdə olarkən 1 komandir vardı, mənə dedi ki, nə istəyirsən eləyim, amma sən getmə. Çünki yaxşı rabitəçisən. Mən də dedim ki, yox, gedirəm, çünki Azərbaycan mənim namusum, qeyrətimdir.

Döyüşdə başımdan, ayağımdan yaralandım. Vəzir dedi ki, döyüşdən çıx, get yaralarını sarısınlar. Mən getmədim. Çünki ağır döyüşüydü. Adam dostlarını darda qoyub gedə bilmirdi. Yaralandım və bir ay yatdım. Sonra qayıtmaq istədim, Vəzirlə, İsmayılla çox döyüşlərimiz olub, “Turbaza”da, Çardaxlıda.

Bir dəfə biz Türk İsmayılla getdik Umudlu kəndinə kəşfiyyata, baxdıq ki, ermənilər Kəlbəcər yolundadır, Umudlu isə boşdur. Biz orada olanda Umudlunun öz adamları gəlib çıxdılar. Rəhmətlik Vəzirlə Türk İsmayıl həmişə döyüşçüləri ruhlandırırdılar.

Bəzən İsmayılla bir qabda çörək yeyirdik. Bir gün Vəzir idi, İsmayıl idi, dedim ki, bir həftədir evə getmirəm, icazə verirsinizmi evə dəyim, gəlim?

Onlar icazə verdilər. Bazar günü idi.

Getdim evə, çayımı içdim, çörəyimi yedim, darıxdım, qayıtdım geri. Rəhmətlik Vəzirlə İsmayıl məni görəndə təəccübləndilər. Vəzir dedi:

– Səni indicə yola salmadıq, nə tez qayıtdın?

Dedim:

– Sizsiz darıxdım. Biz belə dost idik.

İndi İsmayılla bağlı xatirələr yadıma düşdükcə, ağır döyüşlər gözümün qabağına gəlir. Bir sözlə, o, əvəzedilməz döyüşçü idi. Onun kimi oğulların hesabına Tərtərin bir qarış torpağı da düşmənlərə verilmədi.



**ETİBAR ALLAHVERDİ OĞLU ABDULLAYEV**

***1971- ci il dekabr ayının 20-də Tərtər şəhərində anadan olub.***

***Şəhər 2 saylı orta məktəbinin 8 –ci sinfini və Ağdam Xan Şuşinski adına Muğam məktəbini bitirib.***

***1989- cu ildən 1991- ci ilədək Prişib qəsəbəsində hərbi xidmətdə olub.***

***1991- ci ilin oktyabr ayında könüllü olaraq "Tərtər" Özünümüdafiə Batalyonuna yazılıb.***

***1992- ci il avqust ayının 6- da yaralandıqdan sonra döyüşlərdə iştirak etməyib.***

***Türk İsmayılın silahdaşı olub.***

***Ailəlidir, üç qızı var – Nigar, Şəlalə və Gülnar.***

***Hazırda Tərtər şəhərində yaşayır.***

O vaxt başımız qarışıq idi. Bir də eşiddim ki, batalyonumuza İsmayıl adlı bir türk gəlib. Biz İsmayılla döyüş bölgəsində tanış olduq. O, cəsur, qorxmaz bir türk oğlu, əsl hərbçi idi.

Biz könüllü getmişdik. Türk İsmayıldan çox şey öyrəndik. O, hərbçi kimi bizi necə lazımdır öyrədirdi – avtomatdan istifadə etməyi də, qumbara atmağı da. Onun bir

məsləhəti də yadımdadır. “Depazit” deyilən qumbara növü vardı, onu atmağı bizə öyrədirdi. Həmin qumbaranın qəlpələri uzaq məsafəyə dağılır. İsmayıl deyirdi:

– Həmişə “Depazit” qumbaralarını atanda fit çalın ki, özümüzünkülər aralansın, yoxsa onları da qəlpələr tutar.

Tərtərin qeyrətli oğlanları olan Vəzir Orucov, Elman Hüseynov, Suliddin Yusibov, Eldəniz müəllim və başqa döyüşən oğlanlar bilirdilər ki, Türk İsmayıl necə ürəkli, döyüşkən, cəsur bir oğlandır.

Eldəniz müəllim topçu komandirim olub. O, İsmayıllı rayonundan nə zülmlə topların iynələtini tapıb gətirirdi. Erməni də bizə həmin növ toplardan atəş açırdı. Eldəniz müəllim də deyirdi ki, onlara həmin toplarla cavab vermək lazımdır. Belə oğlanlar İsmayılın qədrini daha yaxşı bilirdilər.

Vəzir Orucov Rusiyada yaşayırdı. Müharibəni eşidib, oradakı bütün imkanlarından imtina edərək gəlmişdi. Mən yaralananda, topçu Elxan Alıxanovla böyür-böyürə idik. Ona böyük təşəkkürümü bildirirəm. Çingizlə məni meyit vəziyyətində Suliddingil çıxarıb.

Suliddin sonra danışırdı ki, əməlli-başlı qırğın gedirdi. Mövqelərimizi tutmuşduq ki, vəziyyətdən çıxaq, irəli getməliyiyik axı! Mənim yanımda Tərtərin Axundov küçəsindən Saleh adlı bir oğlan vardı, pis vəziyyətdə idi, su istəyirdi, qorxur, həyəcandan bilmirdi neyləsin. Dedim:

– Su yoxdur.

Yalvardı ki, barı su qabının qapağını ver mənə. Qapağı verdim. Baxdım ki, onu dodağına sürtür. Onda eşitdim kimsə çağırır:

– Kömək edin!!!

Baxdım Çingizdi. İbrahimov Çingiz Qiyas oğlu, Səhlabad kəndindən idi. Bir qardaşı da vardı, Bayram müəllim. Nə isə... Saleh qışqırırdı:

– Ayə, çıxmayın, bizi öldürəcəklər!

İri qaratikan kollarının arasıyla necə şığıyırdıqsa kollar bizə dəyməyə macal tapmırdı. Çatdım ki, Çingizin yanında bir meyit var, yoxladım, ürəyi hələ işləyir, Etibara oxşatdım. Bir də gördüm ki, Fikrət əmioğlu birini qılçasından tutub sürüyür. Dedim:

– Ayə, niyə heylə eləyirsən?

Dedi:

– Ölüb.

Bu, Cəmillidən olan Şakir idi, kürəyini qəlpə tamam dağıtmışdı, nə isə, başımızı soxmağa yer axtarırdıq, görən kimi ermənilər vururdular. Çingiz çıxdı yola, bir maşını döndərdi dağın arasına, sürücü gəlmirdi. Çingiz avtomatı dirədi kəlləsinə ki, meyitləti götürmək lazımdır, yoxsa atacağam səni. Birinci Şakirin meyitini, sonra isə Etibarı qoyduq, ürəyi hələ də işləyirdi...

Bir neçə ildən sonra gördüm ki, xəstəxananın yanında mənə tanış olan bir adam gəlir. Baxdım ki, Etibardır. Mən elə bilirdim ki, o ölüb. Görüşdük. Soruşdum:

– Hardan tanışıq?

Dedi:

– Müharibədən. Filan vaxtı mən yaralanmışam.

Soruşdum:

– Başından, eləmi?

– Hə.

– Səni yaralı vəziyyətdə kim çıxarıb?

– Nazim.

Dedim:

– O vaxt gördün ki, səni Nazim götürüb.

– Yox.

– Bəs nə bilirsən ki, səni Nazim çıxarıb?

Cavab verdi ki, özü dedi.

Dedim:

– Ondan bir də soruşarsan. Əgər yenə desə ki, mən çıxartmışam, deyərsən ki, bəs onda Suliddin harda idi. Etibarın xilaskarı Çingizdir. Çingiz olmasaydı, onu döyüş meydanından çıxara bilməyəcəkdik, heç görməyəcəkdik də, orda erməni meyitləri də var idi, heç kəs də axtarmayacaqdı...

Məqsədimiz Levonarxdan üzüyuxarı Akopkamaridə cəbhəni yarıb meşəyə girmək idi. Plan o idi ki, texnika ilə piyada qüvvələrimiz birləşsin, partizanlıq yolu ilə erməniləri məhv edək. Texnika gələndə, erməni duyuq düşdü, atmağa başladılar.

Mənim yaralandığımı çoxu görmüşdü, amma heç kəs yaxınlaşa bilmirdi. Çingiz öz həyatına risk eləmişdi. Saleh, Fikrət, bir də Suliddin orda olmuşdular.

Mən sonra İsmayılı görmədim. Amma haqqında çox tariflər eşitdim.



**ƏLLƏDİN HİLAL OĞLU TAĞIYEV**

***1963- cü ilin iyul ayının 7- də Tərtər rayonunun Əskipara kəndində anadan olub. Həmin kənndə məktəbi bitirib. Sonra Bakıda təhsil alıb.***

***1982- ci ildə ordu sıralarına çağırılıb, Murmansk şəhərində xidmıt edib. 1984- cü ildə tərxis olunub.***

***1992- ci ildə Qarabağ uğrunda gedən döyüşlərdə iştirak etmək üçün könüllü olaraq "Tərtər" Özünümüdafiə Batalyonuna yazılıb.***

***İsmayıl Tuncun döyüş yoldaşı olub, bir sıra ağır vuruşmalarda onunla çiyin-çiyinə döyüşüb.***

***1994- cü ilin əvvəllərində tərxis olunub.***

***Ailəlidir, 3 övladı var.***

***Hazırda Tərtər rayonunun Əskipara kəndində yaşayır.***

1992-ci ilin ortalarında könüllü olaraq cəbhəyə getmişəm. Qardaşım Firudin cəbhədə idi. O biri qardaşım Tağıyev Tağı Bakıda yaşayırdı, imkanlı idi, dəmir yolunda rəis işləyirdi. Hər şeyi atıb könüllü müharibəyə gəlmişdi. Gəldi "Tərtər" batalyonunda 4-cü "rota"nın komandiri oldu.

İki qardaşım döyüşə getdiyinə görə fikirləşdim ki, mən niyə kənarda qalmalıyam? Ərizə yazıb mən də könüllü getdim döyüşə. O vaxt 29 yaşım vardı. Malakanlar kəndində İsmayılla tanış olduq. Əvvəlcədən demişdilər ki, Türkiyədən bizimlə bərabər vuruşmağa iki oğlan gəlib. Biri İsmayıl idi. Onun geyimi bizimkindən seçilirdi. "Desant"larınkı kimi xallı-xallı forma idi, böyük ulduzlu "bereti" də vardı. Elə geyim və papaq bizim heç birimizdə yox idi. Döyüşə getməmişdən əvvəl İsmayıl  Suliddinlə mənim şəklimi fotoaparatıyla çəkdi. Sonralar Suliddin şəklin birini mənə verib dedi ki, İsmayıl sənə göndərib. Həmin şəkil indi də durur.

Mən döyüşlərdə ən çox Suliddin Yusubovla bir yerdə olurdum. O da çox qorxmaz və igid döyüşçü idi. Demək olar ki, bütün əməliyyatlarda iştirak edirdi. Suliddinlə

əsgərlikdə çox yaxın münasibətdə olmuşuq, onunla dost idik. Birinci hücumumuz Lüləsaz istiqamətində "Alma bağı"nda oldu. Əvvəlcədən komandir heyəti – Vəzir, Ədalət, Elman müəllim, İsmayıl, mənim qardaşım Tağı, bir yerdə oturub plan cızdılar ki, hansı istiqamətdən bu kəndi götürmək olar? Qərara gələndən sonra əmr olundu ki, hücuma keçin. Bu, mənim ilk döyüşüm idi. Ermənilər bizim hücuma keçdiyimizi görmüşdülər. Bizi güclü atəşə tutmuşdular. Başımızı qaldıra bilmirdik.

Türk İsmayılın nəzərindən heç nə yayınmırdı. Elə bil onun görmə qabiliyyəti hamıdan güclü idi. O, peşəkar hərbçi idi. Mən bilmirdim ki, o belə igid döyüşçüdür. Mənə dedi:

– Həmişə fikir ver, gör hardan atırlar. İstiqaməti elə tut ki, səni vura bilməsinlər. Əgər bunu bacarmasan, güllə sənə tez dəyə bilər.

İsmayıl güllə səslərinin içindən snayperin səsini tanımışdı və onun haradan atıldığını görüb, müəyyən edə bilmişdi. O, uzaqdakı ağacı göstərib dedi:

– Bax, o ağacın arxasından səni vurmaq istəyirlər. Özünü qoru.

O, sağa, sola cəld hərəkətlər edərək güllədən yayınmağı bacarırdı. Bizə:

– "Ehtiyatlı olun!" – deyib, göstərdiyi ağaca tərəf peşəkar hərəkətlərlə irəliləməyə başladı. Heç yarım saat keçməmişdi ki, bir də gördük İsmayıl qayıdıb gəldi.

Biz ona Türk İsmayıl da deyirdik, İsmayıl Tunc da. İsmayılın geyimi uzaqdan nəzəri cəlb edirdi. O, çox qoçaq oğlan idi.

Hər bir mövqeyə hücum etməzdən qabaq bu biri mövqeyi tutub, hücum planı üç-beş gün gözləyirdik, komandir heyəti hücum planı hazırlayırdı, sonra döyüşə girirdik. Çox vaxt üzbəüz deyil, erməninin arxasına keçib döyüşürdük. Bunun üçün hər dəfədə 10-15 kilometr məsafə qət edirdik, sonra qəfildən hücuma keçib onları qırırdıq. Necə ki, qəbiristanlıqda xeyli erməni öldürdük.

Gəldik Sərsəngin üstünə, bir müddət orada qaldıq.

Allah bütün ölənlərə rəhmət eləsin. Rəhmətlik Vəzirin özünün kəşfiyyat qrupu vardı. İsmayıl Tuncla Suliddin Yusibov o qrupun daimi üzvlərindən idilər.

Bunların hər üçü də kəşfiyyat işini gözəl bilirdi.

Kəşfiyyata getmək könüllü idi. Vəzir deyirdi:

– Kim istəmirsə, getməsin. Heç kəsi məcbur etmirik. Çünki kəşfiyyatda hər şey ola bilər.

Mən də kəşfiyyat qrupuna yazılmışdım. Suliddin, İlham, Əli vardı bizim kənddən, deyəsən, familiyası Əliyev idi, təəssuflər olsun ki, çoxunun adı yadımda qalmayıb, ayrıldıq, Elman müəllimin tapşırığıyla kəşfiyyata getdik ki, hücumdan əvvəl vəziyyəti öyrənək. Dağ-dərəylə, "Turbaza"ya tərəf getməyə başladıq. Hər tərəf böyürtkən kolluğu idi, heç nə görünmürdü. Bizim uşaqlardan kimimsə əlindən qəfil güllə açıldı. Biz elə yerdəydik ki, yolla aramız cəmi iki metr olmazdı. Ermənilər də bu yolla gedirdilər. Güllə səsini eşidən kimi onlar geri döndülər. Ermənının biri İsmayıla tərəf qışqırdı:

– Hayes, Turkes?

İsmayılla Vəzir qabaqda idilər.

İsmayıl dedi:

– Türk İsmayıl.

Ermənilər çaş-baş qaldılar. Dörd erməni yaraqlısını o dəqiqə güllələdilər.

Ermənilər artıq duyuq duşdülər. Vuruşma başlandı. 12 nəfərlə "Turbaza" deyilən yerə hücuma keçdik. Burada onlar böyük çadır qurmuşdular, bazaları vardı. Biz həmin ərazini aldıq. Çadırın içərisinə girəndə gördük ki, burada mərmi qutuları, hər cür ərzaq – uzun-uzun qara çörəklər, 20 qutu süd ("Moloko"), siqaretlər, yağ, daha nə bilim nələr... Hamısının da üstündə fars dilində yazılar vardı.

Birinci mən yağı yaxdım çörəyin üstünə. Rəhmətlik Ədalət dedi:

– Birdən zəhərli olar, zəhərlənərsən.

Dedim:

– Erməni canını götürüb qaçırdı. Zəhər tökməyə vaxt harada idi?

Birinci mən yedim, sonra uşaqlar.

Vəzir vəziyyət haqqında arxaya – Elman müəllimgillə xəbər verdi. "Tərtər" batalyonu gəldi. Hərbi sursatı yerbəyer elədilər.

Drambonla "Turbaza" arasında bir yüksəklik var. Ora hücum edəndə ermənilərin güclü müqavimətinə rast gəldik. Rəhmətlik Ədalət Paşayev həmin döyüşdə yaralandı. Onun yarası o qədər ağır idi ki!.. Mərmi düz gəlib onların ortasına düşmüşdü. Allah rəhmət eləsin! Çox qəhrəman oğlan idi. Xəstəxanaya çatdıranacan rəhmətə getdi.

Ümumuiyyətlə, erməni quldurları ilə apardığımız döyüşlər haqqında çox şey danışmaq olar. Bizim hər anımız, hər dəqiqəmiz ölüm idi.

Türk İsmayıl kimi oğulların, Vəzir Orucov, Elman Hüseynov, kimi qəhrəmanların hesabına çox döyüşçümüz salamat qaldı və indi də yaşayırlar.

Xahiş edirəm, İsmayıl qardaşıma mənim salamlarımı yetirin.



**ŞÖHLƏT MÖVSÜM OĞLU ZEYNALOV**

***1958-ci il dekabrın 15-də Tərtər rayonunun Azadqaraqoyunlu kəndində anadan olub. Həmin kənd məktəbində orta təhsil alıb. Gəncə də Politexnik Texnikumunu bitirib.***

***1977-ci ildən 1979-cu ilə qədər Sovet Ordusunun tərkibində Monqolustanda xidmət edib.***

***1992-ci il fevralın əvvəllərində "Tərtər" Özünümüdafiə Batalyonuna könüllü olaraq yazılıb. 1993-cü ilin mart ayının 13-də ağır yaralanıb, döyüşdən məcburən uzaqlaşıb.***

***İkinci qrup Qarabağ müharibəsi əlilidir.***

***Ailəlidir, 3 övladı var – Vəfa, Nicat və Nurlan.***

***Hazırda Tərtər rayonunun Azadqaraqoyunlu kəndində yaşayır.***

Erməni daşnaqları bizim milləti öz yurd-yuvalarından qovub-çıxarandan sonra, hər bir vicdanlı azərbaycanlı kimi, mən də rahat ola bilmirdim. Ermənilər çox nankor, çox xain bir millətdir.

Eşitdim ki, onlar bizim rayona da hücum etmək istəyirlər, könüllü olaraq 1992-ci ilin fevral ayında "Tərtər" batalyonuna qəbul olundum.

Birinci döyüşümüz Marquşevan və Marağadan başladı. Bir də Əskipara kəndinin üstündə yerləşən meşədə idik. Birinci dəfə hücumumuz alınmadı. Sonrakı hücumlarımızda 17 Mart 1992-ci ildə erməniləri Marquşevandan qovduq. Xocalıda bizimkiləri qırmışdılar. O vaxt Elman Hüseynov, Boris Zöhrabov bizim batalyonda rəhbər idilər. Ermənilər bizə hücuma keçdilər. Biz də istər-istəməz döyüşə qoşulduq və irəli getdik. İrəlidə isə Levonarx, Həsənqaya vardı.

Levonarxda olanda İsmayıl gəldi. Axşam hücuma keçdik. Yaralananlarımız oldu, ermənilərdən girov da götürdük. Sonra İsmayıl, Vəzir, "Qoçu", Suliddin, Mətləb Ərəbov, Şakir Bağırov birlikdə kəşfiyyata getdilər. Dedilər gözləyin, sizə xəbər verəcəyik. Bir-iki gün əlaqə olmadı, sonra xəbər gəldi ki, heç bir hərəkət etməyək.

Əməliyyatdan qayıdıb gələndə İsmayıl bir az uzaqda olan döyüşçüləri Vəzirə göstərib deyir:

– Deyəsən özümüzünkülərdir.

Vəzir isə:

– Yox, ermənilərdir, deyir.

Burada döyüş başlayır. Kəşfiyyata gedənlər erməniləri qırıb-batırırlar. Bizə xəbər çatanda köməyə getmək istədik, lakin dedilər ki, sakit oturun yerinizdə, özümüz bacarırıq.

Sonra isə çağırdılar. Biz də gedib, alınan mövqelərdə yer tutduq. Sonra ordan Sərsəng gölü tərəfə hücum etdik. "Platina"nı bir dəfə aldıq, sonra verdik. "Goranboy" batalyonunda "Musto" vardı (adı Mustafa idi, "Musto" deyirdilər) – komandir. Dedilər ki, onun dəstəsi gəlib. Biz də sevindik ki, nə yaxşı "Musto"gil gəlib, o, "BMP-2" sürürdü. Aldığımız mövqeləri onlara verib, gəldik. Yağışlı hava idi. Əyin-başımız islanmışdı, çox yorulmuşduq. Gəldik ki, dincələk, lakin tez də qayıtdıq. "Rus bulağı" deyilən səmtdə dağın bu üzüylə biz, o biri üzüylə ermənilər gəlmişdilər. Şamlıq vardı. Ordan Vəzirin binokluyla baxırdıq. Onda da Vəzirin ikinci dəfə yaralanıb döyüşə qayıdan vaxtıydı. Gördük ki, ermənilər piyada qüvvəsini "Turbaza"ya yeridir, ordan hücuma hazırlaşırlar.

Bu vaxt Pənah Vəzirə zəng etdi:

– Özünüzə gəlib, geri çəkilə bilərsinizsə, çalışın çəkilin, ermənilər arxa tərəfinizi tutub.

Demə, "Goranboy" batalyonu arxanı boşaldıb, ermənilər isə gəlib bizi mühasirəyə alıblar. Deyə bilmərəm ki, "Goranboy" batalyonu bu mövqeyi döyüşüb vermişdi. Ora "Platina" idi. Vəzir bu xəbəri eşidəndə, "Goranboy"dan Əbülfət adlı bir oğlan vardı, o, ermənilər olan tərəfə göstərib dedi:

– Bizimkilərdi.

Vəzir dedi:

– Ə, nə bizimkilər? Görmürsən ermənilərdi?

Sonra "PK"-nı götürdü, dizini yerə qoyub, erməniləri qırmağa başladı. Belə döyüşə-döyüşə bir təhər özümüzə yol açıb, mühasirədən çıxa bildik. İlqar Zeynalov vardı, o da

indi işıq idarəsində işləyir. Bizimlə çox uşaq vardı: Məcid kişnin oğlu (orda yaralandı), Ağayev İnqilab.

Həyatdı da, yaşayırıq, amma gərək keçmiş günləri unutmayasan.

Döyüşdə gözümlə gördüyüm erməniləri vurmuşam. Yaxşı məna da bir söz var: "Əsl döyüşçü qarətçi olmalıdır". Bu sözlər düşmənin silah-sursatı barədədir.

Ermənilərdən bizdə nə silah qalıb, götürüb təhvil vermişik.

Sağlamlığımızı itirsək də, yenə torpağımız uğrunda döyüşə hazırıq.

Mən bilirəm ki, bu sözlər Türk İsmayıl kimi oğlanların da ürəyindəndir



***Qasımov Etibar Vahid oğlu («Seyid»)***

***1969-cu il noyabrayının 24-də Tərtər rayonunun Qaradağlı kəndində(Qaradağlı kənd İƏV)anadan olub***

***Şuşa şəhər 2 saylı Riyaziyyat Təmaüllü internat məktəbini bitirib.***

***1989-cu ildən 1991-ci ilədəkSovet Ordusu sıralarında Orenburq şəhərində hərbi xidmətdə olub***

***1992-ci ilin mart ayının 22-də könüllü olaraq öz kəndlərində yradılmış "Qaradağlı vzvod"una yazılıb.***

***"Torpaq təpə"dən tutmuş Vəngə qədər Ağdərə döyüşlərinin hamısında iştirak edib.***

***İki dəfə yaralanıb.***

***1993-cü ilin avqust ayında ordudan təxris olunub.***

***İsmayıl Tuncun döyüş yoldaşı olub.***

***Ailəlidir.***

***Tərtər şəhərində yaşayır.***

1969-cu il noyabr ayının 24-də Tərtər rayonunun qaradağlı kəndində (Qaradağlı kənd İƏV) anadan olub.

Şuşa şəhər 2saylı riyaziyyat təmayüllü internat məktəbini bitirib.

1989-cu ildən 1991-ci ildədək Sovet Ordusu sıralarında Orenburq şəhərində hərbi xidmətdə olub.

1992-ci il mart ayının 22-də könüllü olaraq öz kəndlərində yaradılmış «Qaradağlı» «vzvod»una yazılıb.

«Torpaq təpə»dən tutmuş Vəngə qədər Ağdərə döyüşlərinin hamısında iştirak edib.

İki dəfə yaralanıb.

1993-cü il avqust ayında ordudan tərxis olunub.

İsmayıl Tuncun döyüş yoldaşı olub.

Ailəlidir.

Tərtər şəhərində yaşayır.

1992-ci il idi, ordudan təzə gəlmişdim, mart ayının 22-də. Gödüm ki, könüllü olaraq qeyrətli oğlanlar bizim Qapanlı kəndinin müdafiəsinə gedirlər, mən də silah götürüb, qoşuldum o qeyrətli oğullara, sonra Ağdərəni azad olması, ermənilərin oərazilərdən təmizlənməsində bütün varlığımla iştirak etmişəm.

May ayının 3-də könüllüləri ləğv elədilər. Sonra gördülər ki, mümkün deyil, yenidən yığmağa başladılar.
Biz bir-neçə nəfər—Vaqif, Pənah, o biri Vaqif Rəhimov, Rafiq,Fəqan… getdik Malakanlara, orda 15 nəfərdən ibarət qurup yığdıq durduq «post»da, çinarın yanında.
3-cü, 4-cü ev oldu ştabımız. Türk İsmayıl biz orda olanda gəldi.
5-5, 10-10 gəlib batalyona yazıldılar. Dedilər ki, İsmayıl adında bir türk oğlan da gəlib. Gördüm bu danışığından azərbaycanlıya oxşamır.
Soruşdum:
--Sən kimsən, hardansan?
Bu da mənə dedi ki, Türkiyədən gəlmişəm. Dedim ki, Türkiyədən gəlib Azərbaycanın torpaqları uğrunda döyüşdüyün üçün çox sağ ol, minnətdarıq sənə!
Tanış olduğumuz gündən də başladıq yoldaşlıq etməyə. Döyüşən, qeyrətli oğlan idi. Yoldaşlığımız tutdu.
Pənah müəllimlə Elman müəllim məsləhət gördülər ki, biz kəşfiyyat dəstəsi yaratmalıyıq. Malakanlardan bəri irəmə vardı, axşamlar bizə «gecə görmə» aparatı ilə baxırdılar. Biz məcbur olduq ki, kəşfiyyat qrupu yaradaq ermənilərin qüvvələrinin harada yerləşdiyini öyrənək. «Tərtər» Batalyonu üçün kəşfiyyat dəstəsi yaratdıq, 12 nəfərdən ibarət. İsmayılda bizimlə gedəsi oldu. Rəhmətlik Vəzir idi, mən idim, İsmayıl idi, Əhəd Səfiyar oğlu Cabbarov vardı. Qaradağlı kəndindən o idi («Qoçu» iki gün sonra gəldi) və digər uşualar idi. Birinci gün getdik Lüləsazın alt tərəfinə. Komandirimiz vəzir idi: Kəşfiyyata könüllü kim istəyirdisə o gedirdi.
Vəzirdə məcbur eləmək yox idi. Düşmən qüvvələrini öyrəndik, şəhərə yaxın qayıtdıq, saat 6 idi. Saat 12 olardı bizə qüvvə gəldi. Onun səhərisi günü axşam kəşfiyyata gedəndə Süliddin də bizlə getdi. 6nəfərdən başqa 9 nəfər də bizə qoşuldu. Salman Mustafayev idi, Əyyub, Qaradağlıdan, o da bizimlə getdi. 15nəfər olduq, getdik Lüləsaza, ermənənin arxa tərəfinə keçdik, məlumat verdik ki, meşədəydik, biz yüksəklikdə arxa tərəfdəydik. İlk döüşümüz də bizim orda oldu. Biz kordinatları deyirdik, onlar da vururdular.
Sonra getdik çıxdıq Çardaxlının arxa tərəfinə. Orda qəbrsanlıq var idi. O qəbristanlıqda hardasa 100-ə yaxın erməni qırdıq.
Emil Emilbəyli bizim döyüşümüzü kasetə çəkirdi. Həmin lentdə Vəzirin rabitə ilə necə kordinat verməyi də var.
15 nəfər yenə keçdik ermənilərin arxa tərəfinə. Dağıstan da var idi, Əksiparadan. Erməni yaralanmışlı, çöndərdi ki, bunun başını kəsəcəyəm, çöndərəndə erməni avtomatla onun alnından atdı.
Sonra qumbara partladı, Nazim vardı, «Qələbə»dən erməniylə əlbəyaxa olmuşdu. Ermənini vurdum Nizamini kənara çıxardım.
Bizim qonşu irəlidən gəlirdi, biz də arxadan başladıq ermənini güllələməyə. Rabitəylə xəbər vermişdik ki, siz altdan gəlin, biz yuxarıdan dənləyəcəyik. Düz ermənenin başının üstündəydik.
Səhər açılanda baxdıq ki, ermənilər kabab çəkirlər. Biz hücuma keçdik. Ermənenin «BMP»-si qaldı, içi dolu mərmiylə digər maşınları qaldı. 110 nəfərə qədər erməni meyidi qaldı ortada.
İsmayıl da bizimlə idi. 110 ermənenin qırılmağında o da qəhrəmanlıq göstərirdi. Orda vuruşan oğlanların hər biri qəhrəman idi, o cümlədən İsmayıl o vaxt bizə söz verdilər ki, sizə orden, medal verəcəyik, ermənini belə qırmağınıza görə. Nəcmsəddin Sadıqovun özü gəlib çıxmışdı. Ora, Şahin Tağıyev gəlmişdi. Ermənini belə məhv etməyimiz

«Tərtər» Batalyonu üçün şərt gətirmişdi. Ümumiyyətlə, «Tərtər» Batalyonu çox qəhərəmanlıqlar göstərmişdi.
Sonra biz gecə qaldıq Çardaqlıda. Səhər açılmamış düşdük meşəyə, düz «Ayı heykəli»nin yanına kimi gəldik. Sonra Sərsəngə kimi getdik.
Məlahət vardı, o kürəyindən yaralanmışdı, mərmi qəlpəsindən.
Dostluqda çox gözəl insan idi İsmayıl.  Bir tikə çörəyini də yoldaşdan ayrı yeməzdi.həmişə dərd-sərimizi bölüşərdi. Deyirdi ki, kaş Qarabağı azad edək, mən də Türkiyədən doğmalarımı götürüm glim, görsünlər ki, harada vuruşmuşam.
İsmayıl çox iradəli, qorxmaz oğlan idi. Bir metr bir-birimizdən kənar gəzmirdik, 15-imiz də bir gəzirdik. Bir dəfə Pıoner dühərgəsinə kəşfiyyata getmişdik, ermənilər bizi mühasirəyə saldılar birlikdə yardıq çıxdıq.  Bir dəfə də «Ayı heykəli»nin yanına getmişdik. Ermənilər orda «pozisiya» qurmuşdular. Vəzir dedi ki, siz kolun içində gözləyin, bir qrup da o tərəfdə gözləsin. Yolun üst tərəfində. Mənim xəbərim olmadan atmayın. Ermənінin «BMP»-si gəldi, dalınca maşınlar gələndə, Vəzir «UAZ»-ı maşınını atdı, sonra «UAZ»-ı vurdu. Orda İsmayılla Vəzir bir erməni tutub gətirdilər.
Getdik Drambona burda batalyonlar cəmləşdi. İsmayılla Vəzir rayona gəlmişdilər. Onlar qərargaha çağırmışdılar. Həqiqətən İsmayıl döyüşən adam idi.
Mən orda qalmışdım. İlham idi, Əyyub idi,  Hafiz idi, Cəmillidən, bir də Goranboylu balaca bir oğlan var idi, o da orda idi, «Qoçu»-- Möhlət. (o sonraVəzirlə gəldi).
Biz də 4 nəfər idik. Erməni başladı topla, «minamyot»la, atəşə «Goranboy» Batalyonu qaçdı. Biz 4 nəfr qaldıq. Drambonun üst tərəfində. Oranı saxladıq. Video çəkən gəlmişdi. Vəzir rayondan bizə rabitə ilə dedi ki, çıxmayın, gəlirik. Orda çəkiliş getdi, Emin Emilbəyli çəkdi. 7 nəfərin hər biri danışıb. Vəzir gəlib çıxdı və qaçan batalyonlara geri qaytardı. Drambona girəndə erməni snayperi mənim papağımı vurub salmışdı yerə. Bu, kasetdə qalıb. Sonra Drambonu aldıq orda 2 yerə bölündük yarımız kəndin qəbiristanlıq tərəfindən, yarımız isə kəndin arxa tərəfindən girdik. Ermənінin «BMP»-si var idi, imkan vermirdi irəliləyək. İlha, Əyyub, mən 5 nəfər idik, biz səhərədək gözlədik. 1992-ci il avqust ayının 29-u idi. Vəzir ermənilərin «BMP»-sini vurdu. Ordakı qəbiristanlıqda mən səhzərə yaxın ağır yaralandım7 qumbaraatanın mərmisinin qəlpələri qılçamı, qolumu yaraladı7
Biz həmişə qorxmadan ermənінin üstünə yeriyirdik7 mən yaralanandan sonra Vaqif müəllim yaralandı, İsmayıl Çardaqlıda gedən döyüşdə qəlpədən yaralanmışdı, Ədalət Paşayev orda yaralandı7 o da qorxmaz oğlan idi7
Vaqif Rəhimov özünün şəxsi «02» markalı «Jiquli»silə Marquşevandakı yaralıların hamısını daşıyıb çıxardırdı. Heç bir minadan-zaddan qorxmurdu7 Ədalət Paşayev Vəzir Orucov, Elman Hüseynov qorxmaz oğullar idilər. Ölən günə kimi onlarla hər metri bərabər gedirdik.  Elman müəllimin bir qeydiyyat kitabı vardı, döyüşlərdə kim yaxşı iştirak edirdisə, orda qeyd edirdi.
1992-ci ildən on dörd il keçir, Hansı uşağın adını çəkməzdimsə üzürlü hesab etsin.
1993-cü ildə yaralandım, 1994-cü ildə «kantuziya» aldım, qospitalda yatdım 3 ay, təzədən qayıtdım orduya.
Müharibədən sonra İsmayıl məni axtarıb, Tərtərə gəlibmiş. Deyiblər ki, qosputaldadır. Heyif ki, görüşə bilməmişik!

***İsmayıl Tuncla belə qənaətə gəldik ki, Tərtər bölgəsində Milli ordunun əsgəri kimi həlak olmuş ilk şəhid Rafiq Əli oğlu Nuriyev haqqında məlumat üçün də bu kitabda yer ayıraq.***

***Bu məqsədlə Rafiqin atası Əli kişiylə görüşdük, qardaşı və digər yaxınlarıyla söhbət etdik.***

***Müəllif***



**RAFİQ ƏLİ OĞLU NURİYEV**

1969- cu il may ayının 26-da Tərtər şəhərində anadan olub.

1986- cı ildə şəhər 6 saylı orta məktəbi bitirib. 1987-1989- cu illərdə Əfqanıstanda hərbi xidmətdə olub. Xidmət etdiyi dövürdə vətəni Azərbaycanın və Azərbaycan oğullarının adına həmişə şərəf gətirib.

Tərxis olunduqdan sonra Bakı şəhərində Səttarxan adına zavodda işləyib. 1991- ci ilin noyabr ayında könüllü olaraq Milli Ordu sıralarına yazılıb və müstəqil Azərbaycan Respublikasının ilk hərbi hissələrindən biri olan "1-ci Batalyon" da kəşfiyyatçı kimi Şuşanın və onun Nəbilər, Kosalar, Cəmilli, Kərkicahan, Malıbəyli kəndlərinin müdafiəsi uğrunda erməni təcavüzkarlarına qarşı vuruşub.

Atası Əli kişi danışır ki, 1992- ci il yanvarın 14-15- i qayıdıb Tərtərə gəldi. Mənə və anasına dedi ki, daha döyüşə getmiyəcəm, Bakıya iş yerinə gedirəm.

Deməyəsən, bunu bizi nigarançılıqdan qurtarmaq üçün deyirmiş.

Bir neçə gündən sonra xəbər gəldi ki, Rafiq yenə Şuşaya döyüşə yollanıb və... Yanvarın 26- da uğursuz "Daşaltı əməliyyatı"nda şəhid olub.

Yenə də sağolsunlar dostları Niyazini, Nazimi... Onlar olmasaydı, Rafiqin meyiti elə orada qalasıymış. Dörd yoldaş öz həyatlarını təhlükə qarşısında qoyaraq, birlikdə köməkləşib Rafiqin meyitini odeyalın arasına bükərək döyüş bölgəsindən çıxarıblar.

Rafiq 1992- ci il yanvar ayının 29-da Tərtər rayonunun Qarağacı kənd qəbiristanlığında dəfn olundu.

Subay idi.

Cəmi 22 il yaşamış. Bu gəncin ömür yolu bütün qeyrətli vətən oğullarına örnək ola bilər.

Oxuduğu şəhər 6 saylı orta məktəbə onun adı verilib.

İşlədiyi zavodda şəhidlərə ucaldılan xatirə abidəsinin açılışı onun adı ilə bağlı olub.

Valideynləri Tərtər şəhərində yaşayırlar.

## İSTİFADƏ OLUNAN MƏNBƏLƏR:


1. Əliyev Cəlal, Budaqov Budaq. Türklər, azərbaycanlılar, ermənilər... Tarixi həqiqətin soyqrımı. Bakı.. Azərbaycan, 2003.
2. "Erməni terreru". Bakı.. Vətən, 2005.
3. Əhmədov Teymur. "Erməni xəyanəti", Qərbi Azərbaycanda General Andıranik Ozaniyanın qanlı əməlləri ( 1918-1920- ci illər) // Ədəbi İrəvan (almanax) ... Bakı.. Yurd, 2005.
4. Ələkbərli Əziz. Qərbi Azərbaycan. I hissə // Vedibasar Mahalı. Bakı.. Ağrıdağ, 2000.
5. Arxiv materialları və digər tarixi sənədlər.


## MÜNDƏRİCAT


Qan iyi *(sənədli povest)* ..........................................................................3

İsmayıl Tuncun döyüş yoldaşları ..............................................................154


## XATİRƏLƏR


Yusibov Suliddin Bəhmən oğlu..................................................................155

Məmmədov Pənah Ağamalı oğlu...............................................................185

Heydərov Nizami Firudin oğlu...................................................................193

Abdullayev Vaqif Boran oğlu.....................................................................200

Mustafayev İlham Abbas oğlu....................................................................206

Süleymanov Vidadi Həbib oğlu.................................................................213

Əhmədov Əyyub Nəriman oğlu..................................................................218

Səyyadi Dilqəm Ələkbər oğlu....................................................................223

Paşayev Kamil Məhəmməd oğlu................................................................231

Alxanov Elxan İmran oğlu.........................................................................234

İmanov Zahid Cavad oğlu....................................................................238
Əliyev Ətraf İsa oğlu *(“Qoçu”)*................................................................242
Quliyev Zaman Ənvər oğlu...................................................................249
Məmmədov Vüqar İslam oğlu.................................................................251
Əliyev Zabit Əli oğlu.........................................................................254
Orucov Sakit Şəkəralı oğlu...................................................................257
Yusibov Ülfət İsmayıl oğlu...................................................................262
Yusibov Fikrət İsmayıl oğlu..................................................................265
Quliyev Elmar Əfqan oğlu...................................................................268
Mürsəlov İslam Cavanşir oğlu...............................................................271
Paşayev İlham Sabir oğlu.....................................................................274
Abdullayev Elçin Tapdıq oğlu...............................................................280
Abdullayev Etibar Allahverdi oğlu.........................................................284
Tağıyev Ələddin Hilal oğlu...................................................................287
Züynalov Şöhlət Mövsüm oğlu.............................................................291
Qasımov Etibar Vahid oğlu..................................................................294
Nuriyev Rafiq Əli oğlu.......................................................................299
İstifadə olunan mənbələr....................................................................301






YAVUZLAR İNŞAAT
İTH.-İHR.NAK.TİC.SAN. ve PAZ.LTD.ŞTİ
İNSAAT VE YAPI MALZEMELERİ

*Bu kitabın çapına maddi kömək göstərdiyinə görə «Yavuzlar İnşaat» şirkətinin rəhbəri Yüksel Yavuza müəllif və İsmayıl Tunc öz təşəkkürlərini bildirirlər.*

Çapa imzalanmışdır: 18.06.2007.
Nəşrin formatı: 60x84 1/16. Ofset çapı.
Fiziki çap vərəqi 19.
Sifariş № 30. Sayı 1000.




Az – 1122, Bakı şəhəri, H.Zərdabi prospekti, 78.
Telefon: (+994 12) 437 96 62